**MƏXDUMQULU FƏRAQİ**

# SEÇİLMİŞ ƏSƏRLƏRİ

**Bakı - 2010**

TÜRKSOY kitabxanası seriyası: 5

**Tərtib edən,**
**türkməncədən uyğunlaşdıran**
**və ön sözün müəllifi:**
**Ramiz ƏSKƏR**

**Redaktoru:**
**Əli ŞAMİL**

**Naşiri:**
**Rafiq BABAYEV**

**Sponsoru:**
**Şahmar Rüstəm oğlu VƏLİYEV**

**Məxdumqulu Fəraqi. Seçilmiş əsərləri. Bakı, MBM, 2010, 448 s.**

Kitabda böyük türkmən şairi, ümumtürk ədəbiyyatının görkəmli nümayəndəsi Məxdumqulu Fəraqinin seçilmiş əsərləri toplanmışdır. Kitab 31 mart - 4 aprel 2009-cu ildə İstanbulda TÜRKSOY tərəfindən təşkil olunan «Türk Ləhcələri Arasında Uyğunlaşdırma Çalışmalarının Bugünkü Durumu və Qarşılaşılan Problemlər» mövzusunda Beynəlxalq simpoziumun tövsiyələrinə və yekun bəyannaməsinə uyğun olaraq nəşr edilir.

**İSBN: 978-9952-29-041-5**

# BÖYÜK TÜRKMƏN ŞAİRİ MƏXDUMQULU FƏRAQİ

*...Nurmühammet Andalyp, Döwletməmmet Azady, Magtymguly Pyragy, Məmmetweli Kemine, Mollanepes yaly yüzlerçe alymlarymyz, akyldarlarymyz, şahyrlarymyz, sungat ussatlarymyz öçmejek yz galdyrdylar, ylym we döredijilik dünyəsinde uly meşhurlyga eye boldular.*

**Gurbanguly Berdimuhamedow,**
**Türkmenistanyň Prezidenti**

*...Nurmühəmməd Əndəlib, Dövlətməmməd Azadi, Məxdimqulu Fəraqi, Məmmədvəli Kəminə, Molla Nəfəs kimi yüzlərcə alimlərimiz, müdriklərimiz, şairlərimiz, sənət ustadlarımız sönməz iz qoydular, elm və yaradıcılıq dünyasında böyük məşhurluğa sahib oldular.*

**Qurbanqulu Berdimühəmmədov,**
**Türkmənistan Prezidenti**

Məxdumqulu Fəraqi tarix boyu gəlib keçmiş ən böyük türkmən şairidir. Onun türkmən ədəbiyyatı tarixindəki yerini ve mövqeyini qısaca olaraq bir cümlə ilə səciyyələndirmək istəsək, deməliyik ki, Bayron ingilis ədəbiyyatı, Dante italyan ədəbiyyatı, Puşkin rus ədəbiyyatı üçün nədirsə, Məxdumqulu da türkmən ədəbiyyatı üçün odur.

Məxdumqulu türkmən xalqının varlığına nüfuz etmiş, iliklərinə qədər işləmiş, sinif, zümrə, təbəqə, qoca-cavan, böyük-kiçik, qadın-kişi demədən, yeddidən yetmişə qədər bütün türkmənlərin mənəviyyatına hopmuş, onlar üçün hava-su, duz-çörək qədər vacib olan mənəvi qidaya çevrilmişdir. Böyük türkoloq Bartholdun yazdığı kimi, tarixdə hələ heç bir türk şairi öz xalqı arasında Məxdumqulu qədər populyar olmamış, onun qədər sevilməmiş, oxunmamış və əzbərlənməmişdir. Bu sahədə onunla yalnız Xoca Əhməd Yəsəvi və Yunus İmrə yarışa bilər.

Məxdumqulu Türkmənistanın mənəvi qurucularından və liderlərindən biri, türkmən xalqını milli güvənci, sonsuz iftixar qaynağı, bütün dövrlərin və könüllərin şairidir. O, misilsiz söz ustası, sufi-ozan olmaqla yanaşı eyni zamanda müdrik filosof, ünlü mütəfəkkir,

böyük alim, bacarıqlı müəllim, ağıllı məsləhətçi, istedadlı dastançı, mahir folklorçu, nəhayət, uzaqgörən siyasətçisidir, bir sözlə, türkmənlərin ruhi dünyasının rəhbəridir.

Türk dünyasının dahi yazıçısı Çingiz Aytmatov bunun səbəblərini belə izah etmişdir: «Məxdumqulunun əsərlərinin bizim dövrümüzə gəlib çatması türkmən xalqının rəşadətidir. O, türkmənlərin qəlbində - gəzəri baxşı-dərvişlərin dilində, böyük və kiçik yollarda, bazarlarda və karvansaralarda, yurdlarda və çoban tonqallarının başında qorunmuşdur. Onun şeirləri ilə savaşa yollanmış, cəllad kötüyünə getmişlər. Məxdumqulunun şeirləri insanın doğulmasını qarşılamış, onun ölümünə ağlamışdır. Məxdumqulunun şeirləri sevən qəlblərin himninə çevrilmişdir».

Xalqın Məxdumquluya bəslədiyi sevgi şairin öz xalqına qarşı duyduğu ülvi, bəlkə də ilahi məhəbbətlə düz mütənasibdir. Məxdumqulu türkmən və türk xalqlarının ən yaxşı poetik ənənələrini özündə birləşdirdiyi və təcəssüm etdirdiyi kimi, xalq da ona olan sevgisini ana südü ilə əmmiş, öz qan yaddaşında və genlərində daşıyaraq əsrlərdən-əsrlərə, nəsillərdən-nəsillərə ötürmüşdür.

***

Məxdumqulu Fəraqi 1733-cü ildə Türkmənistanın Ətrək vilayətində Kümbəzhovuzun şərqindəki Hacıqovşan adlı yerdə, başqa bir məlumata görə, Qızılbayır (indiki Şarlavuk) obasında türkmən ədəbiyyatının klassiki Dövlətməmməd Azadinin (1700-1760) ailəsində dünyaya gəlmişdir. Öz dövrünün bilgili alimi və vətənpərvər şairi olan Azadi «Vəzi-Azad», «Hekayəti-Cabir Ənsar», «Münacat», «Behiştnamə» adlı məsnəvilərin müəllifi kimi məşhurdur.

Məxdumqulu ilk təhsilini evdə öz atasından almış, daha sonra qonşuluqda yerləşən Qızılayaq kəndindəki İdris Baba məktəbində oxumuşdur. Burada təhsilini başa vurduqdan sonra atası onu Buxaradakı məşhur Kökəltaş mədrəsəsinə göndərmişdir. Məxdumqulu bu təhsil ocağında dövrünün tanınmış xocalarından dərs almış, başda Quran olmaqla ilahiyyat elmini, həndəsə, hesab, nücum, tarix, coğrafiya və tədris proqramına daxil olan digər fənləri dərindən öyrənmişdir. O, ədəbiyyata və dilə xüsusi maraq göstərərək Şərq ədəbiyyatı klassiklərini ciddi mütaliə etmiş, Xoca Əhməd Yəsəvi, Füzuli, Nəvai, Nəsimi, Hacı Bəktaş Vəli, Yunus İmrə, Nizami, Hafiz, Xəyyam, Cami, Dəhləvi kimi şairlərin yaradıcılığını mənimsəmiş,

cağatay, ərəb və fars dillərinə mükəmməl şəkildə yiyələnmişdir. Bütün bunlar gənc Məxdumqulunun bir şair və ozan kimi yetişməsində mühüm amil olmuşdur.

Məxdumqulu Buxarada nəqşibəndi ordeninə ciddi maraq göstərmiş, bu ordenin şeyxi Bəhaəddin Nəqşibəndinin yaratdığı sufi məktəbinin güclü təsirinə məruz qalmış, şeyxin «Dilin yar ilən, əlin kar ilən olsun» şüarını öz həyatının və sənətinin əsas kredosu, mayası və mənası kimi qəbul etmişdir.

Daha sonra Məxdumqulu həmin dövrdə Orta Asiyada ən nüfuzlu təhsil müəssisəsi sayılan «Şirqazi» mədrəsəsinə daxil olmuşdur. Elmə, təhsilə, mədəniyyətə böyük önəm verən Xivə hökmdarı Şirqazi xanın (1715-1728) əmri ilə qurulan bu mədrəsə öz dövrünün universiteti hesab edilirdi. Buxara mədrəsəsinin məzunu olan Məxdumqulu burada daha münbit elmi-ədəbi mühitə düşmüş, Şərqin böyük alimlərindən Fərabinin, Biruninin, ibn Sinanın, əl-Xarəzminin, Mənsur Həllacın, Qəzalinin, Zəməxşərinin, Nəiminin, Bəyazid Bistaminin və başqalarının elmi-fəlsəfi irsi ilə tanış olmuş, ədəbiyyat sahəsindəki biliklərini daha da təkmilləşdirmişdir.

«Şirqazi» mədrəsəsində ali təhsilini başa vuran Məxdumqulu öz doğma yurduna dönmüşdür. Üç il «məkan tutub duzunu yediyi», dərin bilik və böyük mənəvi sərvət qazandığı «qızıl qapılı» mədrəsəni ömrü boyu unutmamış, ona vida şeiri də həsr etmişdir:

Məkan tutub, üç il yedim duzunu,
Gedər oldum, xoş qal, gözəl «Şirqazi».
Ötürdüm qışını, novruz-yazını,
Gedər oldum, xoş qal, gözəl «Şirqazi».

...Məxdumqulu yığıb könül vəfasın,
Təzim etdi, kim çəkmişdi cəfasın,
Heç zaman unutmaz qızıl qapısın,
Gedər oldum, xoş qal, gözəl «Şirqazi».

Əldə olan məlumatlara görə, Məxdumqulu ilk gəncliyindən bəri sonsuz bir məhəbbətlə sevdiyi Mənli adlı qıza qovuşmamış, bu eşq onu daim yandırmış, ilham qaynağına çevrilmiş, bədii yaradıcılığını körükləmişdir. Şair Mənliyə bir çox şeirlər həsr etmişdir.

Məxdumqulunun şəxsi həyatı faciələrlə keçmişdir. Abdulla adlı qardaşı hansı səbəbdənsə ata yurdunu tərk etmiş, 1754-cü ildə üç ailə üzvü – bacısı Xanmənli, kiçik qardaşı Canəsən və onun arvadı Bayram eyni gündə dünyadan köçmüş, bu dərd 21 yaşlı Məxdumqulunu,

onun atası Azadini və anasını dərin kədərə qərq etmişdir. Üstəlik, şairin iki uşağının ikisi də kiçik yaşlarında ölmüş, çırağını yandıracaq başqa övladı olmadığından Məxdumqulu bir ata və insan kimi bunu böyük ürək ağrısı ilə qarşılamış, «Bəxtim qaradır» şeirində yazmışdır:

Koroğlu tək qeyrətimdən ayrıldım,
Qocalmışam, qüvvətimdən ayrıldım,
İki didəm – züryətimdən ayrıldım,
Rəhm edən olmadı, bəxtim qaradır.

Məxdumqulu bir şərqli, müsəlman və türk olaraq övladsızlıq dərdini bir çox şeirində yana-yana dilə gətirmişdir. Onun müxtəlif şeirlərindən seçdiyimiz aşağıdakı bəndlər də bunu göstərir:

Tənhalıq həsrəti başdan ötərmiş,
Oğulsuzluq bütün işdən betərmiş,
Züryətsiz igidin yeri itərmiş,
Yurdu yox, karvanı köçdü dedilər.

Dağımda bənd qaldı sellər,
Getdi huşum, əyri bellər,
Məxdumqulu deyər, ellər,
İzimdə züryət qalmadı.

Pünhan sirrim aşkara,
Neylək, çıxıb şikara,
Məxdumqulu biçara
Bircə züryəti gözlər.

Derlər: «Yaxınmış axirət»,
Görən varmıdır aqibət,
Məxdumqulu, quru dərəxt —
Adamda züryət olmasa.

Şeirlərindəki «Pis xatın başa möhnətdir», «Yaman xatın yaxşı ərə Sovulmaz töhmətə bənzər», «Yenə yaxşı bir igidə Yaman xatın tuş olmasın», «Tuş olsan yaman xatına Ömrün ötər şər iləni» kimi misralardan belə anlaşılır ki, Məxdumqulunun evində dinclik, könül rahatlığı olmamış, daima əsəbilik hökm sürmüşdür. Ona görə də şair yaxşı, xoşxasiyyət qadınları tərifləmiş, milli türk psixologiyasına və təfəkkürünə, ədəbi ənənəsinə uyğun olaraq (burada dahi Yusif Balasağunlunu və onun məşhur «Qutadğu Bilig» didaktik poemasını xa-

tırlamaq yerinə düşərdi) evlənmə işində gənclərə bəzi məsləhətlər vermişdir:

Məxdumqulu, kimsə bilməz batini,
Evlənsəniz, baxıb alın zatını,
Yiyəm görkəzməsin yaman xatını,
Adam özün bilməz, xam xəyal olar.

Bütün bunlar yetməzmiş kimi, Məxdumqulu sonra öz qibləgahı saydığı atası Azadini və sevimli anasını da itirmiş, bu fani dünyada yapayalnız qalmışdır. Bundan sonra öz şeirlərini hamıdan ayrılmış, fərağa, uzağa düşmüş mənasına gələn Fəraqi təxəllüsü ilə yazmağa başlamışdır. O, bir neçə şeirində nəyə görə bu təxəllüsü qəbul etdiyini bu şəkildə açıqlamışdır:

Cahanı yandırdı odun,
Qaçar oldu yaxın-yadın,
Məxdumqulu, sənin adın,
Olsun indi qoy Fəraqi.

Məxdumqulu, adın döndü Fərağa,
Fəraq olub, çək özünü qırağa...

Məxdumqulu gənc yaşlarından etibarən səyahətə çıxaraq bütün Türkmənistanı, Orta Asiyanı, İranı və Hindistanın bir qismini gəzib dolaşmışdır. Hətta ilk dəfə səfərə çıxmaq istədikdə atası gənc və təcrübəsiz olduğunu söyləyərək ona mane olmağa çalışmışdır. Bu haqda ata ilə oğulun maraqlı bir deyişməsi də vardır.

Məxdumqulunun Azərbaycanda və Anadoluda olub-olmaması dəqiq məlum deyil. Doğrudur, onun əsərlərində Azərbaycan, eləcə də Kayseri və Qars barədə müəyyən məlumatlar var, lakin bu məsələ hələlik açıq qalır. Ümumiyyətlə, Məxdumqulunun şeirlərində bir çox ölkə, vilayət, şəhər, el-oba, kənd adı çəkmişdir ki, bunların əksəriyyəti poetik ənənəyə uyğun olaraq işlədilmişdir. Məsələn, Yusifdən yazarkən Kənan (indiki Fələstin) və Misiri xatırlatmamaq mümkün deyil. Eləcə də bir şeyin vüsətini, genişliyini, kiminsə şan-şöhrətinin, ad-sanının yeddi iqlimə yayılmasını bir qədər də mübaliğəli göstərmək üçün Misir, Həbəş, Zəngistan, Firəng, Yunan, Rumistan, Türküstan, Çin-Maçin, Hindistan kimi bir-birindən çox-çox uzaqda yerləşən məmləkətlərin adlarının bir şeirdə yanaşı çəkilməsi poeziyada məqbuldur. Lakin danılmaz həqiqətdir ki, Məxdumqulunun coğrafiya sahəsindəki bilikləri heyrəramiz dərəcədə genişdir. Biz bunu şairin «Bu dünya» adlı şeirində bariz şəkildə görürük. Burada islami bil-

gilər işığında 15 ölkənin sahəsi ağacla-fərsəxlə verilmiş, su, bataqlıq, dağ, adam yaşamayan yerlər, səhralar və s. göstərilməklə təqribən bütün dünya coğrafiyası əhatə olunmuşdur. Şeirdə oxuyuruq:

On iki min ağac cayi-Hindistan,
Altı min ağac yol ərzi-Rumistan,
Dörd min Səklab, Səncab, dörd min Zəngistan,
Sanki keçib varan seldir bu dünya.

Dörd min fərsəx Yəmən, bir min də Bulğar,
Zəmini-yunan həm olar yek həzar,
Min ağac yol dağdır, devi-mərdumxor,
Onda keçib varan saldır bu dünya…

Üç min üç yüz ağac əhli-islamdır,
İraq, Xəzirbaycan, Misirdir, Şamdır,
Xorasan, Fars, Bəzirkuhda tamamdır,
Yox olunca, qalmaqaldır bu dünya.

Mütəxəssislərin hesablamalarına görə, şairin yaradıcılığında işlədilmiş real coğrafi, dini-mövhumi məntəqələrin, tarixi və əfsanəvi şəxs adlarının sayı 258-dir. Yeri gəlmişkən, bir statistik məlumatı da vermək istərdik: Məxdumqulunun əlimizdəki şeirlərində bir sözün dəfələrlə işləndiyini nəzərə almaqla ümumən 101 min kəlmədən istifadə edildiyi kompüter sayımı zamanı ortaya çıxdı...

Məxdumqulunun sonraki həyatı barədə əldə dəqiq məlumatlar yoxdur. Onun vafat tarixi də mübahisəlidir. Bəzi araşdırmaçılar şairin 1783-cü ildə, bəziləri isə 1793-cü, hətta 1798-ci ildə böyük acılar çəkdiyi bu dünyadan əbədi xatırlanacaq bir ad və böyük poetik irs qoyaraq köçdüyünü qeyd edirlər.

***

Məxdumqulu hər şeydən əvvəl böyük şair və istedadlı aşıqdır. Artıq XVII əsrdən etibarən türk ədəbiyyatında divan ədəbiyyatı ilə klassik aşıq yaradıcılığı qovuşaraq yeni bir mərhələyə qədəm qoymuş, yazılı ədəbiyyatla şifahi ədəbiyyatın sintezi nəticəsində şair-aşıq sənətkarlar yetişmişdir. Türkmənistanda Məxdumqulu, Azərbaycanda Vaqif, Türkiyədə isə Nədim bunların ən parlaq nümayəndəsi sayılır. Saz çalıb-çalmamasından, məclislərdə çıxış edib-etməməsindən asılı olmayaraq onların yaradıcılığı şifahi xalq ədəbiyyatı ənənələri üzərində yüksəlmiş, folklordan bəhrələnərək nəşv-nüma tapmış,

aşıq şeiri janrları aparıcı mövqedə olmuş, eyni zamanda divan ədəbiyyatı da öz qüvvətli təsirini qorumuşdur. Bu tipli sənətkarların yaradıcılığında qoşma, gəraylı, təcnis janrında yazılmış əsərlərlə bərabər qəzəl, qəsidə və məsnəvilərə də rast gəlmək mümkündür.

Məxdumqulu söz sənətinə aşıq kimi qədəm qoymuş, türkmən və ümumtürk folklorunu dərindən mənimsəyən və inkişaf etdirən bir haqq aşığı səviyyəsinə yüksəlmişdir. O, digər haqq aşıqları kimi badə içmişdir. Üstəlik, Məxdumqulu yeganə aşıqdır ki, onun həyatında badə içmə doqquz dəfə baş vermişdir. Türk ədəbiyyatı tarixində nadir hadisə olduğu üçün bu məsələ üzərində bir qədər geniş dayanmaq lazımdır.

Müqəddəslər əlindən badə içməsi (türkməncə buna «haqdan içmə» deyilir), bunun məkanı və zamanı, kimlərin iştirakı ilə və nə şəkildə baş verməsi şairin öz şeirlərində təsvir edilmişdir. Bunların ən müfəssəli və genişi «Durgil» dedilər» adlı şeirdir. Qısalıq naminə biz badə şeirlərini sxematik olaraq verməyi məqsədəuyğun hesab edirik.

**1. «Durgil» dedilər» şeiri.**

Məkan: seyrangah, yerin damarı, ərşin kəməri, cəbərut aləmi.

Zaman: gecə yarısı.

İştirakçılar: Məhəmməd peyğəmbər, 124 min ənbiya, çahar-yar (yəni Əbubəkr, Ömər, Osman, Əli; bunlardan yalnız Əli şairlə şəxsən söhbət edir), Səlim Xoca, Baba Züryad, Veysəl Qərani, Bəhaəddin (Nəqşibəndi), Zəngi Baba, dörd atlı, daha dörd atlı, altı atlı, altmış atlı, iki pirzadə, iki divanə, adı çəkilməyən bəzi şeyxlər.

Nəticə: üstünə bir şey qoyur, piyalə içirir, fatihə oxuyur və üfləyirlər. Sonra peyğəmbərin əmri ilə dörd atlı onu gətirdikləri yerə geri götürür.

**2. «Oyan» dedilər» şeiri.**

Məkan: asimanda hövzi-kövsər kənarı.

Zaman: gecə.

İştirakçılar: Şahi-mərdan Əli, ərənlər.

Nəticə: onlar şairə bir kasa mey içirir və 80 min kəlamı ona bəyan edirlər.

**3. «Uçdum, yaranlar» şeiri.**

Məkan: kəhkəşanda abadan bir bağ.

Zaman: cümə gecəsi.

İştirakçılar: çiltən.

Nəticə: çiltən məclisinə qatılır, ona camla şərab içirirlər.

**4. «Oldum giryana» şeiri.**

Məkan: kəhkəşan, göy üzü..

Zaman: sübh çağı.

İştirakçılar: Xıdır, İsa, Şahi-mərdan Əli.

Nəticə: onlardan biri şairin köksünə vurur, digəri ürəyini tiğ ilə yarır, üçüncüsü dəm (nəfəs) verir, şair yeddi sualının cavabını alır, mey içir, bu üç kişi onun ustadı olurlar.

**5. «Bizə sarı» şeiri.**

Məkan: bir meydan.

Zaman: dəqiq göstərilmir.

İştirakçılar: əli şərablı, ağ ridalı, yaşıl niqablı «əcəb bir ər», «meydan içrə dolub oturmuş mərdan».

Nəticə: onlar «Fəraqi!» deyərək nərə çəkir, bədənini altmış para edirlər.

**6 . «Seyran içində» şeiri.**

Məkan: seyran yeri.

Zaman: bir gecə.

İştirakçılar: 32 kişi, o cümlədən: Nuh peyğəmbər, Yəhya, Şahi-mərdan Əli, imamlardan Kazım, Cəfər, Rza, Mövlana Cami, Həkim Ata Süleymani, Xoca Yusif Həmədani, Sultan Veys Pəhlivani, Sultan Bəyazid.

Nəticə: şair onlarla söhbət edir, Məxdumqulu şeirin son bəndində «sirrim çoxdur» deyərək badə içmə qismini açıqlamır.

**7. «Divana gəldi» şeiri.**

Məkan: dəqiq göstərilmir.

Zaman: bir gecə.

İştirakçılar: Bəhaəddin Nəqşibəndi və dərvişləri.

Nəticə: şairə badə içirirlər.

**8. «Bir nan gətirdi» şeiri.**

Məkan: göstərilmir.

Zaman: bir gecə.

İştirakçılar: yalnız Bəhaəddin Nəqşibəndi.

Nəticə: Bəhaəddin Nəqşibəndi şairə gülgün şərab içirir.

**9. «Küllahlı gəldi» şeiri.**

Məkan: göstərilmir.

Zaman: bir gecə.

İştirakçılar: əli qızıl əsalı, başı küllahlı bir bölük ərən.

Nəticə: dəqiq göstərilmir.

Bu silsiləyə şərti olaraq «Gördüm» adlı şeiri də əlavə etmək olar.

Orada badə içmə elementləri var, lakin kifayət qədər açıq və bəlirgin deyildir.

Məxdumqulunun həyatındakı badə içmə məsələsi bizdəki badə içməyə çox bənzəyir. Yalnız ona badə içirən adamların dini və mənəvi statusu daha yüksəkdir, bizdəki dərviş, pir, nurani qoca surəti, badə əvəzinə alma vermə burada yoxdur. Başqa mühüm fərq isə odur ki, doqquz dəfə badə içsə də, Məxdumquluya bircə dəfə də olsun buta verilmir, yəni sevgilisi ona göstərilmir. Məncə, bu fərqlər və bənzərliklər, eləcə də ədəbiyyatımızda badə və buta məsələsi ayrıca bir tədqiqatın mövzusudur.

***

Məxdumqulunun yaradıcılığının əsasını və mayasını, heç şübhəsiz, məhəbbət lirikası təşkil edir. Vətəndaş qeyrətli şairin türkmən birliyinə səsləyən şeirləri də az deyil. Öz dövrünə görə mükəmməl ruhani təhsili alan, yetkin ərən və irfan sahibi olan Məxdumqulunun dini məzmunlu şeirləri də olduqca çoxdur. Böyük şairin ədəbi irsində ictimai-siyasi məzmunlu şeirlər, fəlsəfi-didaktik əsərlər də əhəmiyyətli yer tutur. Bunlardan başqa, Məxdumqulunun müxtəlif vəsilələrlə yazdığı şeirlər də (məsələn, vücudnamələr, atasına, qardaşı Abdullaya həsr etdiyi şeirlər, şəxsən özünün başına gələn faciələr haqqında şeirlər) vardır. Doğma xalqına minbir qırılmaz tellə bağlı olan bu bütük sənətkar bütün hallarda xalq ruhunun tərcümanı kimi onun arzu və istəklərini, həyatını və taleyini qələmə almış, bunu geniş poetik vüsət  və sonsuz ilhamla, əlvan və parlaq boyalarla yerinə yetirmişdir. Məxdumqulunun üç əsrdən bəri türkmən ədəbiyyatına hakim olması, yön verməsi və sevilməsinin sirri də məhz bundadır.

***

Türkmən birliyi məsələsi vətənpərvər bir şair və ziyalı kimi Məxdumqulunu daim narahat etmiş və düşündürmüşdür.  Məlum olduğu kimı, türkmənlər tarixən bir neçə böyük və kiçik boydan (təkə, yomut, göylən, əlili, yazır, salır və s.) meydana gələn xalq kimi formalaşmışlar. Şairin yaşadığı mürəkkəb və keşməkeşli dönəmdə boylar arasında birlik məsələsi çox aktual idi. Nadir şahın Orta Asiya, Əfqanıstan və Hindistana səfərləri, bölgənin özündə özbəklərin taxt qovğaları, başqırdların, kalmıkların bu olaylara müdaxiləsi, türkmənlərin pərakəndəliyi, bir-birlərinə dəstəkdən daha ziyadə köstək olmaları,

çəkişmələri böyük xaos yaradır, rusların Orta Asiyaya ilk hərbi yürüşləri, qızılbaşların türkmən ellərinə arasıkəsilməz talançılıq basqınları vəziyyəti daha da gərginləşdirirdi. Bütün bunları ürək ağrısı ilə müşahidə edən Məxdumqulu türkmənləri vahid siyasi yelpazədə birləşdirməyin tərəfdarı kımı çıxış etmiş, bunun qeyri-mümkün olduğunu gördükdə öz sənəti ilə qardaş boylar arasında mənəvi birlik yaratmağa çalışmışdır.

Məxdumqulu türkmən birliyi mövzusunda çoxlu şeir yazmışdır. Bunların bir qismi doğrudan-doğruya türkmənlərə ortaq milli şüur aşılayan şeirlər, bir qismi adlı-sanlı türkmən xanlarının, bəylərinin, sərkərdə və döyüşçülərinin qəhrəmanlıqlarını tərənnüm edən şeirlər, bir qismi isə doğma vətənin gözəlliklərini vəsf edən şeirlərdir. Bunlardan «Türkmənin», «Türkmən binası», «Tökər olduq yaşımız», «Çovdur xan», «Çovdur xan üçün», «Ya Əhməd şah», «Dövlətəlinin», «Gürgənin», «Hasar dağındadır», «Sonu dağı», «Gözlərəm», «Sizindir» və başqalarını göstərmək olar.

Şair türkmən boylarının qardaş olduğunu, beş boyun vahid bir dövlətə qulluq edəcəyi təqdirdə onların qarşısında heç bir qüvvənin dayana bilməyəcəyini təlqin etmişdir:

Türkmənlər bağlasa bir yerə beli,
Qurudar Qülzümü, dəryayi-Nili,
Təkə, yomut, göylən, yazır, əlili,
Bir dövlətə qulluq etsək beşimiz.

Məxdumqulu türkmənlərin dirliyinin onların birliyi, hərbi qüdrəti sayəsində mümkün olacağını göstərərək yazmışdır:

Təkə, yomut, yazır, göylən, axal eli bir olub,
Bir yerə qılsa yürüş, açılar gül laləsi.

Özünün məşhur «Bilinməz» şeirində Məxdumqulu yomutla göylənin, təkə ilə salırın hərbi yürüşü qarşısında düşmənlərin duruş gətirə bilmədiyini göstərmişdir:

Yomut, göylən təəssüblə özündən,
Çəkdi qoşun, önü-ardı bilinməz.
Sığmaz, çıxdı Dəşti-Dəhan düzündən,
Gedən yolu, qonan yurdu bilinməz.

...Təkə, salır yürüş etsə yuxardan,
Düşmənin namərdi, mərdi bilinməz.

Böyük vətənpərvər şair türkmən birliyinin bir gün mütləq qurulacağına, türkmən xalqının iqbalının çiçək açacağına dərin inam və

sarsılmaz ümid bəslədiyini aşağıdakı bəndlərdə dilə gətirərək belə yazmışdır:

Bir olub könüllər, ürəklər, başlar,
Yığılsa, əriyər torpaqlar-daşlar,
Bişib bir süfrədə yeyilsə aşlar,
Çiçəklənər ol iqbalı türkmənin...

Tirələr qardaşdır, uruğ yarıdır,
İqballar tərs gəlməz, haqqın nurudur,
Mərdlər ata minsə, savaş sarıdır,
Qəsbkara yürür yolu türkmənin.

Vətənin birliyi naminə öz sazı-sözü ilə mübarizə aparan şair «Gərəkdir» şeirində hər bir türkmən bahadırını yurd, el və din uğrunda daim namusla-arla vuruşmağa çağırmış, vətən və millət yolunda öz canından keçməyə səsləmişdir:

İgid oldur – yurd üstündə,
Canın verə din üstündə,
Qoç igidlər, el üstündə
Namus ilən ar gərəkdir.

Məxdumqulu türkmənlərin el qeyrəti çəkən Çovdur xan, Dövlətəli, Övəzgəldi kimi siyasi xadimlərinə, Əhməd şah, Ataniyaz xan kimi rəhbərlərinə həsr etdiyi şeirlərdə də onu bir vətəndaş kimi daim narahat edən milli birlik məsələsini ön plana çıxarmışdır.

Böyük söz ustasının özü türkmənlərin göylən boyunun gərkəz tirəsinə mənsubdur. Şair bəzi şeirlərində özünü, əslini-nəslini, yurdunu nişan vermişdir. Məsələn, bir qəzəlinin son bəndində yazmışdır:

Bilməyən, soranlara deyin bu qərib adımız,
Əsli gərkəz, yurdu Ətrək, adı Məxdumquludur.

Bir gəraylısında isə özünü bir qədər geniş miqyasda, yurdunu və boyunu birlikdə təqdim etmişdir:

Yurdum Ətrək, elim göylən,
Mən bir sevər yar gözlərəm.

Məxdumqulu milli miqyasda bir türkmən sənətkarı, daha geniş mənada isə ümumtürk ədəbiyyatının çox görkəmli bir nümayəndəsi, eləcə də dünya ədəbiyyatının məşhur simalarından biridir.

***

Məxdumqulunun məhəbbət lirikası son dərəcə zərif, lətafətli və incədir. Burada Şərq poeziyasının məşhur məhəbbət dastanlarının

qəhrəmanları tez-tez xatırlanır. Şair öz şeirlərində müxtəlif vəsilələrlə 314 dəfə İbrahimlə Saranı, Fərhadla Şirini, Leyli ilə Məcnunu, Yusiflə Züleyxanı, Vərqa ilə Gülşanı, Novruzla Gülfərxarı, Vamiqlə Əzranı, Arzu ilə Qəmbəri, Tahirlə Zöhrəni, Qəriblə Şahsənəmi, Seyfəlməliklə Mahcəmalı, Bilqeyslə Süleymanı və başqalarını yada salmış, onların ölümsüz eşqini misal göstərmişdir. Yeri gəlmişkən qeyd edək ki, Məxdumqulu həm də dastançı şairdir. O, 11 dastanı, əlavə olaraq bəzi rəvayətləri və xalq hekayələrini nəzmə çəkmişdir. Şairin hazırladığı dastan antologiyası «İbrahim və Sara» dastanı ilə başlayır və «Aşıq Qərib və Şahsənəm» dastanı ilə başa çatır. Bu ənənə daha sonra Molla Nəfəs tərəfindən davam etdirilmiş və o, «Zöhrə və Tahir» dastanını eyni şəkildə hazırlamışdır.

Yuxarıda da göstərdiyimiz kimi, bəzi tarixi məlumatlardan və şeirlərindən anlaşıldığına görə, Məxdumqulu Mənli adlı bir qızı böyük məhəbbətlə sevmiş, lakin ona qovuşmamışdır. Şair öz nakam eşqinə bir çox elegiya yazmış, Mənliyə bir neçə həzin şeir həsr etmiş, bəzi şeirlərində isə onun adını çəkmiş və ya işarə vurmuşdur. Aşağıda onun «Ayrıldım», «Mənli», «Görünər», «Neyləyim, biçarəyəm» adlı şeirlərindən birər bənd, «Bənzəməz» adlı qəzəlindən isə bir beyt verməklə o xallı (mənli) qızın Məxdumqulunun şəxsi taleyində oynadığı mənhus və müdhiş, poetik taleyində eyni dərəcədə munis və müsbət rolu vurğulamaq istəyirik:

Elləri var toy-düyünlü,
Soyuq sulu, göy çəmənli,
Eli – göylən, adı – Mənli,
Nazlı dildardan ayrıldım.

Fani cahan İrəmdir, sən ol bostanın gülü,
Mən ki fəqir vabəstə, qəfəs içrə bülbülü,
Gül ruyində niqabdır ol Leylinin sünbülü,
Nə səbəbdir, xorlarsan mənim kimi zəlili,
Ol camalın eşqində oldum divanə, Mənli.

Pərdə çəkib üzlərimə,
Rəvac verib sözlərimə,
Məxdumqulu, gözlərimə
Bircə Mənli xan görünər.

Mənli xanım alıb getdi cismim içrə canımı,
Sormadan iqbalı fələk yapdı hicran donumu,

Bir nakəsə bəxş eyləmiş fələk Mənli xanımı,
Dəydi sərə, getdi huşum, neyləyim, biçarəyəm.

Məxdumqulu aləm içrə, bütün canan həm gözəl,
Hamısı bir kənizdir, Mənli xana bənzəməz.

Bir ömür boyu sürən pak və nakam eşq, «dili-suzan» həsrət və fəraq, sevən aşiqin iztirabları Məxdumqulunun məhəbbət lirikasının məhvərini, mayasını və nüvəsini təşkil edir. Bu lirika olduqca təbii, təbii olduğu qədər axıcı, axıcı olduğu qədər də gözəldir. Bu şeirlərin digər özəlliyi onların şuxluğu, oynaqlığı və sadəliyidir. Məsələn, şarin Mənli ilə söhbətinin poetik təcəssümü olan məşhur «Dedim-dedi» şeiri formaca ənənəvi üslubda yazılsa da, məzmunca orijinal və təzədir (bu şeirə türkmən ədəbiyyatında bir çox sənətkar, o cümlədən «məhəbbət mülkünün sultanı» Molla Nəfəs nəzirə yazmışdır) :

Dedim: «Üzün tabana». Dedi: «Bənzər!» Mənli xan,
Dedim: «Qoydun ərmana». Dedi: «Könüldür viran»,
Dedim: «Ölürəm indi». Dedi: «Qalarsan aman»,
Dedim: «Ox kirpiklərin». Dedi: «Qaşlarım kaman»,
Dedim ki: «Puşeş geymiş». Dedi: «Doni-zərəfşan»…

Dedim: «Gecən qaranlıq». Dedi: «Uyğuda ayım»,
Dedim: «Kimlər yasavul?» Dedi: «Kirpiyim − yayım»,
Dedim: «Harda məskənin?» Dedi: «Laməkan cayım»,
Dedim: «Zərəfşan olar». Dedi: «Kövsərdir çayım»,
Dedim: «Ondan ver mənə!» Dedi: «İstərmiş bican».

Bu qara sevda şairi iliklərinə qədər sızlatmış, onun məşum taleyində o dərəcədə mənfi rol oynamışdır ki, Məxdumqulunun üslubuna çox da xas olmayan misraların yazılmasına gətirib çıxarmışdır:

Atan bağrı daş olsun,
Anan gözü yaş olsun,
Min bəlaya tuş olsun
Yarı yardan ayıran.

Məxdumqulu «yollar yorub, yarı sorub» onu tapmağa çalışsa da, buna nail ola bilməmiş, səadətini əbədi olaraq itirdiyini anlamış və özünü yol tapmayan korla müqayisə etmişdir:

Məxdumqulu yollar yorub,
Tapammadı yarı sorub,
Döşəyini yola qurub,
Yol tapmayan kora bənzər.

Ancaq bütün bunlara baxmayaraq, şair öz yarını vəsf etməkdən də əsla vaz geçməmişdir; zira bunsuz o, Məxdumqulu olmazdı:

Mən fəqirəm, neyləyim,
Dərdi-halım söyləyim,
Yarım tərif eyləyim,
Qeyri zəbana düşməz.

***

Görkəmli sənətkarın ictimai motivli şeirlərinin əsasını ədalətsizliyə, haqsızlığa və zülmə qarşı etiraz, çərxi-fələyin gərdişinə qarşı üsyan təşkil edir. Burada həm öz taleyindən fərdi şikayət, həm də ictimai şikayət müşahidə olunur. Məxdumqulunun «Əcəb əyyam gəlmədi», «Möhtac eyləmə», «Ağlaram», «Gözlər», «Döndü», «Qıldı», «Biçarəyəm» kimi şeirlərində mərdlik-namərdlik, varlılıq-kasıblıq, yalan-gerçək, oğru-doğru, habelə qəriblik, kimsəsizlik, qürbət, ayrılıq, möhnət motivləri qabarıq şəkildə qoyulmuşdur. Məsələn, şair «Biçarəyəm» adlı şeirində özünün doğma yurdundan, el-obasından uzaqda düşdüyü vəziyyəti ürək yanğısı ilə təsvir etmişdir:

İrəm içrə reyhan idim,
Vətəndə zərəfşan idim,
Mərd igidə köhlən idim,
Dağ başında duman idim,
Fəraqi der, aman idim,
İndi viran bir sarayam.

Onun «Əcəb əyyam gəlmədi» şeirində binəsib qəriblərin özləri yoxsul, mindikləryi atın ayaqları cıdarlı olar deyə fələyin əlindən dad çəkmişdir:

Qəribdə bəxt yoxdur, mərəkə görməz,
Haq sevsə də, iqbalına mal verməz,
At minib çapsa da, cidarlı, getməz,
Çox gözlədim, əcəb əyyam gəlmədi.

Məxdumqulu bu tipli şeirlərində hamının haqq qatında bərabər olmasına baxmayaraq fələyin hər kəsə fərqli bir qismət verdiyini və bu günə qədər ondan nə xoşbəxtlərin, nə də bədbəxtlərin razı qalmadığını xüsusi vurğulamışdır:

Fələk, kimləri şad etdin,
Kimi qəmdən azad etdin,
Bir neçələri mat etdin,
Səndən razı olan varmı?

Təbii ki, şairin özü də fələkdən razı deyil; ədəbi ənənədə dövran, zəmanə, yaşanan çağ və görülən haqsızlıqlar fələk adlı ümumi bir ünvana tuşlanır:

Məxdumqulu əcəb çağlar,
Kimi gülər, kimi ağlar...
Kimlərin iqbalı yürüb, kimi xandır, kim gəda,
Kimi dünya malı yığar, yortub fani cahan ilən.

Məxdumqulunun aşağıdakı bəndləri də eyni təzadları eyni baxış bucağından eyni obyektə müncər edir:

Göydə fələk gərdandır,
Xalq yerdə sərgərdandır,
Nə tamahkar cahandır,
Göz açan malı gözlər.

Kimlərdə altın tacdır,
Kimlər sail, möhtacdır,
Kimlər dibdən qəllacdır,
Kim xalça, xalı gözlər.

Kim nan tapmaz yeməyə,
Kim yer tapmaz qoymağa,
Kim don tapmaz geyməyə,
Kim tirmə şalı gözlər.

Zalım fələyə, mənhus taleyə, uğursuz qismətə, bəd iqbala qarşı üsyan edən şair ulu yaradana yalvararaq sağ əli sol ələ, halalı harama möhtac etməməyi, əyrinin qarşısında doğrunu pamal etməməyi ixlasla diləyir:

Qoyma azam doğru yoldan əyriyə,
Qoyma əyri üstün gələ doğruya,
Ər malını nəsib etmə oğruya,
Halalı harama möhtac eyləmə.

Şairi şikayətə sövq edən şəxsi və ictimai səbəblər çoxdur və bunların hər biri özlüyündə sosial səciyyə daşıyır. Bəzi nadan mollalara yönələn sərt misraları, «zəmanə pozuldu, əxlaq əldən getdi», «dilindən dürr tökülsə də, kasıbın sözü keçməz», «namərdlər yaman artıb» tipli ümumi tənqidi fikirləri, «Azıbdır göylən xanları, Xalqa yanarmı canları?» kimi sayca az olan ünvanlı tənqidləri çıxmaqla Məxdumquluda sinif, zümrə və digər sosial təbəqələr arasında kəskin münasibətlərə, mübarizəyə, qovğaya dair ciddi bir işarəyə və ya çağırışa rast

gəlmirik. Onda olsa-olsa Şərq ictimai təfəkküründə özünə yer tutan varlı-kasıb bölgüsü vardır və bu, təvəkkülanə bir şəkildə taleyin hökmü ilə izah edilir. Demək lazımdır ki, sovet dövründə şairin yaradıcılığının sinfi-ideoloji yöndən təhlil edilməsi, ona az qala maarifçi-demokrat libası biçilməsi tamamilə yanlışdır. Məxdumqulu sazı-sözü, sənəti ilə yoxsulların, binəsiblərin tərəfini saxlamış, onların acınacaqlı həyatını, ağır güzəranını təsvir etmiş, lakin heç vaxt müasir mənada inqilabçı olmamışdır.

Yekun olaraq onu demək mümkündür ki, şairin şəxsi həyatı, yaşadığı dövr və mühiti böyük faciə və ziddiyyətlərlə dolu olduğundan həqiqi bir xalq şairinin, gerçək bir haqq aşığının ictimai motivli şeirlər yazmasından, cəmiyyətdəki bəzi neqativ halları öz yaradıcılığında əks etdirməsindən təbii bir şey ola bilməzdi və Məxdumqulu bu sosial sifarişi ustalıqla və şərəflə yerinə yetirmişdir.

***

Fəlsəfi şeirlər Məxdumqulu yaradıcılığının mühüm bir qismini təşkil edir. Bu şeirlərdə biz onu müdrik bir filosof, dərin bilikli alim, ağıllı öyüd-nəsihətlər verən ağsaqqal, təcrübəli müəllim kimi görürük. Şairin kainat, dünya və axirət, həyat və ölüm, xeyir və şər, yaxşı və yaman haqqında düşüncələri, ibrətamiz sözləri, didaktik tövsiyələri öz dəyərini və aktuallığını bu gün də qoruyur. Çünki bunlar əsrlərin sınağından çıxmış Şərq müdrikliyinin Məxdumqulu qələmi ilə poetik qisvəyə bürünmüş reallığı, gerçəkləridir.

Şairin fikrincə, dünya-aləm qüdrətdən xəlq olunmuş, yaşı-başı bilinməyən bir müvəqqəti məkandır:

Üç hissəsi dəli dərya,
Üçdə birində min qovğa,
Kim bilər bu köhnə dünya,
Ya rəb, neçə yaşındadır?!

Hər insan bu məkana gəlir, qonaq kimi yaşayır, ömür sürür və gedir, çünki verilən can bir gün hökmən geri alınır:

Məxdumqulu, eşq meydandır,
Bu meydana girən candır,
Canın bu təndə mehmandır,
Verən bir gün alasıdır.

Şair haqlı olaraq göstərir ki, fələk insanlara ölüm libası tikən bir dərzi, onları ölüm kötüyü üstündə doğrayan bir cəlladdır:

Adəm oğlu, fələk sənin
Bir gün donun biçər gedər.
Sənə vurar xəncərini,
Qızıl qanın saçar gedər.

Fələk ömür bazarına ötürdüyü baqqal hər an, hər saat, hər gün insan ömrü ilə alver edir, bizi al dilə tutub aldadaraq onu yavaş-yavaş dünya malına dəyişir. İnsan ömrü tükənəndə isə məzaristana sarı köç başlayır:

…Fələk baqqal ötürmüş
Bazaristana sarı.

Məxdumqulu dillənər,
Gözdə yaşı sellənər,
Gündə köçdür, yollanar
Məzaristana sarı.

Şair bu fani, xain, hiyləgər və hərdəmxəyal, gecə-gündüz insan övladına, adəmzada tələ qurmaqla məşğul olan dünyaya əsla güvənməməyi tövsiyə edir:

Güvənmə bəxtə, iqbala,
Dolanar yüz min xəyala,
İxtiyar yox pula, mala,
Dünya bənzər düşümüzə.

Fələk bizə əyri baxıb,
Əl uzadıb, əfsun oxub,
Orta yerdə danə töküb,
Tor qurubdur yaşımıza.

Məxdumbqulunun fikrincə, dünya hiyləgər bir qarı, insan oğlu isə yüz təlaşla xəyallar ardınca qoşan bir sadəlövh, zavallı varlıqdır:

Qarı dünya al içində,
Adəmzad xəyal içində,
Cahan qalmaqal içində,
Hər kim yüz təlaşlar ilə.

Humanist şair insanlara həyatdan dərs almağı, özünü aldatmamağı, öz yerini bilməyi məsləhət görür. Çünki bu dünya təkəbbürü, mənəmliyi əsla qəbul etmir, qul özünü bəy saymaqla bəy ola bilməz, eləcə də sirkə bal deyil, neft yağ deyil… ölü isə sağ deyil:

Qənaətdə kamal var,
Mənlik etmə, zaval var,

Hər başda bir xəyal var,
Qul özünü bəy sayar.

…Sirkə deyər: bal mənəm,
Neft özünü yağ sayar…

Dərd çəkənlər dərd bilər,
Namərd özün mərd bilər,
Tülkü özün qurd bilər,
Tula özün səg sayar.

Məxdumqulu bir quldur,
Qulluğuna qaildir,
Axmaq deyər aqildir,
Ölən özün sağ sayar.

Məxdumqulu axirətdə insanın öz əməlləri üçün hesab verməli olduğunu xatırladaraq onu daim xeyir işlər görməyə çağırmış, şərdən uzaq durmağa səsləmişdir:

Daş yağdırar başlarına,
Ağı qatar aşlarına,
Buradakı işlərinə
Hesab çəkməli dünyadır.

Bu mənada şairin vücudnamələri də dərin məna kəsb edən incilərdir. Məxdumqulunun bu janrda yazılmış bir neşə şeiri vardır. O, insanın doğulduğu andan qəbr evinəcən həyat sərgüzəştini poetik bir dillə nəql etmiş, insana uşaqlıq, yeniyetməlık, gənclik, orta yaş, qocalıq və ahıllıq çağlarında xas olan bütün özəllikləri, fiziki və mənəvi inkişaf mərhələlərini bir filosof gözü ilə müşahidə etmiş, araşdırmış və bizə poetik biçimdə təqdim etmişdır:

Otuz yaşa varınca, sanki bir alğır şirsən...
Qırxında tövbə edib, bir mürşidə əl versən...
Əlli yaşa varanda, doğruluqda olarsan…
Altmış yaşa varanda, qocalığı bilərsən…
Yetmiş yaşa varanda, qanın qaçar üzündən,
Səksən yaşa varanda, könlün keçər özündən,
Gedər olub dünyadan, yaxasız dona gəldin.

Məxdumqulu, möhnətdir hər kim doxsana yetsə,
Kəm-kəm gələr cahana, əgər yüz yaşa yetsə,

Heç kimdən haray olmaz əcəl yaxanı tutsa,
İmanını qazansan, yolunu rəvan etsə,
Axır olacağın budur – tənin yer ilə yatsa,
İşığı, tünlüyü yox, qaranlıq xana gəldin.

Bir çox məqamda ictimai, fəlsəfi və məhəbbət motivlərinin çulğaşdığı, üst-üstə düşdüyü şeirlərində Məxdumqulu adəmoğluna belə bir fikri aşılamaq istəyir ki, insan yuxu kimi gəlib keçən ömrü boşuna yaşamamalı, dünyaya yaxşı gəlib xoş getməli, quru gəlib boş getməməlidir:

Heç düşməyənlər qəmə,
Şükr etməzlər xoş dəmə,
Nə gözəldir adəmə
Yaxşı gəlib, xoş getmək.

Yaman dil yol itirər,
Yaxşı rəhmət gətirər,
Ərə qayğı artırar
Qırxdan aşıb, yaş getmək.

Fəraqi, dünya düşdür,
Düş görsən, dibi heçdir,
Cahanda yaman işdir,
Quru gəlib, boş getmək.

***

Məxdumqulunun yaradıcılığında dini-ruhani məzmunlu şeirlər əlahiddə yer tutur. O, sözün həqiqi mənasında bir mömin olmaqla bərabər həm də əngin dini biliklər sahibi, əsil alimdir. Bəri başdan demək lazımdır ki, Azərbaycan ədəbiyyatındakı nümunələrdən fərqli olaraq Məxdumqulunun dini şeirləri tematik baxımdan daha geniş, informativlik baxımından daha zəngin və dərindir. Məsələn, bizdə bəzi şeirlərdə Dəccalın adı ümumən çəkilsə də, onun zahiri görkəmi, zühuru, əməlləri və aqibəti tam təsvir edilmir. Halbuki Məxdumqulu bu haqda bir neçə şeir yazmışdır. Bizdə yerin və göyün qatlarını, hər qatın adını və nəzarətçisini dəqiq göstərən şeirlər demək olar ki, yoxdur. Bizdə islami dünyagörüşə görə cənnətin və cəhənnəmin təsviri, qiyamətdən öncəki dövrün hadisələri də Məxdumquluda olduğu qədər müfəssəl deyil. Məsələn, bizdə yazılmış dini şeirlərdə Harış adlı

ilan barədə heç bir məlumat yoxkən, Məxdumqulu bu haqda dolğun bilgi vermişdir. Şairin şeirlərində islamın qəbul etdiyi bütün mələklərin, peyğəmbər, nəbi, övliya və müqəddəslərin (Cəbrayil, Əzrayıl, İsrafil, Mikayıl, Adəm, Nuh, Musa, İsa, Davud, İbrahim, İsmayıl, Yaqub, Yusif, Xıdır, Cərcis, İdris, Əyub, Loğman, Süleyman, Zəkəriyyə, Yəhya, İskəndər, Həvva, Sara, Həcər, Məryəm, Bilqeys, Zübeydə və s.), eləcə də mənfi obrazların (Dəccal, İblis, Şeytan, Dağyanus, Şəddad, Nəmrud və s.) adları çəkilir. Bu sahədə ayrılıqda götürülmüş heç bir Azərbaycan şairi Məxdumqulu ilə müqayisə edilə bilməz. Bu da şairin çox mükəmməl dini təhsil alması ilə izah olunmalıdır. Əvəzində isə onun yaradıcılığında, misal üçün, mərsiyəyə rast gəlmirik.

Məxdumqulu Allaha və islamın qurucusu Məhəmməd peyğəmbərə çoxlu şeir həsr etmişdir. Onun «Rəbbim cəlil», «Rəbbiyül-əla», «Yağmur yağdır, sultanım», «Yarım, ya Allah», «Məhəmməd», «Rəsul», «Ya rəsul», «Sevmişəm səni», «Səni», «Bəlli» və digər şeirlərində «on səkkiz min aləmin xanı»olan ulu Tanrı (türkmən poeziyasında «Xuday», «Allah» sözü ilə yanaşı ara-sıra «Birivar» termini də işlədilir) və Xatəmül-ənbiya səmim-qəlbdən vəsf olunmuşdur. Şairin rəsulüllaha həsr etdiyi bəzi şeirlər poetik baxımdan olduqca mükəmməldir. Məsələn, aşağıdakı bəndlər nə qədər gözəldir:

Məkkədən çıxdı bir gözəl,
Mədinəyə rəvan oldu.
Görən tac etdi sərinə,
Görməyən bağrı qan oldu.

Həbibulla, səni sevən,
Tapar hansı yolda səni?
Vallah, görməyə müştaqdır,
Bəy də, xan da, qul da səni.

Səhər durdu peyğəmbər,
Məscid içrə Bilal var,
Çıxdı Bilal içərdən,
Gördü iki hilal var.

Şairin Məhəmməd peyğəmbərin əshabəsi, çahar-yarı Əbubəkri, Öməri, Osmanı, özəlliklə də Şahi-mərdan Əlini, onun şücaətini, Zülfüqarını, Düldülünü tərənnüm edən şeirləri diqqəti xüsusilə cəlb edir. «Əlidir», «Qəhri qana» və digər şeirləri ilə yanaşı Əlinin həyatından

bəzi epizodları ustalıqla nəzmə çəkən Məxdumqulu onun humanizmini və islam dini qarşısındakı xidmətlərini poetik dillə şərh etmişdir. Məsələn, «Göy kəbutər» adlı şeirdə bir göyərçin Əliyə sığınır və bir laçının onu qovladığını söyləyir. Bir azdan laçın uçub gələrək üç gündür ac olduğunu bildirir və göyərçini ona verməyi xahiş edir. Əli öz xidmətçisi Qəmbəri çağırır və xəncəri ona gətirməyi tapşırır. Bunun səbəbini soruşan laçına deyir ki, mənə pənah gətirdiyi üçün göyərçini sənə verə bilmərəm, ona görə də öz budumdan bir parça ət kəsərək sənə vermək fikrindəyəm. Quşlar «biz səni sınamaq üçün bu oyunu qurduq» deyir və təzim edərək uçub gedirlər.

«Sözüm var» şerində isə islamın böyük maddi sıxıntı içində olduğu bir dövr təsvir edilir. Əli xanımı Fatimeyi-Zəhradan evdə pul olub-olmadığını soruşur. Məlum olur ki, evdə heç nə yoxdur, Həsənlə Hüseyn gün yarımdır acdır. Əli xəzinəyə bir az pul tapıb vermək barədə fikirləşərkən bir dilənçi gələrək qırx min qızıl borcu olduğunu bildirir və yardım istəyir. Əli öz uşaqlarını bir yəhudinin yanında girov olaraq qoyur, ondan pul alıb dilənçini yola salır. Yəhudi uşaqlara ipsiz kuzə verərək qırx qulac arşın yetməyən quyudan su daşımağı tapşırır. Mikayıl yerı sıxır və su üzə çıxır. Yəhudi burada bir hikmət olduğunu anlayaraq uşaqları daha incitmir, onlara yemək-içmək gətirir, qayğı göstərir.

Əli Allaha üz tutaraq ondan imdad diləyir. Bu zaman bir quş uçub gəlir, Əli onun qanadlarına minərək tanımadığı bir kafir ölkəsinə çatır, orada xalqın toplaşdığı bir yerə gəlib islam dinini onlara başa salır, nəticədə hamı müsəlman olur, Əliyə çoxlu sərvət verirlər. O həmin quşun sayəsində geri qayıdır, yəhudinin borcunu ödəyərək uşaqlarını alır, sonra məscidə gəlir. Əhvalat peyğəmdərə əyan olduğundan o, Əlinin başına gələnləri xalqa danışır, ona təşəkkür edir.

Məxdumqulunun dini biliklərinin dərinliyi və genişliyi cənnət, cəhənnəm, qiyamət, Dəccal mövzusunda qələmə aldığı şeirlərdə bütün ehtişamı ilə üzə çıxır. Məsələn, o, dünyaya nəzarət edən qüvvələr haqqında yazdığı «Oturmuş» şeirində türkdilli bədii ədəbiyyatda heç vaxt işlənməmiş adları çəkmişdir. Şeirdən belə anlaşılır ki, fərşi-əlada oturan Qövs adlı bir ərlə onun sağında və solundakı iki imam yerə və göyə sərəncam verir. Övtad adlı dörd pak ər yerin dörd küncündə od yandırmaqla mükəlləfdir. Budala adlı yeddi ər şər işlərə, Rüqəba adlı on iki ər hər işə nəzarət edir. Bunlardan başqa, Nücəba adlı ərlər nəcib işlərə, Nüqəba adlı ərlər hər biri ilin bir gününə baxırlar. Əfradi-mənna adlı ərlər isə xalqı məlamətdə saxlayırlar.

Şairin «Yaşıl zümürrüd» şeirində göyün yeddi qatı təsvir edilir. Buradan öyrəndiyimizə görə, göyün yaşıl zümrüd rənginə boyanan ilk qatının adı Rəfa, fəriştəsi sığır surətli İsmayıldır. Gümüşü rəngli ikinci təbəqənin adı Əzlaun, böyüyü qartalsəfət Qəbayıldır. Digər təbəqələrin hər birinin ayrı adı, rəngi və böyükləri vardır. Məsələn, Kaydum adlı üçüncü təbəqə qırmızı yaqut, Məun adlı dördüncü qat ağ mirvari rəngindədir. Fəriştələri isə müvafiq olaraq börü sifətli Göybayıl və ağ at sifətlı Nunyayıldır. Məxdumqulu bu şeirində son təbəqələrin adlarını, rənglərini və fəriştələrini isə aşağıdakı şəkildə göstərmişdir:

Deyim göyün qoy beşinci qatından,
Adı Rətqə, əsli qızıl-altından,
Fəriştəsi vardır hüri sifətli,
Böyükləri vardır Səftayıl adlı.

Altıncı qat asman çıxmasın yaddan,
Adı Dəfnə, əsli sarı yaqutdan,
Fəriştəsi vardır vildan surətli,
Böyükləri vardır Əbayıl adlı.

Soran yeddinci qat göydəki sirdən,
Adı Əcibədir, asmanı nurdan,
Fəriştəsi vardır adam surətli,
Böyükləri vardır Nurbayıl adlı.

Yerdə, asimanda olan səriştə,
Nizam verənləri bu dörd fəriştə:
Mikayıl, İsrafil, Əzrayıl adlı,
Dördüncüsü vardır Cəbrayıl adlı.

Məxdumqulu, faş eyləsən sirrin həm,
Yiyəsi var dəryanın həm, yerin həm,
Yerin bəyi olsun Sərsayıl adlı,
Dəryalar böyüyü Qərqayıl adlı.

«Onda var» adlı şeirdə isə Məxdumqulu yerin yeddi qatını təsvir etmişdir. Burada da heyrət ediləcək dərəcədə çoxlu məlumat vardır. Şairin verdiyi bilgiyə görə, birinci qatın adı Rəmka, ikincinin adı Hülda, üçüncünün adı Arxayi-Afaqdır. İlk qatda sərt, şiddətli yellər əsir, ikinci qatda böyük əqrəblər, dəvə boyda bövlər, üçüncü qatda

dağdan böyük ənqurlar bidinləri gözləyir. Hürpa adlı dördüncü qatda xurma ağacı boyda dişləri olan ilanlar məskundur, Səlman zəmin, Siccin və Qəribə adlanan qatlarda da münafiqlər üçün dürlü əzablar mövcuddur.

Şairin «Durubdur» adlı şeirində dünyanın, çərxi-fələyin gərdişi, sual olunmaz hikmətlər, sirri-xudalar və bunların poetik təcəssümü ilə qarşılaşırıq:

Bir çürük qoz ilə cahan cövhərin
Ol nə qumarbazdır ütüb durubdur...

…Nə anadır, ölməz, itməz, qarımaz,
Öz balasın özü udub durubdur.

…Nə saqidir, piyaləsin yürüdür,
Bir əli boğazdan tutub durubdur.

…Cahan üzün tutmuş bir qüdrət ilan,
Quyruğu başından ötüb durubdur.

…Yenə bir qüdrət var, yeddi kəlpəzə,
Ol böyük ilanı udub durubdur.

Müəmma dolu bu cür misralara, bəndlərə Məxdumqulunun digər şairlərlə deyişmələrində, yaxud kimə ünvanladığı bəlli olmayan bəzi şeirlərində də rast gəlirik. Onun Məğrubi, Durdu şair, Zünubi, Oraz xan və başqaları ilə deyişmələrində dərin dini bilgilərlə dolu bu tipli müəmmalar heç də az deyil.

«Axır zaman olar», «Axır zaman gələr», «Kürs çıxar», «Aman hey», «Çıxar», «Törər», «Bəyan gələr», «Əmri-xan gələr» və digər şeirlərində Məxdumqulu dünyanın sonu, Dəccalın zühuru barədə danışır. Dünyanın sonu ilə əlaqədar islami təsəvvürləri əks etdirməsi baxımından «Xarab eylər» şeiri xüsusilə maraqlıdır. Həmin şeirdə bəzi şəhər və ölkələrin aqibəti, nədən xarab olacağı aşağıdakı kimi göstərilmişdir:

Bəlxi zülüm dərdi, Nişapuru daş,
Əmman şəhrin dərya, Bəsrəni atəş,
Mədinəni aclıq, Məkkəni həbəş,
Herat, Qəndəharı mar xarab eylər.

Rum şəhrin eyləyər ildırım xarab,
Yəməni hülac yıxar, Mosulu əqrəb,

Kufəni türk pozar, Bağdad şəhrin ab,
Reyi də dəlinib, yer xarab eylər.

Səmərqəndi qıbti ağlar, bəy basar,
Buxaranı nan qıtlığı, türk basar,
Səraxsı mərg pozar, Mərvi qum basar,
Şirazı türk, çayan, mur xarab eylər.

…Bulğarın şəhrini ol urus alar,
Urusu Dəccalla nar xarab eylər.

…Mehdi yerdən çıxar, İsa asmandan,
Dəccalı ol iki ər xarab eylər.

Məxdumqulunun dini şeirləri bölməsinə yekun vurarkən onun çox mükəmməl dini təhsil almış olduğunu və qazandığı bilikləri öz poeziyasında ustalıqla əks etdirdiyini bir daha vurğulamaq lazımdır. İşin orijinal tərəfi odur ki, türkmən ədəbiyyatında Məxdumquludan nə əvvəl, nə də sonra bu cür yüksək səviyyəli dini şeirlər yaza bilən şair olmamışdır. Şübhəsiz ki, bu cür gözəl əsərlər yaratmaq üçün dərin bilgi ilə yanaşı böyük təqva, inanc və etiqad, başlıcası isə parlaq istedad lazımdır. Məxdumquludan şəxsi planda bəzi şeyləri əsirgəyən tale bunları ona artıqlaması ilə əta etmişdir.

***

Məxdumqulunun yaradıcılığını əsas mövzular üzrə çox qısa şəkildə təhlil etdikdən sonra onun dili və üslubu üzərində dayanmaq, bu barədə də bir neçə kəlmə demək lazımdır. Türkmən ədəbiyyatının demək olar ki, bütün görkəmli xadimləri öz təhsillərini Buxarada və Xivədəki mədrəsələrdə almış, ərəb və fars dilləri ilə yanaşı Türküstanın ədəbi dili olan çağatay türkçəsini öyrənmişlər. Bəzi türkmən şairləri, məsələn, Bayram xan və Vəfai öz əsərlərini çağatay türkcəsi ilə qələmə almışlar. Lakin Məxdumqulu atası Azadinin və sələfi Əndəlibin yolunu davam etdirərək onların təsiri ilə türkməncə yazmışdır. Bunun ikinci səbəbi, heç şübhəsiz, zəngin türkmən folklorudur. Hələ uşaqlıqdan türkmən dastanlarını böyük şövqlə dinləyən Məxdumqulu bu sənət incilərinin dilinə heyran olmuş, şifahi xalq ədəbiyyatı və aşıq şeri janrlarını bütün incəliklərinə qədər öyrənmiş, mədrəsələrdə oxuduğu zaman ədəbiyyat nəzəriyyəsi sahəsindəki biliklərini təkmilləşdirmiş, öz əsərləri ilə türkmən dilinə poetik vüsət, dinamizm, çe-

viklik və genişlik qazandırmışdır. Əlbəttə, Məxdumqulunu türkmən ədəbi dilinin banisi adlandırmaq olmaz, ancaq onun sənəti bu dili ən yüksək bədii səviyyəyə qaldırmışdır. Bununla belə, şairin dilində çağatay dilinin bir çox elementləri müşahidə edilir. Ona görə də böyük sənətkarın dilini bəzən qarışıq dilli əsərlər çərçivəsində araşdırmaq istəyənlər də tapılır. Burada çağatayca ilə türkməncənin, daha geniş miqyasda karluqca ilə oğuzcanın olğa/bolğa məsələsi ortaya çıxır ki, bunun da ən sadə izahı belədir: qarışıq dilli əsərlərdə bəzən ol- feli bol- şəklində işlədilir, yəni olmaq, oldu əvəzinə bomak, boldu deyilir. Əlavə olaraq, bizim bəzi v-lərimiz b ilə işlənir: varmaq yerinə barmak, vermək yerinə bermək kimi. Üçüncüsü, ismin yiyəlik, yönlük və təsirlik hallarında bəzi paralelliklər müşahidə edilir. Türkcənin oğuz qrupu dillərində yiyəlik halda adam+ın, yer+in, yönlük halda adam+a, yer+ə, təsirlik halda isə adam+ı, yer+i əvəzinə karluq qrupu dillərində adam+nın, yer+nin, adam+ğa, yer+gə, adam+nı, yer+ni variantları işlənir. Məxdumqulunun şeirlərində həm oğuz, həm də karluq variantları gözə dəyir. Bu, bəzən qafiyənin, bəzən təqtin, bəzən də əruzun tələbi ilə meydana çıxır.

Feli sifət sahəsində isə bizdə əsasən –an/-ən, karluqlarda yalnız –ğan/-gən variantı işlənir. Oğuzlar ol+an, al+an, ver+ən, gətir+ən dedikləri halda karluqlar bol+ğan, al+ğan, ber+gən, gətir+gən deyirlər. Məxdumquluda bunların her iki variantı müşahidə edilir.

Nəhayət, son fərq oğuzca dəl (deyil), karluqca iməs sözlərindədir. Azərbaycan ədəbiyyatının görkəmli nümayəndəsi Kişvəri iməs variantını işlətdiyi kimi, Məxdumqulu da ara-sıra həmin variantdan istifadə etmişdir. Ancaq hər ikisi oğuzdilli poeziyanın şairidir.

***

Məxdumqulunun yaradıcılığı Azərbaycanda həmişə sevilmiş və təqdir edilmişdir. Müxtəlif dövrlərdə mətbuatda onun şeirlərindən bəzi nümunələr çap olunmuş, haqqında yazılar qələmə alınmış, sovet dövründə SSRİ xalqları ədəbiyyatı (hazırda türk xalqları ədəbiyyatı) çərçivəsində tədris edilmiş və öyrənilmişdir. Gənc alimlərimizdən biri onun yaradıcılığı barədə dissertasiya da yazmışdır.

Vaxtilə mərhum Fəxrəddin Əliyevin tərtib və tərcümə etdiyi «Türkmən inciləri» kitabında Məxdumqulunun bir neçə şeiri verilmişdir. 1984-cü ildə isə şairin anadan olmasının 250 illiyi münasibətilə «Qəm selı» adlı şeirlər kitabı buraxılmışdır. İsmayıl Vəliyevin

tərtib və tərcümə etdiyi bu kiçikhəcmli kitabda 102 şeir öz əksini tapmışdır. Professor Pənah Xəlilov kitaba 7 səhifəlik önsöz yazmış, onun 3 səhifəsini şairin Azərbaycanda olub-olmamasına (olmamasına) həsr etmişdir. Təbii ki, sovet dövründə nəşr olunduğuna görə, bu kitabda Məxdumqulunun dini məzmunlu şeirlərindən heç bir nümunə verilməmişdir. Yeri gəlmişkən demək lazımdır ki, sovet dövründə Türkmənistanın özündə də şairin dini-ruhani şeirlərini çap etmək mümkün olmamış, onların üstündən sükutla keçilmişdir. Ona görə də müstəqillik dövründə Məxdumqulunun kitablarından birini «Bağışla bizi» adıyla çap edən naşirlər (bu, şairin ən məşhur dini şeirlərindən birinin adıdır) həmin çatışmazlığı da aradan qaldırmış, böyük sənətkardan bir növ üzr istəmişlər.

Əlinizdəki bu kitab da həcm məhdudluğu üzündən Məxdumqulunun yaradıcılığını tam şəkildə əhatə etmir. Burada onun şeirlərinin təxminən yarısı toplanmışdır. Şeirlər ana dilimizə türkməncə orijinalından uyğunlaşdırılmışdır.

Türkmən şairlərindən biri Məxdumqulu haqqında obrazlı şəkildə belə demişdir: «Xalqın sönməz çırağı Ulu ustad Fəraqi». Bu olduqca isabətli bənzətmədir. Məxdumqulu türkmənlər üçün o qədər böyük əhəmiyyət kəsb edir ki, onlar bir şeyi daha dolğun şəkildə ifadə və izah etmək üçün Fəraqidən bir şeir parçasını misal gətirirlər. Bu mənada Türkmənistan Dövlət Universitetinə, Elmlər Akademiyasının Dil və Ədəbiyyat İnstituna, bir sıra müəssisə və mərkəzə dahi şairin adını verilməsi heç də əbəs deyil. Türkmənistan Respublikasının beynəlxalq miqyasda verilən ən yüksək dövlət mükafatlarından biri isə «Xalqara Məxdumqulu Bayrağı» adlanır.

Biz böyük türkmən şairi Məxdumqulu Fəraqinin seçilmiş əsərlərini də TürkSOY kitabxanası seriyasından buraxmaqla Türk Dünyasına kiçik bir töhfə vermək istədik. Bu kitab da həmin silsilənin əvvəlki kitabları kimi tam könüllülük əsasında, heç bir əmək haqqı, məvacib və honorar alınmadan hazırlanmış, tanınmış işadamı-mesenat Vəliyev Şahmar Rüstəm oğlunun sponsorluğu ilə nəşr edilmişdir. Hörmətli Şahmar müəllimə bu nəcib hərəkətindən dolayı dərin təşəkkürü özümüzə borc bilirik.

Qardaş türkmən xalqına, onun qədim, köklü və zəngin mədəniyyətinə, dünyaya Məxdumqulu kimi bir düha bəxş etmiş ədəbiyyatına sonsuz ehtiram və sevgi ilə,

***Ramiz ƏSKƏR***
***Bakı, 23 fevral 2010-cu il***

## TÜRKMƏNİN

Ceyhun ilə bəhri-Xəzər arası,
Çöl üstündən əsər yeli türkmənin.
Gül-qönçəsi - qara gözüm qarası,
Qara dağdan enər seli türkmənin.

Haqq rəy verib, vardır onun sayası,
Oynaşar çölündə nəri, mayası,
Rəngbərəng gül açar yaşıl yaylası,
Qərq olmuş reyhana çölü türkmənin.

Al-yaşıl bürünüb çıxar pərisi,
Yayılar ənbərin xoş rayihəsi,
Törə, bəy, ağsaqqal - yurdun yiyəsi,
Necə gurdur gözəl eli türkmənin.

Ol mərdin oğludur, mərddir pədəri,
Koroğlu qardaşı, sərxoşdur səri,
Dağda-düzdə qovsa səyyadlar, diri-
Ala bilməz, yolbars oğlu, türkmənin.

Bir olub könüllər, ürəklər, başlar,
Yığılsa, əriyər torpaqlar-daşlar,
Bişib bir süfrədə yeyilsə aşlar,
Çiçəklənər ol iqbalı türkmənin.

Könül havalanar ata çıxanda,
Dağlar lala dönər qıya baxanda,
Bal gətirər, coşub dərya axanda,
Bənd saxlamaz, gəlsə seli türkmənin.

Qafil olmaz, döyüş günü xar olmaz,
Qarğışa, qüvvətə giriftar olmaz,
Bülbüldən ayrılıb, solub zar olmaz,
Daim ənbər saçar gülü türkmənin.

Tirələr qardaşdır, uruğ yarıdır,
İqballar tərs gəlməz, haqqın nurudur,

Mərdlər ata minsə, savaş sarıdır,
Qəsbkara yürür yolu türkmənin.

Sərxoş olub çıxar, ciyər dağlanmaz,
Daşları sındırar, yolu bağlanmaz,
Gözüm dalda qalsa, könül əylənməz,
Məxdumqulu, sözün çalı türkmənin.

## TÜRKMƏN BİNASI

Qurduğum əslində bilgil, bu zəminin mıxıdır,
Olar ol ərkan müdam, budur ki türkmən binası.

Tərki-dünya eyləyər ol, gəlsə rəqib qaşına,
Bil, poladdan bina olan, budur türkmən qalası.

Süleyman, Rüstəmi-Zal, Cəmşid ona olmuş gəda,
Gündə yüz min salsa ləşkər, dəyməz şahın bəlası.

Dağlar ondan alar təlim, ləşkəri səf-səf durar,
Hər çəkəndə Zülfüqarın, artar igidin həvəsi.

Təkə, yomut, yazır, göylən, axal eli bir olub,
Bir yerə qılsa yürüş, açılar gül laləsi.

Külli qızılbaş varını atdı dağ arxasına,
Gecə-sabah yatmazlar, gələr oların naləsi.

Gər qədəm ursa səyyad, olmaz ona müyəssər,
Əsir edib ala bilməz, düşməz türkmən balası.

Arifləri dəm-dəm gələr, toyu vardır hər zaman,
Mərdi-mərdanə sözlüdür, yoxdur könül hiyləsi.

Deyər ki, Məxdumqulu, olmaz könüldə bir qara,
Haq rəy verib, qılmış nəzər, vardır onun sayəsi.

## BİLİNMƏZ

Yomut, göylən təəssüblə özündən,
Çəkdi qoşun, önü-ardı bilinməz.
Sığmaz, çıxdı Dəşti-Dəhan düzündən,
Gedən yolu, qonan yurdu bilinməz.

Qarğa gəlsə, tuğu ilə təpişər,
Heybətindən dağlar-daşlar qapışar,
Ölü durub dirilərdən yapışar,
Arslanı, tülküsü, qurdu bilinməz.

Üç min nizəçisi vardır nökərdən,
Dörd min fildarı var qala yıxardan,
Təkə, salır yürüş etsə yuxardan,
Düşmənin namərdi, mərdi bilinməz.

Əhli-sünnə namus edib gələrlər,
Qala yıxıb bağın bərbad qılarlar,
Dev çəkib İsfahan şəhrin alarlar,
Bu kəndlərin üçü-dördü bilinməz.

Məxdumqulu, Əlinindir bu meydan,
Nə iş tutar, görün, bu Ömər, Osman,
At dəmindən doldu zəmin - asiman,
Xorasanın xaki-gərdi bilinməz.

## TÖKƏR OLDUQ YAŞIMIZ

İstər əldən çıxa dövlət humayım,
Dua qılıb, tökər olduq yaşımız.
Diləyim tuş eylə, gözəl Allahım,
Məğlub olub getdi qızılbaşımız.

Xıdır gəzən çöldə ellər yayılsın,
Yurd binamız qaim olsun, qoyulsın,
Çillə məst nərlərmiz, hamı ayılsın,
Bir süfrədə əda olsun aşımız.

Dərvişlər könlü cəm dursun namaza,
İgidlər yığılsın söhbətə-saza,
Elimiz yetişsin solmayan yaza,
Doxsan dolub, tamam olsun qışımız.

Türkmənlər bağlasa bir yerə beli,
Qurudar Qülzümü, dəryayi-Nili,
Təkə, yomut, göylən, yazır, əlili,
Bir dövlətə qulluq etsək beşimiz.

Məxdumqulu dedi can dirliyinə,
Müsəlmanı qoyma kafir xorluğuna,
Rəvac vergil yomut-göylən birliyinə,
Ol Kamal xan Əfqan olsun başımız.

## ÇOVDUR XAN

Göylən, yomut yola çıxıb, baxışıb,
Ümid etdi, gələr aman, Çovdur xan.
Molla, müfti haqqa dua oxuyub,
Qurtardılar kitab-Quran, Çovdur xan.

Dağlar başın əydi, çənə büründü,
Yellər qala bilməz, yerdə süründü,
Ay-gün batıb, göydə Mərrix göründü,
Buludlar oldular varan, Çovdur xan.

Malın yığıb gəldi çoban-çoluqlar,
Kənara çıxdılar sudan balıqlar,
Özün tuta bilməz yerdəki xalqlar,
Hamısı etdilər əfğan, Çovdur xan.

Bəzirganlar iraq yolu unutdu,
Sövdəgərlər nə mal aldı, nə satdı,
Aylar-günlər batdı, zərli dan atdı,
İns-cins çəkib ərman, Çovdur xan.

Dolandılar Hindistana varanlar,
Ağlaşdılar mərdan adın soranlar,
Kəlamulla açıb, bəxtə baxanlar,
Tapmadı dərdinə dərman, Çovdur xan.

Çəkdiyi ox boşa çıxmaz səyyadın,
Titrətdi aləmi, Çovdur xan, adın,
Sanı, hesabı yox gələn fəryadın,
Dizə çöküb ağlar Turan, Çovdur xan.

Məxdumqulu, uçdu alıcı quşum,
Arxadaşım, əziz sirdaş, qardaşım,
Məna saça bilməz çallaşan başım,
Bürüyübdür onu duman, Çovdur xan.

## ÇOVDUR XAN ÜÇÜN

Əhməd padişahdan xəbər almağa,
Ümid etdi ellər Çovdur xan üçün.
Sağ-salamat varıb, dönüb gəlməyə,
Olmadı iqballar Çovdur xan üçün.

Bağlar donub qaldı, nə yağış, duman,
Bulud haray saldı, bu dərdə ərman,
Zəmin zaye oldu, fələklər fərman,
Cənnət oldu çöllər Çovdur xan üçün.

Qəza qəhrə mindi – pərin sındırsın,
Fələk xəyal etdi – mehrin endirsin,
Dərya cuşə gəldi – sudan qandırsın,
Müştaq oldu göllər Çovdur xan üçün.

İzində oldular, el intizarın,
Ümid ilə gəzdi Annaxal yarın,
Atanəzər qaldı çəkərək zarın,
Gözlər-gözlər yollar Çovdur xan üçün.

Varsa, payı bəlli sultanda, xanda,
Eli bilməz, qaldı həsrəti canda,
Qəzadır, qismətdir Yəzddə, Kirmanda,
Axdı necə qanlar Çovdur xan üçün.

Qürrələr gün oldu, fallar şum oldu,
Varanlar bənd oldu, yollar bim oldu,
Çeşmələr höşk oldu, daşlar mum oldu,
Səna qıldı dillər Çovdur xan üçün.

Söylə, Məxdumqulu, aləm bilsinlər,
Yeri cənnətdədir, rahat olsunlar,
«Haq rəhmət etsin!» deb, dua qılsınlar
Bütün ulus-ellər Çovdur xan üçün.

## ZARLAR İÇİNDƏ

Çovdur xan, köməyim, könül dirəyim,
Sən vəfat edibsən zarlar içində,
Göyləndə pəlvanım, elə gərəyim,
Xalqı qoyub getdin narlar içində.

Gələ bilməz idi ardından düşman,
Gələn tapdı getdi zorundan peşman,
Qoca dağdan bəri − göylənə aşman,
Bizi qoyub getdin marlar içində.

Fələk sənin gül ömrünü soldurdu,
Xəzan dəydi, tər qönçəni yoldurdu,
Qara dağlar dözməz, başın qaldırdı,
Gözü yaşlı duman-qarlar içində.

Kimə nəsib oldu İsfahan yayın,
Sözümdə yanlış yox, behiştdir cayın,
Göylən, yomut - viran oldu sarayın,
Fələk viran etdi xarlar içində.

Məxdumqulu, həmdəm ağlın-sirdaşın,
Tuta bilməz özün, töküb göz yaşın,
Duman aldı dağlar kəmərin, başın,
Günəşlə ay batdı zarlar içində.

## DÖVLƏTƏLİNİN

Sünnəyə sütundur, kafirə səddir,
Çalsa tiği-tizi Dövlətəlinin.
Aləmdə dastandır, əllərdə xətdir,
Söhbət içrə sözü Dövlətəlinin.

Sözləri pənd olub qaldı dillərdə,
Fəqirlər pənahı yaman günlərdə,
İraq ölkələrdə, yaxın ellərdə
Dost, düşməni razı Dövlətəlinin.

Çox cənglər elədi ömrü olunca,
Yaradan yox edib, yerə salınca,
Bu dünyada yaylar, ta ki ölüncə,
Sovulmadı yazı Dövlətəlinin.

Xar etməz hər kimi müdam istəsə,
Təqdirdən dış çıxmaz gənəş nə desə,
Qartal tək alıcı laçın bəsləsə,
Şir alardı bazı Dövlətəlinin.

Ağır uruğludur, həm böyük elli,
Çox yığılsa məşhur, aləmə bəlli,
Meydanda qılınclı, divanda dilli,
Yüzə taydır özü Dövlətəlinin.

Dilək etsə, don daşları əridər,
Qəzəb etsə, hökmü dağlar yeridər,
Günəşdən gövhərdir, aydansa dürlər,
Fələkdə ulduzu Dövlətəlinin.

Neçə elə sərkərdədir, sultandır,
Cəng yerində cəllad, bəlkə arslandır,
Mənzili məsciddir, fərşi divandır,
Gecəsi, gündüzü Dövlətəlinin.

Təmənnası yerdən göylərəcəndir,
Meşədə bəbirdir, dağda pələngdir,

Gəmidə lövbərdir, suda nəhəngdir,
Hara getsə özü Dövlətəlinin.

Xanımları vurnuxurlar sağ-solda,
Hə əldə çarə var, nə qüvvət qolda,
Atı bağda qaldı, yoldaşı yolda,
Çıxmadı xəbəri Dövlətəlinin.

Məxdumqulu, keçər bu dünya onsuz,
Törəlikdə taysız, ərlikdə – tənsiz,
Peyğəmbər oğulsuz, Süleyman sonsuz,
Ona bənzər izi Dövlətəlinin.

## ABDULLA

Mazandaran sənin məkanın, yurdun,
Ol məkanın sən sultanı, Abdulla.
Bəlkə nəsib oldu ruyini gördüm,
Ol bağların sən reyhanı, Abdulla.

Qulluğa möhtacdır Bağdadu Turan,
Arxası Arxaçdır, qabağı İran,
Firəngdə, Rumda çox adını soran,
Bulğarın gövhəri, kanı, Abdulla.

Bulğar şahı sənə yolladı xətti,
Tanrım bəxş eyləmiş sənə rəhməti,
Fatə verər Məhəmmədin ümməti,
Həyat çeşməsinin canı, Abdulla.

Sənə zardır Ərəbistan, Hindistan,
Nərəndən titrəyər bütün Türküstan,
Yolladı çox sovqat dağlı, Gürcüstan,
Əfqan xəlifənin şanı Abdulla.

Sifətin oxşayır Rüstəmi-Zala,
Baş qoşdunuz Xədicə tək zülala,
Altmış oğlan tutub birər piyalə,
Bu cahanın sən pəlvanı, Abdulla.

Hökmündən titrəyər Türküstan şahı,
Sənə möhtac xanı, bəyi, gədası,
Bir sözünün vardır min bir duası,
Mən qoşuram bu dastanı, Abdulla.

Fəraqi tanrının günahkar qulu,
Heç kimsə bilməyir nədir iqbalı,
Sən çoxdan qucursan huri camalı,
Dövrəndə igidlər hanı, Abdulla.

## DEDİLƏR

Ey yaranlar, yavuz dastan bitildi,
Bir qoçaq fanidən keçdi dedilər.
Axır zaman oldu, günəş tutuldu,
Ay-günün şöləsi qaçdı dedilər.

Qəfildən başladı ayrılıq çağı,
Seydim Tarxan çəkər dərdi-fərağı,
Ömrünün hasili – yalnız çırağı,
Badi-xəzan vurub, keçdi dedilər.

Getdi Övəzgəldi, yenə çox zatlar,
Pozuldu söhbətlər, qəm oldu şadlar,
Qardaşlar, sirdaşlar, yaxınlar, yadlar,
Qara geyib, qan ağlaşdı dedilər.

Bədəv atlı, bəy kəmərli, yaraqlı,
Dövlətə, zinətə, malına bağlı,
Mehmanlı bir ərdir, zatlı, otaqlı,
Bu bülənd ordası çaşdı dedilər.

Tənhalıq həsrəti başdan ötərmiş,
Oğulsuzluq bütün işdən betərmiş,
Züryətsiz igidin yeri itərmiş,
Yurdu yox, karvanı köçdü dedilər.

Məxdumqulu, Türküstanın törəsi,
Bir qoçaqdır – Söyünxanın çarəsi,
Savaş günü eşidilməz nərəsi,
Bu qara torpağı qucdu dedilər.

## YA ƏHMƏD ŞAH

Ya Əhməd şah, yerdə yayılıb şanın,
Adın asman gedər ərşi-əlayə.
Gələn nökərindir, gəlməyən ovun,
Böyüklük ziyasın qıl payə-payə.

İrana qılınc vur, yerit sipahi,
Başında bərk olsun dövlət küllahı,
Hümayun dağında şirlərin şahı,
Sanki bir nəhəngsən mövci-dəryayə.

Meşələrin ov ovlayan şirisən,
Rumistan pələngi, devin birisən,
Zal oğlunun almaz peykan tirisən,
Güştasp oğlu kimi bəlli bəlayə.

Yerin İran olsa, yurdun Turandır,
Dost işinə xoşbəxt, düşmən heyrandır,
İqbalın açılar, işin dövrandır,
Mərhəmət nəzərin salsan bir cayə.

Fəraqi der, rəvac verərsən dini,
Şahların şahları, islamın zeyni,
Əmrinə müti qıl İran zəmini,
Ruzi-şəb niyazım budur xudayə.

## SİZİNDİR

Sür, Fəth sərdar oğlu, gəldi vəxt,
Yenə bu dövrani-Əli sizindir.
Köhnə ağır dövlət tazə edər bəxt,
Böyüklük, sərdarlıq yolu sizindir.

İlyas kimin əbr çökən sularda,
Kavus kimin duman düşən dağlarda,
Gəncli şəhər, Xıdır gəzən çöllərdə,
Qadir verən dünya malı sizindir.

Bəxşişin bənd edər bilər-bilməzi,
İqbalın nist edər doğru gəlməzi,
Dükan kanı − Cahangirin almazı,
Bədəxşan mədəni – ləli sizindir.

Qəhrinə kim düşsə – işə bulaşar,
Kərəminə düşən – ərşə ulaşar,
Böyüklük busatı sizə yaraşar,
Firidunun fərd iqbalı sizindir.

Səmərqənd taxtında qurulan yaylara,
Mehdi tək xilafsız səbzə paylara,
Süleyman tək hökmün keçər sulara,
İskəndər tək dərya salı sizindir.

Məşriqə üz vurub çıxsan Xorasan,
Əvvəl kürd sizindir, sonra Yazır xan,
Zir payi-əsbiniz İraq, İsfahan,
Dağıstan həşəmi-heylı sizindir.

Məxdumqulu deyər, Rum tək oyanmaz,
İskəndər gürzüdür döyülməz, sınmaz,
Dağ kimin tərpənməz, dərya tək dönməz,
Yomutun, göylənin eli sizindir.

## GÜRGƏNİN

Önündə bülənd dağ, başında duman,
Dənizdən əsər hey yeli Gürgənin.
Bulud oynar, dolsa çaylara leysan,
Axar boz-bulanıq seli Gürgənin.

Meydanları vardır qarğı-qamışlı,
Gözəlləri vardır altın-gümüşlü,
Boz sürü, qır ilxı, qara camışlı,
Saysız inək-davar, malı Gürgənin.

Qatarlaşıb durar nərlər, mayalar,
Ağır bəzirganlar, tüccar ağalar,
Torpağa qapanıb duran qayalar,
Önü-ardı, sağı-solu Gürgənin.

Bəyləri var, tirmə çəkər belinə,
Yorğa minib, tərlan alar əlinə,
Ağ köksün ver ceyran dəniz yelinə,
Mələyir maralı, çölü Gürgənin.

Məxdumqulu, eldən elə ara var,
Hicranın qılıncı bağrın paralar,
Əlin sallar maral üzlü pərilər,
Enər evlərindən dəli Gürgənin.

## HASAR DAĞINDADIR

Hasar dağı böyük olar,
Üstü dolu geyik olar,
Mərgənlərə beşik olar,
Varsan, Hasar dağındadır.

Hasarın vardır törəsi,
Görənin gələr həvəsi,
Qız-gəlinlərin qönçəsi
Sorsan, Hasar dağındadır.

Dağlardır yerin sultanı,
Köksündə qurmuş dükanı,
Üç yüz altmış pir məkanı
Görsən, Hasar dağındadır.

Məskən tutar çarvadarlar,
Yalçısında yatar marlar,
Dərəsində bitər varlar,
Dərsən, Hasar dağındadır.

Pələnglər çırpınıb çıxan,
Boz marallar qıya baxan,
Sərkəmərdir — dərin tökən,
Yürsən, Hasar dağındadır.

Məxdumqulu der bu dağı,
Yaxıbdır həsrətin dağı,
Eşq edib səfalı çağı
Sürsən, Hasar dağındadır.

## SONU DAĞI

Canım, bizim Sonu dağı,
Dağdağanlı belin sənin.
Yağı görsə qarşılaşar
Yomut, göylən elin sənin.

Öylükdə yaylanı qursaq,
At çaparaq bayraq alsaq,
Təmətədə oraq vursaq,
Nə olar xəyalın sənin.

Çəmən keçər, bayır keçər,
Qızılbayır könül açar,
Soyuq çeşmə suyu içər,
Burda çoxlu malın sənin.

Dürlü-tümən otun bitər,
Hər dərən bir elə yetər,
Qatarlaşıb karvan ötər,
Harayadır yolun sənin.

Məxdumqulu dür seçəndə,
Bu dövran səndən keçəndə,
Üstündən elin köçəndə,
Necə keçər halın sənin?

## OLDUQ

Ey yaranlar, müsəlmanlar,
Cəbrdə yürməli olduq.
Necə zəhmət çəkən canlar,
Cəfanı görməli olduq.

Cahan gendir, məlamət kan,
Arada yandı şirin can,
Üstümüzdə rəhmsiz xan,
Bil, axır vurmalı olduq.

Azıbdır göylən xanları,
Xalqa yanarmı canları?
Qoyma, sürdü var malları,
Göz dikib durmalı olduq.

Məxdumqulu, söyləmə can,
Belin qurşa, gey qəzəb don,
Həddən aşdı bu zalım xan,
Axır tor qurmalı olduq.

## GÖZLƏRƏM

Yurdum Ətrək, elim göylən,
Mən bir sevər yar gözlərəm,
Can şəhrinə düşdü talan,
Qüvvət verən pir gözlərəm.

Ayrıldım ana-atadan,
Gözüm güvənci vətəndən,
Can vermək asan hicrandan,
Mal çoxdur, bazar gözlərəm.

Məmmədsəfadır qardaşım,
Molla Matəm dərs yoldaşım,
Abdulla gəlsə basdaşım,
Peyğəmbər nəzər gözlərəm.

Ürəyimdən onca fəğan,
Gözdən axdı bulaq tək qan,
Sirdaş deyil fələk-dövran,
Qaçsam der, məzar gözlərəm.

Sonu dağ, güvəncim mənim,
Gəzib mən sərində sənin,
Səyyadam, ovlar ceyranın,
Siyah yılçır mar gözlərəm.

Məxdumqulu, bu qiyamət,
Qoydu başıma çox afət,
Türkmən elim, ey adəmzad,
Azad sel, güzər gözlərəm.

## ATAMIN

Altmış beşdə, novruz günü, lu ili,
Bu əcəl yolunu pusdu atamın,
Bu dünyanın işi belədir, bəli,
Ömür kəndirini kəsdi atamın.

Bu cahanın işrətini sevmədi,
Sərvətini, dövlətini sevmədi,
Köhnə şaldan artıq paltar geymədi,
Axirətdi ancaq qəsdi atamın.

Derdi: «Dünya fani, ömrə bəha yox»,
Gündüz rövzə, gecə uyğu, röya yox.
Münkir bilməz, müxislərdə dua çox,
Peyğəmbər dəstidir dəsti atamın.

Bilirəm, söylərəm işin içindən,
Kam alar, kim möhkəm yapışsa dindən,
Yarısı mələkdən, yarısı cindən,
Mücavirsiz olmaz üstü atamın.

Nüqabədə üç yüz ərən uğraşdı,
Çiltəndə atama nəzərim düşdü,
Nücabədə həftənlərə qarışdı,
Abdulladır çün peyvəsti atamın.

Aləm içrə adam qalmaz, ad gəzər,
Bu sirlərdən cahan xəlqi yad gəzər,
Yeri cənnət içrə, göydə şad gəzər,
Yerdə xoşbəxt olar nəsli atamın.

Məxdumqulu, gizli sirr var bu işdə,
Kamil ərə gərək deyil fəriştə,
Məhşər günü birbaş girər behiştə, –
Hər kim candan olsa dostu atamın.

## AZADİM HANI?

Fələk, gedər idim, sən düçar oldun,
Gözümün nuranı Azadim hanı?
Qəlbimi çıxarıb, itlərə verdin,
Şəhrimin sultanı Azadim hanı?

İmamsız qalıbdır məscid-mehrabım,
Doğmadı nur saçan ol mahım, tabım,
Yalnız qaldım, sel alıbdır ətrafım,
Könlümün ümmanı Azadim hanı?

Şəkər ikən zəhər oldu sözlərim,
Zəfəran tək saralıbdır üzlərim,
Qüvvət getdi, qubarlandı gözlərim,
Minbərim əzanı Azadim hanı?

Dörd fəslim nar oldu, dağlar əridi,
Dirilər uçdular, ölü yeridi,
Gedən varıb haqqa iqbal dirədi,
Elimin zəbanı Azadim hanı?

Torpaqlar sel oldu, sellər qum oldu,
Xumlar cəm oldular, cəmlər xum oldu,
Həvəslər yas oldu, peşəm qəm oldu,
Ürəyim aramı Azadim hanı?

Ölülər dirilib, ərzə vardılar,
Haqdan bir kəlamı gəlib sordular,
Çox yalvarıb, anlat deyib durdular,
Ölü-diri dövranı Azadim hanı?

Kafirlər şad olub, ağlar müsəlman,
Haqqa yalvarıbdır Xıdır, Süleyman,
Buğ olub yüksəldi ərşə bu ümman,
Göylənin pəlvanı Azadim hanı?

Ərmanım yox, fələk, bir savaş qılsam,
Ya yıxsan, basılsam, ya sərin alsam,

İtlərə aş edib, bazara salsam,
Bağımın reyhanı Azadim hanı?

Guşlar eşidəndə varı kar oldu,
Dağ əridi, daşlar bütün yer oldu,
Mollalar Quransız, pirlər kor oldu,
Sahibi-Quranım Azadim hanı?

Yer üzünü siyah duman eylədin,
Söylə, fələk kimə aman eylədin,
Fəraqini, bax, biiman eylədin
Namusum imanı Azadim hanı?

## QARDAŞ ABDULLA

Sən gedəndən doqquz ildir ötəni,
Harda vətən tutdun, qardaş Abdulla?
Heç gəlməzmi bir insanın gedəni,
Harda vətən tutdun, qardaş Abdulla?

Dağa ərzim deyib, tutdum xəbərin,
Lal olubdur dili, deməz azarın,
Ata-anasız nədir sənin qərarın?
Harda vətən tutdun, qardaş Abdulla?

Qorxu faydası yox gedəcək cana,
Ömür axır oldu, doldu peymana,
Yoxsa sən düşübsən dibsiz ümmana?
Harda vətən tutdun, qardaş Abdulla?

Üstümüzə hicran odu səpildi,
Evimizə kədər-qüssə təpildi,
Qan ağlar, atamın beli büküldü,
Harda vətən tutdun, qardaş Abdulla?

Eldə-gündə yoxdur mənim qərarım,
Dərd üstünə artdı qəmim-azarım,
Yad oldu vətənin, evin-güvzarın,
Harda vətən tutdun, qardaş Abdulla?

Qulaq verrəm eşitdiyim hər sözə,
Cəfa verdin hicran ilə sən bizə,
Özümu vururam alova-közə,
Harda vətən tutdun, qardaş Abdulla?

Gülüb-oynamadıq sənlə şad olub,
Birbaş getdin, tamam bizdən yad olub,
Məxdumqulu zar ağlayır, mat olub,
Harda vətən tutdun, qardaş Abdulla?

## GÖZƏL «ŞİRQAZİ»

Məkan tutub, üç il yedim duzunu,
Gedər oldum, xoş qal, gözəl «Şirqazi».
Ötürdüm qışını, novruz-yazını,
Gedər oldum, xoş qal, gözəl «Şirqazi».

Haqqdan bizə buyruq, bağlıdır belim,
Səndə təlim aldı, açıldı dilim,
Gəlsin deyib gözlər ol gərkəz ilim,
Gedər oldum, xoş qal, gözəl «Şirqazi».

Seçərəm indi mən ağı-qaranı,
Dost, rəqib, qardaşı, haqqı, yaranı,
Oxudım, götürdüm kitap, Quranı,
Gedər oldum, xoş qal, gözəl «Şirqazi».

Ağlım qısa idi, kasam qaynadı,
Ürəyim atlandı, könlüm oynadı,
.....................................................
Gedər oldum, xoş qal, gözəl «Şirqazi».

Coşgun ürəyimdə mövç vurar, yatmaz,
Qaynar, qəzəblənər, heç laya batmaz,
Elm-təlim alan səni unutmaz,
Gedər oldum, xoş qal, gözəl «Şirqazi».

Peyman dolmaz, gəlsək taqət yetməyən,
Pünhan zahir qılmaz aqil getməyən,
Badi-pay atlanıb, seyran etməyən
Gedər oldum, xoş qal, gözəl «Şirqazi».

Quma girsəm, qəvvas kimi üzərəm,
Bihəsrət dolanıb, biqəm gəzərəm,
Dəhan içrə balü zəban əzərəm,
Gedər oldum, xoş qal, gözəl «Şirqazi».

Kamil olub, mən sərəncam qılmışam,
Müşfiqimdən, ol pədərdən qalmışam,

Kəbəmdən ayrılıb, cüda olmuşam,
Gedər oldum, xoş qal, gözəl «Şirqazi».

Sıramı gözləyib kamana düşdüm,
Leysan tökdü yaman, qaynadım-coşdum,
Xoş qal, bu gün Ceyhun çayını aşdım,
Gedər oldum, xoş qal, gözəl «Şirqazi».

Məxdumqulu yığıb könül vəfasın,
Təzim etdi, kim çəkmişdi cəfasın,
Heç zaman unutmaz qızıl qapısın,
Gedər oldum, xoş qal, gözəl «Şirqazi».

## «DURGİL» DEDİLƏR

Bir dəfə yatırdım gecə yarıda
Dörd atlı gələrək: «Durgil» dedilər.
«Xəbər verək sənə, fürsət var ikən,
Şol yerdə ərlər var, görgül» dedilər.

Nəzərim yetişcək şol dörd mərdanə,
Könlüm cuşa gəldi, başım gərdanə,
Şol vaxtda var idi iki divanə:
«Durma, oğlan, onda vargil!» dedilər.

Şol iki divanə tutdu qolumdan,
Alıban getdilər duran yerimdən,
Bir işarət oldu onun birindən:
«Seyranda varıban durgil!» dedilər.

Oturmuşduq, gəldi iki pirzada,
Gözündən yaş axar, dili duada,
«Hu, həqq!» deyib çıxdı altı piyada,
«Adam indi gələr, görgil!» dedilər.

Bir dörd atlı gəldi, əyni göy atlas,
Əsaları yaşıl, atları bəyaz,
«Məclis halqasını qurma belə az,
Adam çoxdur, ulu qurgil!» dedilər.

Dışdan çıxdı altmış atlı, gördülər,
«Məhəmməd!» deb, ona sarı yürdülər,
Sağlıq-salamatlıq bir-bir sordular,
«Durma, ulu yerə yürügil!» dedilər.

Bir atın ardına məni verdilər,
Seyranda şol yerə varıb durdular,
Tamam oturdular, məclis qurdular,
Mənə «Oğlan, ara girgil!» dedilər.

«Əlidir» dedilər, tutdu dəstimdən,
Həsir döşəyimi aldı altımdan,

Mən bilmədim, nəsə qoydu üstümdən,
«Səfalı dövrandır, sürgil!» dedilər.

Heydərdən soruşdum bütün adbaad:
«Həzrəti peyğəmbər odur, olma yad,
Ol Səlim xocadır, ol Baba züryat,
Ol Veysəl Qərani, bilgil!» dedilər.

«Ol Bəhaəddindir, ol həm bir ərdir, –
Biri Zəngi Baba, ol da namdardır,
Ol sevinib duran dörd çariyardır,
Məqsədin nə olsa aygil!» dedilər.

Şol vaxtda duran bir-iki şeyx-şəf:
«Bu oğlana fatə verək – dedi – səf
Yüz iyirimi dörd min ənbiya, əshab,
Hamısı şolardır, bilgil!» dedilər.

Rəsulullah dedi: «Ya Şahi-mərdan,
Ey, ya Səlim xoca, ya Baba Salman,
Əbubəkr-Siddiq, ya Ömər, Osman,
Bu qulun məqsədin vergil!» dedilər.

Səlim, Baba Salman buyurdu mərdə,
Piyaləni tutub, saldılar dərdə,
Getdi ağlım-huşum, yatdım şol yerdə,
«Ərşdə, fərşdə nə var, görgil!» dedilər.

Yel oldum, yürüdüm yer damarına,
Nəzərim toxundu ərş kəmərinə,
«Cəbrut aləmində cəlil sirrinə –
Gəlib, özün baxıb görgil!» dedilər.

Nəyi xəyal etsəm, ələ gətirdim,
Hara baxsam, ona nəzər yetirdim,
Bu hal ilə mən farağat yatırdım,
Üzümə toxunub «Dur, qul!» dedilər.

Rəsulullah dedi: «Əshablar, yürün,
Oğlanı uzadın, bir fatə verin»,
Buyurdu: «Dörd atlı, götürüb gedin,
Aldığınız yerdə qoygil!» dedilər.

Durub Məxdumqulu gözün açıbdır,
Başına nə işlər gəlib keçibdir,
Qızmış nər tək ağ köpüklər saçıbdır,
«Oğlan, Allah yarın, vargil!» dedilər.

## «OYAN» DEDİLƏR

Yatmış idim qəmdə, gəldi ərənlər,
«Dur görək yerindən, oyan!» dedilər.
Gözüm açıb gördüm cümlə-cahanı,
«Şol duranı Şahi-mərdan!» dedilər

Ərənlər cəm olub bazar etdilər,
Münafiqlər durub həzər etdilər,
Əli babam bizə nəzər etdilər,
Bir kasə mey verib: «İç, qan!» dedilər.

Oyanıb qəflətdən, açdım gözümü,
Ərənlər payinə sürtdüm üzümü,
Oxutdular, haq sözlədim sözümü,
«Səksən min kəlamı bəyan» dedilər.

Ərənlər cəm olub, mundan köçdülər,
Sirat körpüsündən bir-bir keçdilər,
Ol hovzi-kövsərdən şərab içdilər,
İçən şahbazları «Sultan» dedilər.

Məxdumqulu, sözlə bu şirin dildə,
Umudum çox dürur şol duran yolda,
Beş vaxt namazını oxu hər gündə,
«Axirət yoldaşın - iman» dedilər.

## UÇDUM, YARANLAR

Bir cümə gecəsi gördüm düşümdə,
Bal vurub, göylərə uçdum, yaranlar.
Pərvaz edib, seyran etdim dünyanı,
Bir abadan yerə düşdüm, yaranlar.

Kəhkəşana çıxıb dürlü səmərlər,
Min dürlü meyvələr, xürrəm şəcərlər,
Narıncı, turuncu, leymun, almalar,
Bir abadan bağa düşdüm yaranlar.

Açılmışdır onda rəngbərəng güllər,
Şurişi-əfğanda şeyda bülbüllər,
Mərmərdən hovuzlu, kövsər tək sular,
Təhəyyür eyləyib, çaşdım, yaranlar.

Ol qara bağlıqda gördüm bir çəmən,
Əcaib tərkibdə gördüm əncümən.
Dövrə girıb, gördüm, oturmuş çiltən,
Salam verib, qolum qucdum, yaranlar.

Hammı avaz edib «Əleyk!» aydılar,
İşarət eyləyib: «Ötgül» dedilər.
Dövrə qurub, cama şərab qoydular,
Mənə yetcək, qolum açdım, yaranlar.

Bilmədim, mənə çox, yoxsa az verdi,
Özgə aləm, başga bir avaz verdi,
Eşq aldı könlümü, dilə söz verdi,
Ayaqdan-ayağa düşdüm, yaranlar.

Məxdumqulu, huşyar oldum, oyandım,
Oyandım, alışdım, tutuşdım, yandım,
Məna bazarında xəyyata döndüm,
Şirin qəzəl donun biçdim, yaranlar.

## OLDUM GİRYANA

Suçumu yad edib, üzüm xak edib,
Səhər nalış ilə oldum giryana.
Didədən yaş töküb, sinəm çak edib,
Dəli tək özümü vurdum hər yana.

Könlümü keçirdim cümlə-cahandan,
Nə cahandan, bəlkə əl üzdüm candan,
Xıdırdan, İsadan, Şahi-mərdandan,
Himmət alıb baxdım suyi-asmana.

Asmanın üzündən kəhkəşan keçdi,
Qəfildən üç ərə nəzərim düşdü,
İki yaşıl geymiş, bir səfid puştu,
Gözüm gördü, dilim gəlməz fərmana.

Biri gəlib, əlin köksümə vurdu,
Biri bir tiğ ilən ürəyim yardı,
Ağzıma ağzın qoyub, biri dəm vurdu,
Derlər: «Ərzin degil Şahi-mərdana!»

Bular böylə decək, dilim açıldı,
Qana-qana mey-məhəbbət içildi,
Könlümə yeddi tövr sual keçildi,
Dedim: «Rüxsət olsa, gəlsin zəbana».

İki uzun ərdir, bir qısa qəddir,
Dedilər: «Xoşbəxtdır, yaxşı fürsətdir,
Sözün olsa, soruş, sənə rüxsətdir,
Könlə gələn sözün gəltir bəyana!»

Dedim: «Göydən ağır, yerdən mərd nədir?
Dəryadan bay nədir, daşdan səxt nədir?
Oddan yaxıcı nə, buzdan sərt nədir?
Zəhərdən acıraq nədir bu cana?»

Derlər: «Yaman töhmət ağır asmandan,
Qəhərsiz, yaxşı söz gendir cahandan,

Münafiqin könlü səxt səngistandan,
Əhli-qane bənzər bəhri-ümmana,

Cəbr eyləyən sultan yaxıcı közdən,
Xəsisdən diləmək soyuqdır buzdan,
Cəfaya can etmək zəhər cansuzdan,
Öyüddür bu sözlər, bizdən nişana».

Bular böylə decək, yerimdən durdum,
Qədəm vurdum, əl ətəyə yetirdim,
Məst oldum, sust oldum, özüm itirdim,
Gap-kəlam tapmadım, qaldım heyrana.

Dedilər: «Üç kişi olduq ustadın,
Daim dastan olar aləmdə adın,
Məxdumqulu, vaxtdır, istə muradın...»,
Axmaq açar bu sirri, ya divanə.

## BİZƏ SARI

Qülzümdən atlanıb qırx yol keçərəm,
Əgər ki meyl etsə yar bizə sarı,
Qədəm nə ki, qanad taxıb uçaram,
Desə dilbər: «Aşiq, yür bizə sarı!»

Qırx il kəmərbəstə, qulluğa girəm,
Altı gün görmərəm altmış il duram,
Bir gözəl yar ola, canımı verəm,
Camalın ərz edə bir bizə sarı.

Nə elə üzüm var oxşasın aya,
Nə ayrı evim var bənzər saraya,
Ulu tanrım qoymaz betər bəlaya,
Açar dərgahından dər bizə sarı.

Göründü bir kişi dəsti şərablı,
Yeldən canamazlı, sudan mehrablı,
Əyni ağ ridalı, yaşıl niqablı
Uğradı bir əcəb ər bizə sarı.

Yoldaş olub ona yürdüm bir meydan,
Meydan içrə dolub oturmuş mərdan,
Bir eyvan üstündə mənə dörd yerdən
Dedilər: «Əlini ver bizə sarı».

«Hardasan?» deyərək əlim tutdular,
«Fəraqi!» deyərək nərə etdilər,
Bədənimi altmış parə etdilər,
Dedilər: «Mərd olsan, dur bizə sarı».

Məxdumqulu, beş gün işrət sürməyə,
Yer deyildir əylənməyə, gülməyə,
Qərarım yox oturmağa, durmağa,
Ağzın açıb durmuş yer bizə sarı.

## SEYRAN İÇİNDƏ

Ey yaranlar, müsəlmanlar,
Bir gecə seyran içində,
Otuz iki kişi gördüm
Ol Şahi-mərdan içində.

Olara verdim salamı,
Sordular sağlıq kəlamı,
Şeyxü seyyid – Mövla Cami,
Ol yeddi sultan içində.

Sultan Veys Pəhlivani,
Həkim Ata Süleymani,
Xoca Yusif Həmədani
Ol şahi-Kənan içində.

Türküstan yiyəsi sərvər,
İmam Kazım, imam Cəfər,
Yəhya ilə Nuh peyğəmbər,
Bəyazid sultan içində.

Gözəl pirlər, gözəl yarlar,
Çəkdilər bu yolda zarlar,
İmam Rza şahi-pirlər,
Neçə gözəl can içində.

Məxdumqulu, sirrim çoxdur,
Mən neyləyim, açan yoxdur,
Ölmək haq, dirilmək haqdır,
Oxudum Quran içində.

## DİVANA GƏLDİ

Bir gecə yatırdım, şah Nəqşibəndi –
Bəhaəddin adlı, divana gəldi.
Əsasını alıb düz Buxaradan,
Haq eşqinə məstü məstana gəldi.

Bir neçəsi yarü yaran durdular,
Məclislər uzandı, halqa qurdular.
Nərələr çəkdilər, səmah vurdular,
Sədalar düzüldü, can-cana gəldi.

Qovğa qopdu, rəhmət boyandı düzlər,
Saçıldı qan-yaşlar, açıldı gözlər,
Yığildı dərvişlər, töküldü feyzlər,
Guya dersən axır zamana gəldi.

Oxur olsa, elmi-lədun acıqlı,
Həm divanə, həm bəngi, həm içikli,
Əlində badəsi başdan keçikli,
Sinəmdə qoydular, bir şana gəldi.

Məxdumqulu deyər, Qurana uydum,
Qeybəti dışladım, haramı qoydum,
Qoruya bilmədim, sirrimi dedim,
Saxlaya bilmədim, zəbana gəldi.

## BİR NAN GƏTİRDİ

Bir gecə yatırdım, şah Nəqşibəndi
Kərəmi coş edib, bir nan gətirdi,
Sağ əlində gülgün badə şərabı,
Sol əlində tazə büryan gətirdi.

Oyandım uyğudan, qaldım düşümdən,
Heyran qaldım divanənin işindən,
Badəsin nuş edib, getdim huşumdan,
Qəm didədən əşki-giryan gətirdi.

Can xüruşa gəldi yanıb-coşmadan,
Ürəyim mövç urdu dolub-daşmadan,
Bir işarət oldu, ona düşmədim,
Fəhm etmədim, canda ərman gətirdi.

Anlamadım, oldum eşqə xiridar,
Bilmədim, istədim dilbərdən didar,
Eşq dərdinə düşdüm, qaldım giriftar,
Kimsə bu dərd üçün dərman gətirdi.

Məxdumqulu, durdum təvaf etməyə,
Dil fərman vermədi cavab etməyə,
Eşq əhlinin halın xarab etməyə
Ağlın alıb, məsti-heyran gətirdi.

## KÜLLAHLI GƏLDİ

Bir gecə yatırdım, bir əhval gördüm,
Bir bölük başları küllahlı gəldi.
Diksinib oyandım, yerimdən durdum,
Əlləri qızıldan əsalı gəldi.

Bir bölük ərənlər dövrəmi alıb,
Al-yaşıl geyinib, əsbabın salıb,
Tutdum birisini əlindən çəkib,
Ləbləri şəkərdən məzəli gəldi.

Bir pəri sallanıb, seyrə çıxıbdır,
Qəmzə ilə qələm qaşın çəkibdir,
Bu canımı eşq oduna yaxıbdır,
Başları qızıldan ciğalı gəldi.

Cəfalar çəkibdir yar diyarında,
Bağda bitən alma ilə narında,
Məxdumqulu, bir pərinin zarında
Hamısının dili sənalı gəldi.

## GÖRDÜM

Şükür haqqa, biz də bu yola düşdük,
Keçirdim, bir neçə əyyamı gördüm.
Mərifətin dəryasına yetişdik,
Ariflər sürərlər, yüz gəmi gördüm.

Xıdır seyran edər qüdrət aləmin,
Musa oxur həqiqətin kəlamın,
Yeddi gün almamış tanrı salamın,
Qütbül-Əqtab adlı bədnamı gördüm.

Tazə taban olan ömrüm çırağı,
Qış-xəzanı dəysə, göyərməz bağı,
Göz edib qarşıda bir neçə saqi,
Hər biri oynadır yüz camı gördüm.

Ağladım, yıxıldım, tutdum əlini,
Dörd pişvazı ilə həzrət Əlini,
Səncər xan, Səlim şah, yeddi vəlini,
Bir Zöhrə, on iki imamı gördüm.

Süleymanı gördüm, yatır eyvanda,
Bir neçə qaiblər cəm olmuş onda,
Qülzüm dəryasında, dibsiz ümmanda
Əli, Hatəm salan ləcamı gördüm.

Qarun bu dünyanı aldı mal ilən,
İblis asi oldu, gəlməz yol ilən,
Səmənqan şəhrində batır Zal ilən,
Bir devlə cəng edən Rüstəmi gördüm.

Məxdumqulu, fərman oldu Allahdan,
Yerə enib gəldi ərşi-əladan,
Cəbrayıl gətirmiş ulu dərgahdan,
Məhəmmədə enən kəlamı gördüm.

## KƏRƏM İSTƏRƏM

Əvvəl başda, qadir Allah,
Səndən bir kərəm istərəm.
Badam qabaq, alma yanaq,
Bir ziba sənəm istərəm.

Tanrı verməsə, nedəlim,
Baş alıb, hara gedəlim,
Oturub dursun ədalım,
Qaşları qələm istərəm.

Özünə hörmət gətirən,
Ərin xidmətin bitirən,
Qaş-qabaq çatmaz oturan,
Mənalı gülən istərəm.

İyirmi yaş ötdü məndən,
Həzz almadım, dünya, səndən,
Dili şirin, ləbi xəndan,
Qoynuna salan istərəm.

Qul Məxdum, gəldim cahana,
Bir yar vergil ağlı dana,
Düşdüm him bilməz nadana,
Bir qədrim bilən istərəm.

## AYRILDIM

Bülbüləm, ahu zar çəkib,
Tazə gülzardan ayrıldım.
Gözdən qanlı yaşım töküb,
Sevdiyim yardan ayrıldım.

Yara yaraşar sürməcə,
Sifətin söylərəm onca,
Ağzı şəkər, ləbi qönçə,
Zülfü qaradan ayrıldım.

Şirin canda yoxdur taqət,
Cəbri onun cana rahət,
Qaşları fitneyi-afət,
Çeşmi-xunxardan ayrıldım.

Ayrıldım qönçə-gülümdən,
Siyah saçı sünbülümdən,
Xoş avazlı bülbülümdən,
Şirin göftardan ayrıldım.

Dəli könlüm arzumanı,
Külli gözəllərin xanı,
Səkkiz cənnətin bostanı,
Bağçalı vardan ayrıldım.

Elləri var toy-düyünlü,
Soyuq sulu, göy çəmənli,
Eli – göylən, adı – Mənli,
Nazlı dildardan ayrıldım.

Məxdumqulu, aşiq məstan,
Bağladım şanına dastan,
Mənzilgahi bağü bostan,
Almalı nardan ayrıldım.

## AYIRAN

Şeyxim, sənə düşmandır,
Yarı yardan ayıran.
Sonu sənə peşmandır,
Yarı yardan ayıran.

Atan bağrı daş olsun,
Anan gözü yaş olsun,
Min bəlaya tuş olsun
Yarı yardan ayıran.

Sevgili oğlu ölsün,
Gözünün yaşın silsin,
Məcnun qarğışı alsın
Yarı yardan ayıran.

Məni yandıran yansın,
Yanan çırağı sönsün,
Əhli, övladı ölsün,
Yarı yardan ayıran.

Ölməsin, həm gülməsin,
Bağrı yerdən qalmasın,
Bir züryəti qalmasın
Yarı yardan ayıran.

Məxdumqulu der, gördüm,
Haq işinə can verdim,
Yaradana tapşırdım,
Yarı yardan ayıran.

## GÖZƏLSƏN

Gün xəncəri göydən yerə enəndə,
Günə qarşı qardaş ayı, gözəlsən.
Usta Cəfər işi, sincab cübbəsi,
İsfahanda qurulan yayı, gözəlsən.

Saçbağın ucunun simdir eşməsi,
Üstündən yol düşsə, zordur aşması,
Ağzın abi-həyat, zəmzəm çeşməsi,
Eynəl-baqi suyun layı, gözəlsən.

Qızıl desəm qızıl, al desəm alsan,
Hindistanda şəkər, Bulğarda balsan,
Eşq ilən açılan bir tazə gülsən,
Yusif–Züleyxanın tayı, gözəlsən.

Hər kim güclü olsa, ona «pir» derlər,
«Dərdli qulun dərmanını ver» derlər,
«Qovunun yaxşısın çaqqal yer» derlər,
İqballı bəndənin payı, gözəlsən.

Şöhrətin Çin-Maçin, dağlar aşası,
Səni görənlərin ağlı çaşası,
Hindistanın rəngli qızıl şişəsi,
Ətirli çilimin nayı, gözəlsən.

Məxdumqulu xəlqdən sirrin qızləsə,
Verin cəzasını yalan sözləsə,
Əvvəldə, axırda yiyəm gözləsə,
Qərib biçarənin payı, gözəlsən.

## GÖZÜM DÜŞDÜ

Şükür, əlhəmdülillah!
Canana gözüm düşdü,
Meyxanada mey içdim,
Məstana gözüm düşdü.

Ey zülfü, saçı ənbər,
Mehrab ki üzün minbər,
Ey ləli-ləbi gövhər –
Ümmana gözüm düşdü.

Ey gözləri həramı,
Gəl seyr eylə yaramı,
Ey könlümün aramı –
İmana gözüm düşdü.

Ey cadu ceyran gözlü,
Ey şəhdi-şəkər sözlü,
Ey şəms-qəmər üzlü –
Tabana gözüm düşdü.

Arzuda gəzər ellər,
Xidmətə gələr qullar,
Tazə açılan güllər –
Bostana gözüm düşdü.

Hər saçları bir sünbül,
Guya ki mənəm bülbül,
Ey cənnət içində gül,
Rizvana gözüm düşdü.

Bu dərdimə sən dərman,
Odunda olam nalan,
Məxdumqulu der, ey can,
Canana gözüm düşdü.

## DİILƏYİM

Dərdli dilbər, dilləşərsən, gəl bəri,
Dulluqdur mənim də dərdim, diləyim.
Soraqlaram mən də sən tək bir yarı,
Səni soruşmaqda yoxdur yalanım.

Əgər gənəş salsam tanış-bilişə,
Deyərlər: «Şirin bal yağa garışa»,
Hər səhər əfv üçün çıxsam nalışa,
Əvvəl yarım olar yada salanım.

Qiymətdə bənzərsən dürə, zərə sən,
Tanımaza düşüb, dəymə yerə sən,
Qadir qismət etsə, mənə varasan,
Sənin kimin yardır mənim ölənim.

Hər dilbər ki könlüm öyün yarıdar,
Yatan bəxtim ol yaradan oyadar,
Qarğışım daşları mum tək əridər,
Pür-budaq eyləyər alqış qılanım.

Gözəl görkün göydə gündən kəc deyil,
Gözəl yarın olsa, ömrün puç deyil,
Məxdumqulu, nə baş versə, gec deyil,
Olsa mehribanım, nəzər salanım.

## YAR, SƏNDƏN

Bülbülləri yesir edən gül-xəndan,
Görən, xəbər tutarammı, yar, səndən.
Yeddi iqlim mənə görünər zindan,
Görən, xəbər tutarammı, yar, səndən.

İsfəndiyar gözü Rüstəm Zalında,
Şam, Nəcəfdə, Məkkə, Dəməşq elində,
Ərzi-Qarsda, Kərbəlanın çölündə,
Görən, xəbər tutarammı, yar, səndən.

Şərab içib, sərxoş olub, səyrəsəm,
Qanım-canın qıyım-qıyım doğrasam,
Koroğlu tək dağdan-dağa uğrasam,
Görən, xəbər tutarammı, yar, səndən.

Bir gül qoxar gözəl yarın bağında,
Bülbül hücum eylər solü sağında,
Beytullanın Səfa, Mərvə dağında,
Görən, xəbər tutarammı, yar, səndən.

Şeyx Sənan tək eşq oduna qalansam,
Şibli kimin toz-torpağa bulansam,
Kəbə varıb, yeddi kərə dolansam,
Görən, xəbər tutarammı, yar, səndən.

Yusif kimi zindan içrə ağlasam,
Cərcis kimi can yolunda çağlasam,
Yunus kimi haqqa qulluq bağlasam,
Görən, xəbər tutarammı, yar, səndən.

Dua qılıb, əlim göyə qaldırsam,
Gülfərxar tək qızıl üzüm soldursam,
Qopuz alıb, böyük nərə çaldırsam,
Görən, xəbər tutarammı yar, səndən.

İsa kimi xəlvət tutsam səmada,
Idris kimi qulluq etsəm ziyada,

Xıdır İlyas kimi girsəm zülmətə,
Görən, xəbər tutarammı, yar, səndən.

Məxdumqulu, aşiqlərin məstində,
Nərgiz gözü heyran edər dəstində,
Yeddi yerdə, doqquz fələk üstündə,
Görən, xəbər tutarammı, yar, səndən.

## UTANMAQ

Aşiqi-əzələm, sonam, mən sənə,
Nə ədəb-ərkan var, eldən utanmaq,
İltifat etmədin hərgiz sən mənə,
Eyləməz bu işi bir qara qalpaq.

Mənim tək eşqində çoxlar sən yarın,
Gündüz giriftarın, gecələr zarın.
Ömrüm paymalındır canım nisarın,
Olsaydı vəslinə bir çarə qılmaq.

Əgər bir heç olsam, sənə gələrəm,
Bir ələngə olsam, qana gələrəm,
Mürdə yüz sal olsam, cana gələrəm,
Olsaydı bəzm içrə bir yada salmaq.

Ahım şərərindən ün salıb odlar,
Vardılar dərgaha eyləyib dadlar,
Əridi, yox oldu cümlə cəmatlar,
Öndən-sona varmı heç böylə olmaq.

Bəndənəm, gər desən: «Nan verən alsın».
Müdam möhtacınam, kan verən alsın.
Gər zövqi-vüsalın can verən alsın,
Yaraşar Firaqa can verib almaq.

## HƏR YANA

Yarsızlıqdan yaman iş yox,
Göz salıb gəzsəm hər yana,
Ya yaradan, bir yar vergil,
Çox məşəqqət dəydi cana.

Bir yar ver ki ətli-qanlı,
Könlü gen, köksü meydanlı,
Dil bilən, ağıl-kamallı,
Üzü həm olsun görkana.

Qədir biləndən dış etmə,
Naqədirə yoldaş etmə,
Dil bilməz bəla tuş etmə,
Sadə dil olsun – türkanə.

Kərəmin güclüdür, görgil,
Dersən: «Dua qıl, əl gərgil»,
Nə versən, teziraq vergil,
İxtiyar yoxdur bu cana.

Boyu uzun, pəs olmasın,
Xətdən aşa məs olmasın,
Ağılsız, nakəs olmasın,
Sadədən olsun – türkanə.

Yaxşı əyal ələ gəlməz,
Nadan yaxşı qədrin bilməz,
Əyalsıza müdar olmaz,
Dönsən hökmi-Süleymana.

Dərvişlərə yolsuzluğu,
İgidlərə malsızlığı,
İlahi, əyalsızlığı
Görkəzmə heç müsəlmana.

Məxdumqulu, yansam, bişsəm,
İnanmazlar oda düşsəm,
Həvəsim var, bir qız qucsam,
Desəm sözümü ərkana.

## DİLBƏRİN

Könül şəhrinə od saldı,
Vah, neylək, narı dilbərin.
Ətrafımı duman aldı,
Gələndir qəhri dilbərin.

Adam nəsli deyil məgər,
Huri-qulman başın əyər,
Xəndan eylər, bizə dəyər,
Qorxuram, marı dilbərin.

Gövhər, yaqut yar boynunda,
Fələk lərzandır oynunda,
Yetişıbdir yar qoynunda,
Pünhandır narı dilbərin.

Odur aşiqlər atəşi,
Əriyib Məcnunun yaşı,
Kənizidir, həm sirdaşı –
Behiştdə huri dilbərin.

Yandı qoca ürək, yaran,
Xiridarı sən biçarən,
Məxdumqulu – bəxti qaran
Namusu, arı dilbərin.

## QARA GÖZLƏRİN

Səbəb oldu yanan cana,
Cəlladdır qara gözlərin.
Yetirməz nurbat-amana,
Cəlladdır qara gözlərin.

Pərim, yalnız-tənha yürmə,
Yaman əhlin üzün görmə,
Siyah qaşa çəkib sürmə,
Afətdir qara gözlərin.

Cəllad gözlər, aman-aman,
Dünya üzün qıldın duman,
Eşq əhlini edin bican,
Rahətdir qara gözlərin.

Məxdumqulu, yar ərmanı,
Ağladar bəşər-qılmanı,
Müsəlmanın din-imanı,
Ümmətdir qara gözlərin.

## NEYLƏR YARIM, YA ALLAH

Can coşğuna gəldi, yandım, yarıldım,
Bağışlasan neylər yarım, ya Allah.
Hesabsız sevişdim, evsiz ayrıldım,
Bağışlasan neylər yarım, ya Allah.

Sözləşərdim, sirləşərdim yar ilə,
Ürəyində yar xəyalı var ilə,
İndi lakin ayırdılar zor ilə,
Bağışlasan neylər yarım, ya Allah.

Könül xoşdur yada salıb gəzəndə,
Yadıma salmanda, eşqim qızanda,
Məni qəmdə qoymaz özü fərmanda,
Bağışlasan neylər yarım, ya Allah.

İxlas ilə yar məni der, mən yarı,
Tutuşdu ciyəri, getdi qərarı,
Ol orda ah çəkər, mən burda zarı,
Bağışlasan neylər yarım, ya Allah.

Vardı pünhan-pünhan şirin sözümüz,
Olan işə heyran qaldıq özümüz,
Bir-birə baxmaqdan doymaz gözümüz,
Bağışlasan neylər yarım, ya Allah.

Əlim sənə yetməz ərzim etməyə,
İşimin rəvacı yoxdur bitməyə,
Dilbər dərdi qoymaz məni yatmağa,
Bağışlasan neylər yarım, ya Allah.

Məxdumqulu, dünya köhnə cahandır,
Sevişməklik bu dəsturi-zamandır,
Suçum çox olsa həm, kərəmin kandır,
Bağışlasan neylər yarım, ya Allah.

## NARI DİLBƏRİN

Gözüm düşdü seyranımda, qardaşlar,
Kükrəyir damu tək narı dilbərin,
Qıyılmış kaman tək üzündə qaşlar
Görüb-görməyənlər zarı dilbərin.

Ol adəm oğlunun deyil balası,
Qulağı eşitməz aşiq naləsi,
Camalın bir görən heyran qalası,
Hey axır üzündən nuru dilbərin.

Şöləsində günəş təkdir camalı,
Hamıdan üstündür vəsfi-kamalı,
Münəqqəş sifətli zati-camalı -
Misalıdır cənnət-huri dilbərin.

Xoş məclislər qurub gözəl dost ilə,
Yar mənə mey verdi, getdim süst ilə,
Həmlə qıldı mənə yüz min qəsd ilə,
Çaldı məni ilan-marı dilbərin.

Yanında qıldılar söhbəti, sazı,
Çağırın, dinləyin şol dilnəvazı,
«Asi qulum!» deyib gələr avazı
Pərdə ilə bizə sarı dilbərin.

Ol dəm rüxsət verdi, girdim bağına,
Ordan da üz tutdum hicran dağına,
Yel dəyər, dağılar gül yanağına
Ol qara zülfünün tarı dilbərin.

İsrafil sur çalsa yalan cahana,
Can baxmaz yaxşıya, nə də yamana,
Bir saatda qopar axır zamana,
Əgər gələr olsa qəhri dilbərin.

Ürəyimdə yanan hicran közüdür,
Ərkimə qoymayan yarın suzudur,

Qardaşı, qardaşı – yalnız özüdür,
Heç yoxdur rəqibı, yarı dilbərin.

Hər kim onu sevsə, diridir, ölməz,
Cahana özündən qeyri heç gəlməz.
Yeməsi, içməsi, qərarı olmaz
Mənzili, məkanı, darı dilbərin.

Aşiqlər yaş tökər çeşmindən giryan,
Görüncə çərx vurar, dövr edər hər yan,
Məxdumqulu, canım yolunda qurban,
Diləsə canımı, veri dilbərin.

## GÖYDƏN ENMƏZ, YARANLAR

Könül pərvaz edib qalxdı yerindən,
Havalanmış, göydən enməz, yaranlar,
Bir xəyala düşmüş, çıxmaz sərindən,
Bu xəyaldan geri dönməz, yaranlar.

Nuş edibdir məhəbbətin qəndindən,
Öyüd almaz zahidlərin pəndindən,
Durdu məkanından, çıxdı bəndindən,
Dolanıb, yerunə qonmaz, yaranlar.

Eşq işini ağıl edən, huş edən,
Ayılarmı eşqə düşüb, coş edən,
Yar əlindən badə alıb nuş edən,
Badə-badə içər, qanmaz, yaranlar.

Bir xətt vardır ol Fatmanın saçında,
Oxudarlar məhşər xəlqin seçəndə,
Bir od vardır aşiqlərin içində,
Bu odlar tək, bəlli, yanmaz, yaranlar.

Məxdumqulu, eşq özündən bad eylər,
Eşq işidir, aşnaları yad eylər,
Tüstüsüz yandırar, yelsiz od eylər,
Bir zəbanə çəksə, sönməz, yaranlar.

**DÖNDÜ**

Üzü mahi-tabanım,
Gün kimi ayə döndü,
Çərx oldu nərdivanım,
Göy payə-payə döndü.

Bir gün aşiq şövq oldu,
Qəm-qüssəsi yox oldu,
Hər kirpiyin ox oldu,
Qaşların yayə döndü.

Aşığı saldın oda,
Qoydun getdin burada,
Günorta verdin vədə,
Vaxt keçdi, sayə döndü.

Can qalmadı bədəndə,
Yanaram ah edəndə,
Gözüm gəlib-gedəndə,
Hər günüm ayə döndü.

Min sevdam var, bir başım,
Qoydum elim, qardaşım,
Ağlamaqdan göz yaşım
Coşğun bir çayə döndü.

Yarın könlü çağ oldu,
Aşiqlər dustağ oldu,
Dalda yerim dağ oldu,
Düz yerim qaya döndü.

İstərəm gündə-gündə,
Ağlaram tündə-tündə,
Hər zülfünə bir bəndə,
Hu saya-saya döndü.

Dal-budaqlar əyildi,
Köçdü bülbül, dağıldı,

Axar sular soğuldu,
Çöl yerlər çayə döndü.

Dərman olmaz əlaca,
Zad verməzlər möhtaca,
Baylar döndü qəllaca,
Fəqirlər baya döndü.

Məxdumqulu, gəzəndə,
Hələb, Qeysər düzündə,
Gözəl yarın izində
Ömrümüz zayə döndü.

## GÜLƏ BƏNZƏR

Ey yaranlar, yaxşı yarın,
Qoynu cənnət, gülə bənzər,
Sözləsə, dürlər saçılar,
Dilləri bülbülə bənzər.

Eşq odu yandırdı bizi,
Sormasınlar məndən sözü,
Yarın gözəl qızıl üzü
Sanki aya-günə bənzər.

Nələr çəkdim dərdi-fəraq,
Yetər desəm, yolum iraq,
Qələm qaşlı, badam qabaq,
Saçları sünbülə bənzər.

Yanan yox dünyada bunca,
Didar görmək yox doyunca,
Dişləri dür, ağzı qönçə,
Beli incə qıla bənzər.

Gözü nərgiz, boyu şümşad,
Kirpikləri misli polad,
Pəri-peykər sərvi-azad,
Dəstə-dəstə gülə bənzər.

Köksündə var qoşa narı,
Ağ üzündə cürə xalı,
Ləblərindən axan balı,
Şəhd ilə şəkərə bənzər.

Məxdumqulu yollar yorub,
Tapammadı yarı sorub,
Döşəyini yola qurub,
Yol tapmayan kora bənzər.

## BAŞDAN, DOĞRUSU

Eşit, pərim, aşiq oldum,
Mən ilkin başdan, doğrusu.
Bir görməyə, mail oldum,
Göz ilən qaşdan, doğrusu.

Könlümün xoşgahı sənsən,
Külli aləm şahı sənsən,
Yeddi fələk mahı sənsən,
Sel rəvan yaşdan, doğrusu.

Üzün Züleyxanın görkü,
Fırlanar fələyin çərxi,
Bilinməz adamın fərqi,
Sin ilə daşdan, doğrusu.

Qız alınar kalım ilən,
Adam solar zülüm ilən,
Nəsib edər, ölüm ilən
Dinər təşvişdən, doğrusu.

Dillər yaxşı-yaman saçar,
Hər kişidən dövran keçər,
Namərd igid eybin açar,
Sızdırıb dişdən, doğrusu.

Gündüzlər gün, gecə məhtab,
Dərya ləbi oldur Lübab,
İçər olsa hər kəs şərab,
Qalarmış huşdan, doğrusu.

Qalmaqaldan bəla gələr,
Yaxşı-yaman varı bilər,
Biri ağlar, biri gülər,
Gün çıxar qaşdan, doğrusu.

Qaplan gurlar çay içində,
Qurd yeriyər lay içində,

Qərib olsa bay içində,
Ağarar saçdan, doğrusu.

Gər, Fəraqi, həmrah olsan,
Naçar qalan könül alsan,
Yaxşı ilə deyib-gülsən,
Ayırmaz huşdan, doğrusu.

## ÜZÜNDƏN

Ay kimi ruyini gördüm,
Nur saçılar, yar, üzündən.
Bir Məcnunam, dəli oldum,
Nəvayi-cində sazından.

Gəl, sən mənə dövran eylə,
Rəqib könlün viran eylə,
Mənim ilə seyran eylə,
Növbaharda dan üzündən.

Bu işrətli çağ içində,
Boz qoç kimi dağ içində,
Bir bülbülsən bağ içində,
Söz açmaram avazından.

Sən, Fəraqi, bil, qul oldun,
Qulluğunu yeni bildin,
Axırında payın aldın,
Nəsibənin qaş-gözündən.

## SİZƏ

Bağ içində bitən güllər,
Qutlu olsun yazlar sizə.
Şəhdi-şəkər, şirin dillər,
Qutlu olsun sözlər sizə.

Yar qaməti lam nişana,
Sünbülləri zərəfşana,
Görkəzmədin yar yaşına,
Ağlar baxar gözlər sizə[1].

[1] Bu şeir natamamdır.

## EŞQİN KİTABIN AÇALIM

Səhər vaxtı, gəlin, dostlar,
Eşqin kitabın açalım.
Hər hürufda neçə söz var,
Ona bir hesab kəsəlim.

Bu dünyada neçə dağ var,
Neçə bostan, neçə bağ var,
Neçə ölü, neçə sağ var,
Ona layiq don biçəlim.

Ulusunu bilməyəndən,
Pirə xidmət qılmayandan,
Sözdən məna almayandan,
Təndə can varkən qaçalım.

Aşiq Fəraq deyər ərzin,
Ruzə, namaz deyən fərzin,
Boynumuzda işbu kərzin,
Can sağkən verib keçəlim.

## GÖRDÜNMÜ?

Şəfəq salar gedər zülmət tünündə,
Mənim sahibcamalımnı gördünmü?
Bahar əyyamında, heyhat günündə,
Mənim sahibcamalımı gördünmü?

Ənqa sifət, «haq!» deyibən uçan quş,
Gecələr diridir, gündüzlər bihuş,
Ridalı, cindəli, əyni xirqə puş,
Mənim sahibcamalımı gördünmü?

Qan edibdir fələk bağrım fəraqda,
Əlmüdam gəzərəm, dilim soraqda,
Kəbə ətrafında, Şamda, İraqda
Mənim sahibcamalımı gördünmü?

Hərəmdə, qıpçaqda, Çində-Maçində,
Asmanın üstündə, ərşin içində,
İqlim çevrəsində, fələk bürcündə
Mənim sahibcamalımı gördünmü?

Aşiqlər ahında, Qülzüm dövründə,
Qübbətül-islamda, Ceyhun bəhrində,
Sidrə səhrasında, İsa şəhrində
Mənim sahibcamalımı gördünmü?

Həzrət Əli etcək aləmə davı,
Qafdan Qafa  düşdü həzrətin çavı,
Ya iqlim yiyəsi Əhməd Yəsəvi,
Mənim sahibcamalımı gördünmü?

Məskən tutmuş qara dağın burnunda,
Əlinin mülkündə, İsa yerində,
Yerin arxasında, göyün qarnında
Mənim sahibcamalımı gördünmü?

Məxdumqulu çəkər yarın qəmini,
Gəzıb tapa bilməz ruyi-zəmini,
Ya adı Cəbrayıl – haqqın əmini,
Mənim sahibcamalımı gördünmü?

## SATAŞDIM

Səhər vaxtı seyran edib gəzərkən,
Əcəb mənzil, əcəb caya sataşdım,
Uğrum bilməz, yoldan-yola azarkən
Xub məkana, xub saraya sataşdım.

Ustasız işlənən, kirişsiz qatılan,
Qiymətsiz satılan, əlsiz tutulan,
Əl dəyməz çəkilən, oxsuz atılan,
Çilləsiz qurulan yaya sataşdım.

Neçə dostlar ilən seyranda ikən,
Xətərdən sovuşdum, karvanda ikən,
Candan ümid üzüb, heyranda ikən,
Ulduzdan yol umdum, aya sataşdım.

Könlüm getdi dostlar içən şərbətdə,
Onlar yüz səfada, mən min həsrətdə,
Ayrılıb nalədə, qaldım qürbətdə,
Çeşmədən su içib, çaya sataşdım.

Nə təndə qüvvət var, nə içdə can var,
Bu işdə nə xeyir, nə də ziyan var,
Nə hesab, nə hasib, nə bəlli san var,
Kişi bilməz, nə sevdaya sataşdım.

Başa bağlar divanəlik kəməndin,
Səyridib yetişdim eşqə səməndim,
Al şəraba əl uzatdım, eymənđim,
Durusun içmişlər, laya sataşdım.

Məxdumqulu derlər mənim adımı,
Aləm əl qızdırar görsə odumu,
Ey yaranlar, kimə deyim dadımı,
Başım çıxmaz nə sevdaya sataşdım.

## HİNDİSTANDA XƏYALIM

Haqq uğrunda qurbandır,
Canım, dövlətim, malım.
Könül yola rəvandır,
Hindistanda xəyalım.

Ağlar gözüm yaş etdim,
Könül içrə nəxş etdim,
El-günümə bəxş etdim
Zəban içində balım.

Durdum adam sanında,
Qaramatın yanında,
Bir qardaşsız, fanidə
Necə olar əhvalım.

Ol peykəri harayım,
Bəxş qıldım sarayım,
Puş eylədim, gör, ruyim,
Götürüb mən dəsmalım.

Yürdüm cəbr köyündə,
Yandım eşqin öyündə,
Qaldı zəmin teyində
Daim verilən felim.

Canım atəşə saldım,
Nar içində mən qaldım,
Eşqdən yaralı oldum,
Loğman sorammaz halım.

El üzünə gülmüşəm,
Güldüyümü bilmişəm,
Yar önünə gəlmişəm,
Nədir mənim dəlilim.

Fani-cahan içində,
Peykan kaman içində,

Məcnun ümman içində
Qərq olmuş köhnə salım.

Bir pəriyə xiridar,
Bu canım ona nisar,
Dedim yara: «Ərzim var»
Unutmuşam sualım.

Mənli cana od salar,
Odu cismimdə qalar,
Məxdumqulu, utanar,
Mənim sahibcamalım.

## NEYLƏYİM, BİÇARƏYƏM

Neyləyim mən, bu fələyin zülmü bilən qalmışam,
Dəydi sərə, getdi huşum, neyləyim, biçarəyəm.
Badi-saba ərdi gəldi, urdu, canım, ölmüşəm,
Dəydi sərə, getdi huşum, neyləyim, biçarəyəm.

Mənli xanım alıb getdi cismim içrə canımı,
Sormadan iqbalı fələk yapdı hicran donumu,
Bir nakəsə bəxş eyləmiş fələk Mənli xanımı,
Dəydi sərə, getdi huşum, neyləyim, biçarəyəm.

Dana olmaz kəsər huşum başdaşımdan ayrılıb,
Ağlım çaşdı-sərim boşdur, gör, huşumdan ayrılıb,
Yalnız qalıb, qan ağlaram, qardaşımdan ayrılıb,
Dəydi sərə, getdi huşum, neyləyim, biçarəyəm.

Nəsimini dabanından soydular da, qoydular,
Məni aləm rüsva qılıb, iki gözüm oydular,
Eldə-gündə yoxdur üzüm, pünhanımı aydılar,
Dəydi sərə, getdi huşum, neyləyim, biçarəyəm.

Məxdumqulu, yeddi iqlim zar ilə qan ağlayıb,
Özün qafil eyləyibsən daim pünhan ağlayıb,
Tərk eylədi mali-mülkün gəlib hicran ağlayıb,
Dəydi sərə, getdi huşum, neyləyim, biçarəyəm.

## BİÇARƏYƏM

Vətənimdə xan idim,
Xanlara fərman idim,
Dərdlərə dərman idim,
Miskinə dükan idim,
Cansıza mən can idim,
Neylək, indi biçarəyəm.

Gözsüzlərin gözü idim,
Lalların mən sözü idim,
El-günümün üzü idim;
Sevən məşuq nazı idim,
Hatəm Tayın özü idim,
Neylək, indi füqərayam.

İrəm içrə reyhan idim,
Vətəndə zərəfşan idim,
Mərd igidə köhlən idim,
Dağ başında duman idim,
Fəraqi der, aman idim,
İndi viran bir sarayam.

## BƏXTİM QARADIR

Bu nə bəla, bu nə həsrət, nə qovğa.
Rəhm edən olmadı, bəxtim qaradır.
Nalə etsəm, ərzim yetməz xudaya,
Rəhm edən olmadı, bəxtim qaradır.

Fələk dost olubdur alagöz ilə,
Dərdimi dinləməz, desəm söz ilə,
Elimi uğratdı dağla, düz ilə,
Rəhm edən olmadı, bəxtim qaradır.

Koroğlu tək qeyrətimdən ayrıldım,
Qocalmışam, qüvvətimdən ayrıldım,
İki didəm – züryətimdən ayrıldım,
Rəhm edən olmadı, bəxtim qaradır.

Şamü səhər yata bilməm farağat,
Ürəyim çırpınar, könül bitaqət,
Kəbəm, qibləm, qardaş oldular vəfat,
Rəhm edən olmadı bəxtim qaradır.

Fələyə düşən ov qaçıb qurtulmaz,
Adəm oğlu çəkən oxu atılmaz,
Tənha ərin ömür adı tutulmaz,
Rəhm edən olmadı, bəxtim qaradır.

Tayım-tuşum hər bir kara bulaşdı,
Dostlar iraq düşdü, hicran dolaşdı,
İxlasım, muradım qəmə ulaşdı,
Rəhm edən olmadı, bəxtim qaradır.

Başıma şum fələk hər gün sürünər,
Yalnız qalan göydə kimə güvənər,
Yamanlar gözümə əziz görünər,
Rəhm edən olmadı, bəxtim qaradır.

Sarvanım yol azdı, dağıldı malım,
İqbalım gec durdu, getdi xəyalım,

Altmışa əzm etdi çoxalan salım,
Rəhm edən olmadı, bəxtim qaradır.

Bu dünya çoxuna bibəyan oldu,
Qərib əlin açdı, quru san oldu,
Namərdlər mərd oldu, elə xan oldu,
Rəhm edən olmadı, bəxtim qaradır.

Ah, neylək, tez ötdü igidlik çağım,
Ağacım qurudu, boş qaldı bağım,
Dumanı sovuldu, əridi dağım,
Rəhm edən olmadı, bəxtim qaradır.

Məxdumqulu, yox huşum, yox qərarım,
Boş qaldı dükanım, dağıldı varım,
Ayaqlara düşdü namusum-arım,
Rəhm edən olmadı, bəxtim qaradır.

## ƏCƏB ƏYYAM GƏLMƏDİ

Nadan mənəm, düşdüm fələk toruna,
Çox gözlədim, əcəb əyyam gəlmədi.
Dözəmmirəm indi hicran zoruna,
Çox gözlədim, əcəb əyyam gəlmədi.

Qırxa qədəm qoydum, badəm dolmuşdır,
Ondan əfğan çəkib, könlüm qalmışdır,
Niyyət mənə yaman həmrah olmuşdır,
Çox gözlədim, əcəb əyyam gəlmədi.

Gəldi qara bəla, eli doladı,
Dəhan açıb, dili ilə yaladı,
Bir it imiş, kimi gördü daladı,
Çox gözlədim, əcəb əyyam gəlmədi.

Qəribdə bəxt yoxdur, mərəkə görməz,
Haq sevsə də, iqbalına mal verməz,
At minib çapsa da, cidarlı, getməz,
Çox gözlədim, əcəb əyyam gəlmədi.

Niyyəti yamandır, xəsis mal yığar,
Yeyə bilməz, hər dəm iştahın boğar,
Malı haram olar, başından yağar,
Çox gözlədim, əcəb əyyam gəlmədi.

Haqq sözümə deyər mollalar qələt,
Yalan sözə verər oldular xələt,
And içdilər, əritdilər, bax, polad,
Çox gözlədim, əcəb əyyam gəlmədi.

Məxdumqulu, dili odlu, od saçar,
Üz görməz, nakəsin eybini açar,
Allah qanad versə, Hindistan uçar,
Çox gözlədim, əcəb əyyam gəlmədi.

## ÖTGİL, FƏRAQİ

Əlinə yığıbsan dünya zinətin,
Elinə bəxş edib ötgil, Fəraqi.
Pünhan qılma yaxşı-yaman, sərvətin,
Elinə bəxş edib ötgil, Fəraqi.

Qeyri el zar olub ətrafdan baxsın,
Ceyhun bəhri coşub, Gürgənə axsın,
Sənin gözəl elin qəflətdən çıxsın,
Elinə bəxş edib ötgil, Fəraqi.

Neylərsən, çox namərd xəta eylədi,
Mürüvvət qıldılar, səda eylədi,
Cəm olub, ərənlər fatə eylədi,
Elinə bəxş edib ötgil, Fəraqi.

Ümidvar olma sən xəsis malına,
Vabəstə eyləgil mərdin yoluna,
Cəza vermə, tutmaz, namərd qoluna,
Elinə bəxş edib ötgil, Fəraqi.

Əşk töküb didədən, qılmagilərman,
Tərk edib vətəni olmagil rəvan,
Mey içib, bəzm edib, qıl canın qurban,
Elinə bəxş edib ötgil, Fəraqi.

De varın, olarsan göftari-süxən,
Lütf eylə elinə, qılmagil pünhan,
Dediyin dür olsun, əcəb cavidan,
Elinə bəxş edib ötgil, Fəraqi.

Sübhü şam könlünü eyləgil xəndan,
Türki, bulğar, parsı olsunlar heyran,
Gül bitirən hər dəm sərvi-xuraman,
Elinə bəxş edib ötgil, Fəraqi.

Ədna olma bir iş gəlsə başına,
Əncümən eyləgil eli dışına,

Dilxah istə, firdövs gələr qaşına,
Elinə bəxş edib ötgil, Fəraqi.

Dilin olsun daim izhari-göftar,
Sərəfrazsan, olmaz sərində azar,
Vəz-züha eyləyib, vurarsan bazar,
Elinə bəxş edib ötgil, Fəraqi.

Mərhəba, alnında «zəyyən əs-səma»,
Firavan elinə kövsəri-aba,
Gözəl dastan vergil elə mərhaba,
Elinə bəxş edib ötgil, Fəraqi.

Alimsənsə miskinləri unutma,
Əfzəl deyib, namərdlərə baş qatma,
Ərk istəyib, əcəb dastanın satma,
Elinə bəxş edib ötgil, Fəraqi.

Elə yağma gəlsə, çıx sən döyüşə,
Koroğlu tək qoru yurdu həmişə,
Bundan qeyri füzun qılma bir işə,
Elinə bəxş edib ötgil, Fəraqi.

Elini eyləgil cahan sərfəraz,
Qolunda olsun qoy daim bəhri-baz,
Qıldığın çox işlər hamısı bəyaz,
Elinə bəxş edib ötgil, Fəraqi.

Bostanın bitirən İrəm nihalı,
Mahi-taban ruyi cənnət misalı,
Siyah zülf «vəl-leyli» qaşı hilalı,
Elinə bəxş edib ötgil, Fəraqi.

Məxdumqulu, indi qoca qalıbsan,
Yaxşılara hər dəm həmra olubsan,
Zəbərdəst ərlərdən fatə alıbsan,
Elinə bəxş edib ötgil, Fəraqi.

## QILDI

Ey, a dostlar, fələk cəbri
Başımı mübtəla qıldı.
Ayırdı əziz balamdan,
Ürəyimi yara qıldı.

Ötdü xoşbəxt-xürrəm vəxtim,
Pozuldu qızıldan təxtim,
Yeni bitən bir dərəxtim
Xəzan badı fəna qıldı.

Şum əcələ olmaz çara,
Cəbrindən gəlmişəm zara,
Ürəyimə saldı yara,
Qərib cismim əda qıldı.

İndi bir dəm qərarım yox,
Bu mənzildə durarım yox,
Bu sözdən heç xəbərim yox,
Xəbərsiz binəva qıldı.

Yanıb pərvanə tək hər dəm,
Ürəyimə dolur yüz qəm,
Qəddim xəm, gözlərim pürnəm,
Bu canıma cəfa qıldı.

Qəmindən odlanıb suzan,
Çəkərəm naleyü əfğan,
Fərağında gözüm giryan,
Mən neyləyim, gəda qıldı.

Məxdumqulu çəkər fəryad,
Mənim əhvalıma heyhat!
Fələyin əlindən min dad,
Mənim bəxtim qara qıldı.

## GƏLDİ

Bayram gəlin, Xanmənli qız, Canəsən,
Bu dərdlərin[2] bəs hansına yanasan,
Çərxi-fələk, hər gün çəpə dönəsən,
Qəlbimın dünyasi virana gəldi.

Üçünün iqbalın batırdın laya,
Ömrümü qəm ilən ötürdün zaya,
Şamü səhər mən əl açdım xudaya,
Asman ahım görüb, giryana gəldi.

Məxdumqulu, əlif belim buruldu,
Damarım dartıldı, qanım duruldu,
Ölüm zərbi üç tərəfdən vuruldu,
Ağılım dağılıb, heyrana gəldi.

[2] Rəvayətə görə, Məxdumqulunun bacısı Xanmənli, kiçik qardaşı Canəsən və onun arvadı Bayram üçü eyni gündə vəfat etmiş və 21 yaşlı şair bu qoşmanı yazmışdır. Qoşmanın ilk bəndi yoxdur.

# İLƏN

Ömrüm ey, gül ömrüm ey,
Solubdur fəğan ilən.
Düşüb atəş üstünə,
Yanıbdır tən can ilən.

Ömrüm, ey qara gözüm,
Kimə dərkardır sözüm,
Göylən içrə bir özüm,
Qalmışam ərman ilən.

Ömrüm, gülşən baharım,
Düşməz əcəb nəzərim,
Məxdumqulu, azarım
Getdi tənü can ilən.

## OLDU

Könül verdim bir bivəfa məhbuba,
Çıxdı eldən, dağı cana dərd oldu.
Aşiq der: «Baxmanam indi ol xuba»,
Yol üstündə düşdü, gözüm dörd oldu.

Mənlik ilən etdim işimi zaya,
İqbal eşşəyini batırdım laya,
Ya bir mərdə söykən, ya da xudaya,
Bəndə işi baş tutmadı, ard oldu.

Şikarım tur olub qaçdı səyyaddan,
Gövdə qəmdən doldu, ürək də oddan,
Qorxuram, yar bizi çıxara yaddan,
Ayrı yerdə məskən tutdu, yurd oldu.

Sonam əl vermədi, saldım bazımı,
Laçın qovdu, qarğa aldı qazımı,
Bunca fağırlığa vurdum özümü,
Tülkülənib gəzdim, adım qurd oldu.

Məxdumqulu, ürəyimdə dərd törər,
Kim görübdür, köy itindən qurd törər,
Ey yaranlar, mərd igiddən mərd törər,
Haçan durdu namərd oğlu mərd oldu.

## ÇİLİMKEŞ

Haq səni rayinə qoymuş cahanda,
Nə bacarsan elə bunda, çilimkeş.
Divan qurulanda, hesab verəndə,
Cavabın nə olar onda, çilimkeş.

Qüvvətin azaldar, gücün üzdürər,
Keyfin kəllə gəlsə, ağlın azdırar,
Sümüyün sızdırar, ətin qızdırar,
Bir nişana budur səndə, çilimkeş.

Əl götür sən böylə nahaq təlaşdan,
Pulun yanar, canın yanar bu işdən,
Ertə qarnın doldurarlar atəşdən,
Zəhmi çıxmaz, qalar canda çilimkeş.

Orda-burda yaxşılıq yox əyriyə,
Kişi olsan, qədəm qoysan doğruya,
Binamaza, qeybətkeşə, oğruya
Yoldaş olar yavuz gündə çilimkeş.

Məxdumqulu, mövlam candan yaxındır,
Çilim bir şor sudur, tən bir zəmindir,
İman bir tülküdür, gövdə bir hindir,
Tüstüyə dözərmi hində, çilimkeş.

## BU DÜNYA

Məşriqdən məğribə dünyanın üzü,
Demə, bizə məlum deyil bu dünya,
Abadı, xarabı, dəryası-düzü,
Yüz qırx altı min ağac yoldur bu dünya.

Bu cahan üzündə işlər peydadır,
Təfərrücdür, tamaşadır, gövdədir,
Qırx altı min ağac sudur, dəryadır,
Yetmiş iki dürlü dildir bu dünya.

Bir əlli min ağac yollar anda var,
Dev-pəri məskəni, qullar anda var,
Daşlar, dağlar, ac arslanlar anda var,
Ol yerdə adamdan çöldür bu dünya.

On iki min ağac cayi-Hindistan,
Altı min ağac yol ərzi-Rumistan,
Dörd min Səklab, Səncab, dörd min Zəngistan,
Sanki keçib varan seldir bu dünya.

Dörd min fərsəx Yəmən, bir min də Bulğar,
Zəmini-yunan həm olar yek həzar,
Min ağac yol dağdır devi-mərdumxor,
Onda keçib varan saldır bu dünya.

Min ağac kilim güş, yek dəsti-yek pa,
Beş min ağac yəcuc, min ağac səhra,
Yeddi min ağac yer cəzirə, dərya,
Min ağac yer yatan maldır bu dünya.

Üç min üç yüz ağac əhli-islamdır,
İraq, Xəzirbaycan, Misirdir, Şamdır,
Xorasan, Fars, Bəzirkuhda tamamdır,
Yox olunca, qalmaqaldır bu dünya.

Məxdumqulu, adın döndü Fərağa,
Fəraq olub, çək özünü qırağa,
Hesab etdim dünya başdan-ayağa,
Üç yüz altmış illik yoldur bu dünya.

## ZAMANIDIR

Deyin arsız-namussuza:
Bu gün onun zamanıdır.
Yığsın Qarun kimi mallar,
Xəzinə boş − dövranıdır.

Ah, neyləyim, bəxtim qara,
Qəlbim, bağrım para-para,
Ərzim deyin sevən yara,
Bu dərdimin dərmanıdır.

Çaşdı qızıqlı bazarım,
Artdı gün-gündən azarım,
Kəsməz oldu şol nəzərim,
Alnında dağ dumanıdır.

Yalnız fərzənd ruyin görüb,
Gəlmişəm Xivədən yürüb,
Çöl içindən köhlən sürüb
Gəldim, haqqın fərmanıdır.

Məxdumqulu, dərdin əyan,
Var-yoxunu qıldın bəyan,
Dilini yığ, vardır ziyan,
Ağıl onun heyranıdır.

## İNİLDƏR

Ey yaranlar, müsəlmanlar,
Ürəyimdə dərd inildər,
Bir bay oğlunun əlində,
Şətrənc ilə nərd inildər.

Gəlib-getmə bundan namərd,
Ağlın çaşar, olarsan mat,
Bülənd dağda yaxarlar ot,
Quru yanar, sərt inildər,

Qız gördüm türkmən köçündə,
Müşkü ənbər var saçında,
Yaylada, ilxı içində,
Qulan, dayça, at inildər.

Məxdumqulu, sözüm haqdır,
Haq sözə can verən yoxdur,
Qoç igiddə oğul yoxdur —
Ocaq itər, yurd inildər.

## VARMI?

Ey yaranlar, müsəlmanlar,
Ağlamayan, gülən varmı?
Yalançı, fani dünyadan,
Gedib geri gələn varmı?

Fələk, kimləri şad etdin,
Kimi qəmdən azad etdin,
Bir neçələri mat etdin,
Səndən razı olan varmı?

Kimi vəfa toxmun əkər,
Kimi əcəl zəxmin çəkər,
Kimi qəmdən azad edər,
Saralmayan, solan varmı?

Bildim bu dünya çağlığın,
Qəm-qəflətdə oyaqlığın,
Xəstə olmadan sağlığın
Qiymətini bilən varmı?

Bu dünya iki qıraqdır,
Biri qara, biri ağdır,
Mənzil iki, yol iraqdır,
Onun fikrin qılan varmı?

Məxdumqulu, gələn keçər,
Bu güzara qonan köçər,
İgidlik çırağı sönər,
Bu sözümdə yalan varmı?

## OLMASIN

Ey yaranlar – müsəlmanlar,
Dəli könül coş olmasın.
Yenə bir yaxşı igidə,
Yaman xatın tuş olmasın.

Hər kim alsa haqdan rəhmət,
Gedər qayğı, qalmaz möhnət,
Abad olmaz, durmaz dövlət,
Heç ölkə bibaş olmasın.

Hər kişinin öz züryəti –
Can xoşu, könül qüvvəti,
Artsın cömərdin dövləti,
Muxənnəsdə aş olmasın.

Bir eşq düşsə ər sərinə,
Kökü gedər çox dərinə,
İki sevən bir-birinə
Yaxın olsun, dış olmasın.

El içində özün öyər,
Dil dumanı başdan aşar,
Yağıda nöqsanı dəyər,
Namərdlər yoldaş olmasın.

Sözlə, hey, aşığım, sözlə,
Gəl, qiyamət işin gözlə,
Məxdumqulu, sirrin gizlə,
Hər namərdə faş olmasın.

## GÜLÜŞ İLƏ

Mehman gələr uzaq yerdən,
Qarşılasan gülüş ilə,
Mərd igidlər keçər sərdən,
Al meydanda döyüş ilə.

Yüyrük yetməz uzağına,
Düşdüm fələk duzağına,
Mənli qızın üzüyünə
Qaşlar qoysam gümüş ilə.

Qız-gəlinlər uz yürüyüb,
Göz gedər bağrın əriyib,
Göldə quba qaz yeriyib,
Su səslənər qamış ilə.

Məxdumqulu, yarıtmadın,
Göz yaşını qurutmadın,
Fərzənd altın arıtmadın,
Keçdi günün söyüş ilə.

## İSTƏR

Boş qalıbdır qafil gövdə,
Mərdanə bir sağ can istər;
Ürək-bağrım qılıb para,
Asudeyi-zaman istər.

Leylisindən qaldı Məcnun,
Gözdən töküb ol qanlı xun,
Dağda çəkib cəbri-xütun,
Gülər üzlü taban istər.

Fərhaddır istər Şirini,
Çəkəndir eşqin cəbrini,
Həvalə verib sərini,
Dəm gəlincə dövran istər.

Vamiq Əzranın eşqində,
Dinclik tapmadı köşkündə,
Yaş yerinə qan əşkində,
Sel olubdur, meydan istər.

Züleyxa görüb Yusifı,
Artdı eşqi, yox hesabı,
Üzdən atıbdır niqabı,
Siyah zülfü xəndan istər.

Fəraqi, sözlər dərdini,
Tülkülər atmış qurdunu,
Sevərək türkmən yurdunu,
Yiyə olan bir xan istər.

## NARI OLMASA

Bağban bu bağı neyləsin,
Bağında narı olmasa,
Atadan oğul olmasın,
Namusu-arı olmasa.

Bülbülə orman bağ olmaz,
Geyikə təpə dağ olmaz,
Bədəv yabıdan yey olmaz,
Məgər rəftarı olmasa.

Şərbət içsən, bala dönər,
Hər bir günü ilə dönər,
Gül tək rəngi külə dönər,
Gözəlin yarı olmasa.

Məxdumqulu, nihan derlər,
Can sevənə canan derlər,
Ol igidə heyvan derlər,
Şirin göftarı olmasa.

## ƏYLƏNMƏZ

Ey yaranlar, müsəlmanlar,
Amanatdır, can əylənməz.
Sağlığa yoxdur ixtiyar,
Tut misal, mehman əylənməz.

Kimi səhər durar erdən,
Kimi baş götürməz yerdən,
Şeyda dilli gözəllərdən
Dil gedər zəban əylənməz.

Bülənd dağdan heybət gedər,
Yerlərdən bərəkət gedər,
Rum şəhrindən qüvvət gedər,
Ustada dükan əylənməz.

Əzrayıl yol açar bir gün,
Can şərbətdən içər bir gün,
Ərdən dövran keçər bir gün,
At ölər, meydan əylənməz.

Şəriətdən iraq olma,
Haqq işinə uzaq  olma,
Adəm oğlu, qafil olma,
Köç gedər, karvan əylənməz.

Binamaz, uğrarsan qəmə,
Onda dadın yetər kimə,
Burda zor versən çilimə,
Cəsəddə iman əylənməz.

Məxdumqulu, budur iqrar,
Haqq yolunda duran düz ər,
Kimin izində oğul var,
Kimidə nişan əylənməz.

## HANI?

Ey yaranlar, müsəlmanlar,
Bizdən əvvəl qardaş hanı?
İki dünyanın sərvəri
Məhəmməd Mustafa hanı?

Əvvəl zindana atılan,
Sonra qul kimi satılan,
Misirdə padişah olan
Ol Yusif peyğəmbər hanı?

Bizim ilə həmdəm olan,
İslam üçün qılınc vuran,
Kərbəlada şəhid olan
Ol Həsən, Hüseyn hanı?

Məkkədə yüz il oynayan,
Cənnətdə gözü qaynayan,
İslam üçün can paylayan
Ol Həmzə pəhlivan hanı?

İki gözləri kor olan,
Yusifindən ayrı qalan,
Qurdlar ilə dava qılan
Ol Yaqub peyğəmbər hanı?

Məxdumqulu çəkər ərman,
Haqdan gəlsə, bizə fərman,
Əcəl gəlsə, yoxdur dərman
Dörd min dörd yüz yaşan hanı?

## GETDİ

Bu dünya hiyləgərdir,
Hiyləsin çaldı getdi.
Gümrah etdi neçəni,
Yoldaş tək aldı getdi.

Aqil, fikir et haçan,
Yüz qonan var, yüz köçən,
Taxtı asmandan uçan
Süleyman öldi getdi.

Ya mürüvvətli şahım,
Ümidim, qibləgahım,
Bunca yığdı İbrahim
Neçə nan aldı getdi.

Ciyərin dağlar-dağlar,
Zünnarın bağlar-bağlar,
Neçələr ağlar-ağlar,
Neçələr güldü getdi.

Neçələr gülə dönmüş,
Gül yanmış, külə dönmüş,
Neçələr quma dönmüş,
Neçələr soldu getdi.

Qalarsan gorda bağlı,
Bəlli bir yurda bağlı,
Bihudə, adəm oğlu,
Yığarsan, qaldı getdi.

Axmaqlıq ilən özüm,
Bilməz, sözlərəm sözüm,
Məxdumqulu der, gözüm
Qan-yaşa doldu getdi.

## AĞLARAM

Ey yaranlar, puç ömrüm
Keçdi deyib ağlaram.
Getdi ağlım yerindən,
Çaşdı deyib ağlaram.

Gedən dönməz yolundan,
Düşməz yaman felindən,
Dəyanət xalq əlindən
Uçdu deyib ağların.

Hazır bizim zamanda,
Yaman sözlər zəbanda,
Zülüm işlər cahanda
Coşdu deyib ağlaram.

Bu əyyamda bədkarlar,
Yüz dillə aldadarlar,
Hanı neçə dildarlar,
Keçdi deyib ağlaram.

Neçə-neçə tay-tuşlar
Şeytan biliyin başlar,
Üz çevirib qardaşlar,
Qaçdı deyib ağlaram.

Görün fələyin oynun,
Üzər alimin boynun,
Neçə canlar yer qoynun
Qucdu deyib ağlaram.

Məxdumqulu der mərdə,
Dünya bənddir, tən pərdə,
Bir başım sansız dərdə
Düşdü deyib ağlaram.

## OLMAZ

Xərin işi xərdir, dostlar,
Min dənəsi atcan olmaz.
Bədəsilə əməl yetsə,
Bilin, əsilzadcan olmaz.

Fani dünyaya inanma,
Altın-gümüşə güvənmə,
Ögeylərə könül vermə –
Bir qardaş züryətcən olmaz.

Çox yolları görsə gözün,
Hər mənanı bilsən özün,
Bir nadana deyən sözün
Əsib gedən yelcən olmaz.

Başın yastığa yetəndə,
Səbrü qərar olmaz səndə,
Gücün-qüvvətin gedəndə,
Oğul-qızın yadcan olmaz.

Məxdumqulu əcəb çağlar,
Kimi gülər, kimi ağlar,
Dürlü meyvə verən bağlar
Sovular, cənnətcən olmaz.

## BİR İŞƏ ULAŞDI

Tayım-tuşum, qoç igidlər,
Hər kəs bir işə ulaşdı.
Haq hər kəsə bir yol verdi,
Hər kəs bir borca dalaşdı.

Kimi girdi haq yoluna,
Yaxşılıq düşdü felinə,
Kim qılınc aldı əlinə,
Çaldı, islam dinin açdı.

Nər-bədəvli bəylər, xanlar,
Atlansa, dolar meydanlar,
Sökdü zireh, tökdü qanlar,
Qoçaqlar sərindən keçdi.

Biz istədik, ulu yaran,
Nəsib bizi etdi heyran,
Kimi getdi İran, Turan,
Kim İsfahan, Təvriz aşdı.

Haqqa əyan oldu halım,
Xəlqdə bilən olmaz məlum,
Məxdumqulu, mənim yolum
Ol dostlardan ayrı düşdü.

## YARANLAR

Eşq yolun həvəs edib,
Gələn varmı, yaranlar?
Dərdimi bəyan etsəm,
Bilən varmı yaranlar?

Olmuşam məsti-şeyda,
Həzar peşə, səd sevda,
Aləmdə mən tək rüsva
Olan varmı, yaranlar?

Dışım dərd, içim büryan,
Edərəm nalə, giryan,
Mənim tək məsti-heyran
Qalan varmı, yaranlar?

Eşq tuş olsa bir mərdə,
Toz olar, dönər gərdə,
Mənim tək özün dərdə
Salan varmı, yaranlar?

Vardı halım ölümə,
Tab etməyən zülümə,
Ağlamayın halıma,
Gülən varmı, yaranlar?

Məxdumqulu can çəksə,
Rəhm etməzlər, yaş töksə,
Eşqin yolunda yoxsa
Talan varmı, yaranlar?

## YERDƏ

Nə işi var ariflərin
İzzət görülməyən yerdə,
Ağlı olan söz açarmı
Növbət verilməyən yerdə.

Ağlı yaxşılar unutmaz,
Quru kolda yarpaq bitməz,
Ağıllı ər məskən tutmaz,
Xülqü sevilməyən yerdə.

Həccə getsən, cara dönər,
Gül açılsa, xara dönər,
Xidmət edən xərə dönər,
Qədri bilinməyən yerdə.

Batil qalan sular axmaz,
Hər naşıdan kərəm çıxmaz,
İt gözləməz, pişik baxmaz,
Süfrə sərilməyən yerdə.

Ev içində xərə dönər,
Müxənnət bir nərə dönər,
Tülkü, şaqqal şirə dönər,
Savaş qurulmayan yerdə.

Fərasət qıl, baxıb ağla,
Qoç igidin sözün haqla,
Məxdumqulu, dilin saxla,
Xəbər sorulmayan yerdə.

## MƏRD OLMAZ

Mərd igid mərd ərdən törər,
Namərddən əsla mərd olmaz,
Qurdun gözündə od yanar,
Çaqqal-tülkülər qurd olmaz.

Söyləginən bilən dildən,
Bülbül ayrı düşsə güldən,
Eşit, adam, qardaş eldən
Qeyri mehriban yurd olmaz.

Bu aləm əcaib olsa,
Dünya üzü nurla dolsa,
Ulu tanrı rəhm qılsa
Təndə, canda bir dərd olmaz.

Məxdumqulu, ağlın-huşun,
Axdı gözdən qanlı yaşın,
Daşa dəydi qəmli başın,
Bundan betər fəryad olmaz.

## QALMAZLAR

Qəm çəkmə, qərib adam,
Bəylər-şahlar qalmazlar.
Böyük-böyük şəhərlər,
Ağ otaqlar qalmazlar.

Qalsa sözdən qızıl dil,
Can cövhərdir, tən bir gil,
Həzar muğamlı bülbül,
Böyük dağlar qalmazlar.

Bunu kəsibdir ağlım,
Yıxılar yeddi iqlim,
Yer olar büklüm-büklüm,
Ərir, dağlar qalmazlar.

Haqdan yetişsə fərman,
Nə çarə var, nə dərman,
Asiman, gün, ay lərzan,
Həm ulduzlar qalmazlar.

Nə yer qalar, nə yurdlar,
Nə türk qalar, nə kürdlər,
Nə quş qalar, nə qurdlar,
Pərrəndələr qalmazlar.

Nə gərd qalar, nə gərdan,
Nə mərd qalar, nə mərdan,
Fil, zürafə, kərgədan,
Dərrəndələr qalmazlar.

Məxdumqulu, yaş sürən,
Ağır həngamlar quran,
Dalğa-dalğa mövc uran,
Ol dəryalar qalmazlar.

## MUĞAM QAŞINDA

Dəhanımdan nar saçılar,
Əfğandır muğam qaşında.
Sözlərəm, sirrim açılar,
Əyandır muğam qaşında.

Əyyam nə halətlər qıldı,
Onca cana səbəb oldu,
Yaxşı ötdü, yaman qaldı,
Dövrandır muğam qaşında.

Nə azarlı qəhbə dünya,
Hansı yerdə qoydu bina?
Həzrəti Süleyman guya
Qılmandır muğam qaşında.

Xan qalmadı xan yerində,
Tən durmayır can yerində,
İsadır Loğman yerində,
Dərmandır muğam qaşında.

Qoca dağlar, qaldır başın,
Tökmə gözdən qanlı yaşın,
Mən olum həmrah-qardaşın,
Peymandır muğam qaşında.

Rüstəmi-Zal gələn zaman,
Verdin ona yüyrək köhlən,
İqbalın son qıldın yaman,
Fəğandır muğam qaşında.

Ulu Marı Şahi-Cahan
Viran oldu, çəkir fəğan,
Məxdumqulu, açsa dəhan,
Zəbandır muğam qaşında.

## EYLƏDİ

Qərib könlümün binasın,
Gör, fələk viran eylədi.
Aldırıb əldən namusun,
Qəlbimdə ərman eylədi.

Haqdan bizə dövlət gəlməz,
Ağlar gözüm deyib-gülməz,
Miskinlər yurd qədri bilməz,
Ürəkdə hicran eylədi.

Mərd igid olsun qardaşın,
Olmasa, heç qalmaz başın,
Ayıb tapıb qəlb sirdaşın
Ellərə əyan eylədi.

Adı gərəkdir mərdlərin,
Niyə adı yox qurdların,
Bağça-saraylı yurdların
Yerini meydan eylədi.

Məxdumqulu, ağlın çaşdı,
Adın neçə ellər aşdı,
Maral keçdi, ceyran qaçdı,
Pələnglər seyran eylədi.

## OLMASA

Adəm oğlu quru torpaq,
Tən içrə canı olmasa,
Qara dağdan qiymət qaçar,
Seli, dumanı olmasa.

Haqqın lütfü, quşlar uçar,
Kimi araq, şərab içər,
İqbal qalmaz, dövlət köçər,
Elin əzanı olmasa.

Ər igiddə olsa qeyrət,
Başın əyər, olar qüdrət,
Badam qabaq, gözəl surət
Pisdir, kamanı olmasa.

Hər bir igid evdə xandır,
Namərd bacarmaz, zənandır,
Pirlər, sofular nadandır,
Əldə Quranı olmasa.

Uzaqdır biz gedən yollar,
Əcəb dastan yazan qollar,
Qiymət olmaz üzdə xallar,
Yanan Məcnunu olmasa.

Məxdumqulu, arxa yaşar,
Məcnundur, Nəcd dağı aşar,
Ulu el dağılar, çaşar,
Mərd ərdən xanı olmasa.

## GEDƏR

Könlüm, ağır tut özünü,
Fani dünya ötər gedər.
Hər kim qədəmin düz qoysa,
Güzərdən bixətər gedər.

Bilsən, xoş göftar açginən,
Bilməsən, əm-səm keçginən,
Söz yarasından qaçginən,
Tiğ yarası bitər gedər.

Əsli yada çəkmə cəfa,
Bədəsildən yoxdur vəfa,
Bir adam olsa nasəfa
Abırını tökər gedər.

Yoldaş olsan kişi ilə,
Qulluq eylər başı ilə,
İşə girsən naşı ilə
Dağa-daşa atar gedər.

Məxdumqulu, getsən bundan,
Xeyir-şər sorarlar səndən,
Şirin can ayrılsa təndən,
Qum-toprağa batar gedər.

## OLDUN

Fələk, fələk, zalım fələk,
Gözdə nurum alar oldun,
Onca canlar edib həlak,
Zindanına salar oldun.

Fələk, fələk, qıya baxıb,
Can alarsan xəncər soxub,
Onca canı oda yaxıb,
Amma özün qalar oldun.

Fələk, sənin namərd qurdun
Viran etdi gözəl yurdum,
Artırıb başımda dərdim,
Qəzəb edib, alar oldun.

Məxdumqulu, yesir quşun,
Zindandan qaldırmaz başın,
Fələk vurubdur qardaşın,
Qəhər edib gələr oldun.

## MƏRD İLƏNİ

Əsil ərdə qalmaz ərman,
Döyüş qılsa mərd iləni.
Hicran bəxtim qıldı viran,
Elim ilən, yurd iləni.

Fələk təzə güllər yolar,
Bülbülün səbrini alar,
Qaya düşüb orda qalar,
Axmasa sel sərt iləni.

Əcəl əlindən qurtarmaz,
Həmrah deyib, ər götürməz,
Pələngə ziyan gətirməz,
Yüz min çaqqal, qurd iləni.

Fələk başım qıldı bəndi,
Yumruldu iqbalım bəndi,
Eşqim söndü, bəxtim sındı,
Məxdumqulu, dərd iləni.

## QALMADI

Zalim fələyin əlindən,
Aşiqlərdə ad qalmadı,
Qara zəminin felindən
Uzaq ömür, zat qalmadı.

Fələk saldı bu təşvişi,
Afətdir hər tutan işi,
Dağıldı ərlər gənəşi,
Ulu cəmaət qalmadı.

Fələk nə gün başa saldı,
Ürək yağım, nurum aldı,
Elat əhli alim oldu,
Bizə nəsihət qalmadı.

Fələk, eyləmə bəhanə,
Zülm eylədin gəda, xana,
Açıq könül yox mehmana,
Pirlərə hörmət qalmadı.

Dağımda bənd qaldı sellər,
Getdi huşum, əyri bellər,
Məxdumqulu deyər, ellər,
İzimdə züryət qalmadı.

## NƏ İŞ GƏLƏR BAŞIMIZA

Ey yaranlar, bilmək olmaz,
Nə iş gələr başımıza,
Görün bu qəhbə fələyi,
Ağı qatar aşımıza.

Əcəl gələr, ağzın açar,
İncə beli torpaq qucar,
Gülüb gələn ağlar keçər,
Rəhm etməz göz yaşımıza.

Güvənmə bəxtə, iqbala,
Dolanar yüz min xəyala,
İxtiyar yox pula, mala,
Dünya bənzər düşümüzə.

Fələk bizə əyri baxıb,
Əl uzadıb, əfsun oxub,
Orta yerdə danə töküb,
Tor qurubdur yaşımıza.

Məxdumqulu, getsən bundan
Haqq-hesab sorarlar səndən,
Şirin can ayrılsa təndən
Qurd daraşar leşimizə.

## LƏRZANƏDİR

Ey yaranlar, gözəl ömrüm
Qocaldıqca lərzanədir.
Gündən-günə artar dərdim,
Dərman istər, pərvanədir.

Aşiq yansa ol yar üçün,
Margir getsə şahmar üçün,
Qoçaqlar namus-ar üçün
Ata minər, mərdanədir.

Nə əcəb dövranlar sürən,
Yaxşı-yaman – varın görən,
Bizlər ilə həmrah yürən
Ağsaqqallar, bax, danadır.

Məxdumqulu, əlli yaşın,
Qəmdir, qayğıdır sirdaşın,
Qafil olma, qaldır başın,
Qocalıq bir bəhanədir.

## NƏZƏR SALMAZ

Mənim bu yanan canıma
İsa, Loğman nəzər salmaz.
Verdiyim bu fərmanıma
Ol Süleyman nəzər salmaz.

Uğradım, düşmədim mərdə,
Tülkü daim yemdir qurda,
Başım düşdü çıxmaz dərdə,
Ulu Sübhan nəzər salmaz.

İki didəm qərqdir xuna,
Ərz elədim mən Qaruna,
Mənim kimi bir Məcnuna,
Ataş-suzan nəzər salmaz.

Düşdüm iraq yollarıma,
Kəlam aldım qollarıma,
Dəşt içində mallarıma
Qarun gəlib nəzər salmaz.

Nə səbəbdir, düşdüm dilə,
Cəfa çəkdim əyri ilə,
Mənim tək quruyan çölə,
Bəhri-Ceyhun nəzər salmaz.

Eşq meyini içdim qana,
Səzavar oldum Məcnuna,
Mənim kimi bir mərdana,
Şahi-mərdan nəzər salmaz.

Özüm qalmışam heyrana,
Uğrayıb mən Dağıstana,
Eşq oduna yanan cana,
Xosrov-Şirin nəzər salmaz.

Dedim dayanıb zəbana,
Güvənirəm ol dəhana,

Mənim kimi natəvana
Bir natəvan nəzər salmaz.

Xakistərəm, bir digərəm,
Atəşdən, bax, xakistərəm,
Bu cahana sərbəsərəm,
Amma cahan nəzər salmaz.

Zəhər qatıldı balıma,
Nuh nəbi minmiş salıma,
Məxdumqulu, bu halıma
Qaib ərən nəzər salmaz.

## OLDUM

Ey yaranlar, xəlayiqlər,
Mərd igidi tapar oldum.
Bəxt sınayıb, bu fanidə
İqbalımı çapar oldum.

Qəflətdə ötmüşdür günüm,
Eşq oduna yanıb tənim,
El gözündən canü tənim
Torpaq ilən yapar oldum.

Sınayıb mən bu baxtımı,
Viran qılıb öz taxtımı,
Bu dəşt üzrə Qıratımı
Koroğlu tək təpər oldum.

Düşmüşəm dünya küyünə,
Qısdı, neyləyim, öyünə,
Dostlar, bu gün yar ruyinə
Müşki-ənbər səpər oldum.

Gəzib cahanın üstündə,
Fələyin zalim qəsdində,
Qalmışam ayaq altında,
Yamanlara səfər oldum.

Bu dünyada Nəmrud kimi,
Ol dünyada sirat kimi,
Ol İskəndər, Cəmşid kimi,
Gözdə yaşım tökər oldum.

Cahanda var neçə bablar,
Camalı ay tək sahiblər,
Savaş qılıb ağır tüplər,
Rüstəm Zal tək pozar oldum.

Bülbüləm, qaldım gülümdən,
Sarvanam, düşdüm elimdən,

Neylim, indi bu dilimdən
Ağır bəla tapar oldum.

Fanını mən gözə almam,
Yaxşılara həmra olmam,
Onca zaman özüm bilməm,
Hər yanda mən yürür oldum.

Bilmirəm hardadır yarım,
Bağımda bitən ənarım,
Göyləndə ol xallı yarım
El-ulusdan sorar oldum.

Keçib mən duzəx, siratın,
Minmişəm behiştin atın,
Məxdumqulu, yar surətin,
Katib kimi yazar oldum.

## SEL QALMAZ

Altmış başlı, ala qarlı dağlardan,
Duman köçər, yağmur keçər, sel qalmaz.
Şeyda bülbül məskən tutan bağlardan,
Xəzan vurar, yarpaq qaçar, gül qalmaz.

Hər kim içsə ol şərabdan, ol camdan,
Ürək coşar, hər söz gələr zəbandan,
Gələn keçər bu yalançı cahandan,
Xoca, seyit, bəy, padişah, qul qalmaz.

Cana dəysə qocalığın zəhəri,
Xarab olar könül – gövdə şəhəri,
Əldən getsə igidliyin baharı,
Qüvvət qaçar, diz əyilər, bel qalmaz.

Bir namərdin çox minnətli aşından,
Əl uzatma, geri çəkil qaşından,
Elsiz qalan bülənd dağlar başından,
Ağac bitər, caddə itər, yol qalmaz.

Məxdumqulu, bu cahanda kim olar,
Ol məkana gedən gəlməz, güm olar,
Görər gözün, görklü bədən qum olar,
Dəhan gedər, dəndan düşər, dil qalmaz.

## BAĞ BUDAĞI

Bağban fələk, harda qaldın,
Saralıbdır bağ budağı.
Dəryaların selin aldın,
Torpaq qıldın qoca dağı.

Fəsadı hacı eylədin,
Qulları xoca eylədin,
Ömrümü qoca eylədin,
Getdi igidliyin çağı.

Yetişgil haqqın əmini,
Fələk tutar öz dəmini,
Doldurubsan bu zəmini
Leş iləni solu-sağı.

Batar, doğar cahan ayı,
Fələk duzəx qılmış cayı,
Kimsələrə verməz payı,
Kimə vermiş at-ulağı.

Gəldim fələk otağına,
Atdı yanar ocağına,
Mən miskinin ayağına,
Qurar oldu ol duzağı.

Cahanı yandırdı odun,
Qaçar oldu yaxın-yadın,
Məxdumqulu, sənin adın,
Olsun indi qoy Fəraqi.

## BATDI, YARANLAR

Dörd min dörd yüz yaşlı Loğman həkim də
Başı qara quma batdı, yaranlar.
Qara atlı, ağır gürzlü Rüstəm də
Əcəl cilovından tutdu, yaranlar.

Yusifın arzusu aqub yanında,
Sevgisi bağrında, dərdi canında,
Kimin qədri vardır çərxin yanında,
Yusifi qul edib satdı, yaranlar.

Aləmə hökm edən İskəndər sultan,
Əcəl tədbirinə tapmadı dərman,
Taxtını yel çəkən hökmi-Süleyman,
Dünyada qalmadı, ötdü yaranlar.

Üç yüz on üç mürsəl, qalmadı biri,
Hanı Asif – Süleymanın vəziri?
Hanı haq rəsulu, haqqın öz şiri,
Qara yer hamısın uddu, yaranlar.

Məxdumqulu deyər, qafil oturma,
Qılca canı uzun qəmə batırma,
Bu dünyanı həsrət ilə ötürmə,
Bir fəsil dövrandır, ötdü, yaranlar.

## HEY

Qismət ola, gedəm uzaq yollara,
Nəsib qoymaz, gedər yolum bağlar, hey.
Heyran-Məcnun olub, çıxam çöllərə
Varıb, məskən tutam sizi, dağlar, hey.

Oyun ilə gəncliyimin dəmindən,
Ötdüm, gəldim kamilliyin çəmindən,
Könlüm lərzan oldu dünya qəmindən,
Tutdu sinəm çalın-çarpaz dağlar, hey.

Yavaş-yavaş gəncliyimin rayından,
Yetib gəldim kamilliyin payından,
Batdı başım, çıxa bilməm layından,
Yada düşər ötüb keçən çağlar, hey.

Cavanlıqda dörd tərəfə axışan,
Cahillikdən hər bir işə qarışan,
Aciz qalıb, qocalığa yetişən
Öz-özündən dərd edibən ağlar, hey.

Məna anla Məxdumqulu sözündən,
Fikrə düşər, yaşlar axar gözündən,
Həmmə zatlar təğyir tapar özündən,
Ya rəb, yıxılmazmı böyük dağlar, hey.

## YALAN DÜNYA

Gəlsən, səndən xəbər alam,
Sən əzəldən yalan dünya.
Tükənməz ömrümü yedin,
Cana talan salan dünya.

Kimə görsətdin bəyanı,
Qoymadın xeyri, ziyanı,
Davud oğlu Süleymanın
Taci-taxtın alan dünya.

Kimləri ata mindirüb,
Kimlərə zərbaf geydirib,
Kimlərə fərzənd sevdirib,
Sonra yola salan dünya.

Neçələri üryan etdin,
Qara bağrın büryan etdin,
Didəsini giryan etdin,
Böylə dərdə qoyan dünya.

Sənə gələn ağlar gedər,
Sinəsini dağlar gedər,
Sənə gələn durmaz, gedər,
Kimdir səndə qalan dünya.

Məxdumqulu məna saçar,
Hər kəs öz qismətin açar,
Sənə gələn durmaz keçər,
Kim var baqi qalan dünya.

## NEÇƏ YAŞINDADIR

Yer götürən sarı sığır,
Bilməm, neçə yaşındadır,
Dörd min dörd yüz ayağı var,
Hamısı da döşündədir.

Burnunu fərmanlı tutar,
Quyruğu fələkdən ötər,
Məkkəni beldə götürər,
Mədinənin tuşundadır.

Yer üzündə vardır xətti,
Dünyanı tutar heybəti,
Yer teyində yatan Mehdi
Ol öküzün qaşındadır.

Quyruğu zəminin yarı,
Gövdəsi dünyanın varı,
Məğribdən məşriqə sarı,
İki şahı başındadır.

Məxdumqulu, dünya fani,
Bu cahana gələn hanı,
Bir cütə kim qoşa onu,
Tamaşa onun işindədir.

## YER İLƏNİ

Gəl, könül, yara gedək,
Həmrah olsan yer iləni.
Yar yoluna qədəm qoyaq
Pa yerinə sər iləni.

Asiman görkü ənvərdir,
Dünya görkü simu zərdir,
Cəsəd-torpaq, can-cövhərdir,
Almaq olmaz zər iləni.

Güvənmə gəl surətinə,
Minərsən qəhər atına,
Tuş olsan yaman xatına,
Ömrün ötər şər iləni.

Xəsis bayda verim olmaz,
Mərdin sözün bavər qılmaz,
Arvananın yükü qalmaz,
Yola girsən nər iləni.

Qənimətdir qardaş üzü,
Dəvadır qədəmi-tozu,
Bir əbləhin nakəs sözü,
Bərabərdir nar iləni.

Pisin qarşısında durma,
Xəsisin üzünü görmə,
Kar ilə xəlvət iş qurma,
Yola çıxma kor iləni.

Yaman ilə yoldaş olma,
Düşmən ilə sirdaş olma,
Təamda tabaqdaş olma,
Acgöz, haramxor iləni!

Yaman ər nəsihət tutmaz,
Yaxşı sözə qulaq asmaz,

Heç bir sözün kova getməz,
Nakəs süxənşor iləni.

Elindən getsən avara,
Sonda olarsan biçarə,
Qonşu olsan haramxora,
Sitəm eylər zor iləni.

Al pəndimi, axmaq kişi,
Özünə qılma xahişi,
Götürməsə dövlət quşu,
Uçmaq olmaz pər iləni.

Yaxşıya özün yar eylə,
Məclisində bazar eylə,
Rəft-aməd qıl, müdar eylə,
Savaş etmə şir iləni.

Məxdumqulu, yaxın, yadlar,
Qəmginlərlə könlü şadlar, –
Yerə gələn bütün zatlar,
Yeksan olar yer iləni.

## QALSIN

Səhər dur, xudaya yalvar,
İslam öyü abad qalsın.
Pisi qoy, yaxşıya yol ver,
Şeytan işi bərbad qalsın.

Yaxşı sözə qulaq salgil,
Səhər vaxtı bidar olgil,
Yaxşılardan alqış algil,
Ömrün artıb, ziyad qalsın.

Adəmzad gözdən qaçınca,
Yaddan çıxar mal tapınca,
Mində bir rabat yapınca,
Haqdan dilə, övlad qalsın.

Pis xatın başa möhnətdir,
Dünyanın malı növbətdır,
İgidə oğul dövlətdir,
Mal qalınca, züryət qalsın.

İgid xoşu at-yaraqdır,
Hər işə cürət gərəkdir,
Pis oğuldan yaxşıraqdır –
Fəraqi, yaxşı ad qalsın.

## GETMƏK

Təam ləzzətin alar
Dəhanından diş getmək,
Abırsızı azdırar
Çoxlu dövlət, baş getmək.

Şeytan yolun bəy eylər,
Qara üzün ağ eylər,
Yüz min günah yox eylər,
Səhər gözdən yaş getmək.

Piltəsiz yağ çırağa,
İşıq salmaz qırağa,
Elin salar ayağa,
Ayaq qalıb, baş getmək.

Neçə pisə zar olub,
Yatsan yey bimar olub,
Xoş yaxşıya yar olub,
Bir yamandan dış getmək.

Heç düşməyənlər qəmə,
Şükr etməzlər xoş dəmə,
Nə gözəldir adəmə
Yaxşı gəlib, xoş getmək.

Yaman dil yol itirər,
Yaxşı rəhmət gətirər,
Ərə qayğı artırar
Qırxdan aşıb, yaş getmək.

Fəraqi, dünya düşdür,
Düş görsən, dibi heçdir,
Cahanda yaman işdir,
Quru gəlib, boş getmək.

## İLƏ

Könül deyər: eldən qalıb,
Gəzsəm dağlar-daşlar ilə.
Günahımı yada salıb,
Üzüm yusam yaşlar ilə.

Kimi görsəm, bir peşədə,
Mənim könlüm əndişədə,
Köyi-sər içrə köşədə
Otursam ağaclar ilə.

Qarı dünya al içində,
Adəmzad xəyal içində,
Cahan qalmaqal içində,
Hər kim yüz təlaşlar ilə.

Allahın eşqində məstlər,
Tuş  gəlişməz zəbərdəstlər,
Könül pərvaz vurar, dostlar,
Durmaz yüz əlaclar ilə.

Çox küylər ilə oturdum,
Bilmədim, nə iş bitirdim,
Gümra olub, yol itirdim,
Oturdum biveclər ilə.

Boş qalmasın ömür taxtı,
Oyandırım yatan baxtı,
Dua qılıb, səhər vaxtı
Nalış qılsam quşlar ilə.

Məxdumqulu, tövfiq alsam,
Bir ər tapsam, qulluq qılsam,
Ürək deyər: yoldaş olsam
Dəm çəkən dərvişlər ilə.

## KÖNÜL COŞUNDADIR

Könül bir bədən şahıdır,
Hər söz könül coşundadır.
Yeddi iqlimın taxtında
Hər biri öz işindədir.

Dağların qalxıb-enməsi,
Çoxların köçüb-qonması,
Dünyanın dönüb-dönməsi
Fələyin gərdişindədir.

Kimdir bu dünyada qalan,
Mənə çindir, sizə yalan,
Biri ağ, biri qara ilan –
Süleymanın qaşındadır.

Dəyraları zümrüd daşlı,
Nər atalı, nər qardaşlı,
Altın taxtlı, almaz taclı
Dev bəyləri başındadır.

Dolanar, keçər əyyamlar,
Qocalar taxtlar, eyvanlar,
Gündüz yara aşna canlar
Gecə yatsa, düşündədir.

Üç hissəsi dəli dərya,
Üçdə birində min qovğa,
Kim bilər bu köhnə dünya,
Ya rəb, neçə yaşındadır?!

Məxdumqulu der, haraydır,
Əcəl oxdur, fələk yaydır,
Dünya bir qəhbəyə taydır,
Adamzadın dışındadır.

## GÖZLƏR

Elindən ayrı düşən
Ah çəkər, eli gözlər.
Yolundan ayrı düşən
Cəhd edib, yolu gözlər.

Göydə fələk gərdandır,
Xalq yerdə sərgərdandır,
Nə tamahkar cahandır,
Göz açan malı gözlər.

Kimlərdə altın tacdır,
Kimlər sail, möhtacdır,
Kimlər dibdən qəllacdır,
Kim xalça, xalı gözlər.

Kim nan tapmaz yeməyə,
Kim yer tapmaz qoymağa,
Kim don tapmaz geyməyə,
Kim tirmə şalı gözlər.

Bu cahan bir heçdədir,
Kim oyaq, kim düşdədir,
Hər bəndə bir işdədir,
Hər kəs bir halı gözlər.

Həngam uzun, ömür az,
Dörd mövsümə başdır yaz,
Göydə qanad qərən qaz –
Gözləri gölü gözlər.

Məxdumqulu huş edər,
Gözlərindən yaş gedər,
Dəli könül coş edər,
Yüz min xəyalı gözlər.

## SARI

Onda adam sayılar,
Min bir astana sarı.
Fələk baqqal ötürmüş
Bazaristana sarı.

Qara yer ağzın aça,
Qafildir adam, keçə,
Bülbüllər istər köçə
Baği-bostana sarı.

Nurata, Baba Darğan,
Dövrəsi dərya, orman,
Yol üstədir Bakırğan,
Şol Türküstana sarı.

Haqdan rəhmət səpilər,
İmarətlər yapılar,
Getsən, Kəbə tapılar,
Urumistana sarı.

Gündoğardan günbatar,
Tərsa, cuhud, həm tatar,
Şəhərlər qatar-qatar
Məğribistana sarı.

Aşiq deyər: «Ya sübhan,
Müşkülümü qıl asan.
Şəfaət eylə, yaran,
Şol Dehistana sarı!»

Məxdumqulu dillənər,
Gözdə yaşı sellənər,
Gündə köçdür, yollanar
Məzaristana sarı.

## HEYRANDADIR-HEYRANDA

Aşiqlər haqq eşqində,
Heyrandadır-heyranda.
Gözlər zəəf içində,
Giryandadır-giryanda.

Qıldı ona haq rəhmət,
Nuri-təcəlli qüdrət,
Xirqə geyən Xoca Əhməd
Sayramdadır-Sayramda.

Yerdən çıxan ağaclar,
Dili sənalı quşlar,
Sübhan sevən dərvişlər
Dövrandadır-dövranda.

Ayıl, aşığım, ayıl,
Məcnun ol, xalqa yayıl,
Xəlil oğlu İsmayıl
Qurbandadır-qurbanda.

Tur dağında duranlar,
Neçə qaib ərənlər,
Camalını görənlər
Fərmandadır-fərmanda.

Dolduran bu dünyanı,
Sözlə iki cahanı,
Külli işin bəyanı
Qurandadır-Quranda.

Məxdumqulu, aç dillər,
Qulluq et aylar, illər,
Ertə qulluqsuz qullar
Ərmandadır-ərmanda.

## HƏVƏSİDİR

Adəm oğlu, fikrin-zikrin
Bu dünyanın həvəsidir.
Hazır bu fikrə gedərsən,
Bir gün dərdə qoyasıdır.

Bir gün girər yerə başın,
Unudar qohum-qardaşın,
Namazın, rövzən yoldaşın,
Bir də dilin sənasıdır.

Dolaşaraq sağda, solda —
Şeytan yol kəsər bu yolda,
Ərkli Quran belə halda
Şəriətin qalasıdır.

Bu cahanın sərmayəsi,
Rizq səbəbi, haq sayəsi,
Yer dirəyi, göy payəsi,
Dərvişlərin duasıdır.

Keçər ömür, ötər bu dəm,
Sən gedərsən qədəm-qədəm,
Fili tora salan adam
Səni çiy-çiy yeyəsidir.

Dağlar vardır, daşlar vardır,
Yazlar vardır, qışlar vardır,
Yaman-yavuz işlər vardır,
Başa gələn duyasıdır.

Məxdumqulu, eşq meydandır,
Bu meydana girən candır,
Canın bu təndə mehmandır,
Verən bir gün alasıdır.

## GEDƏR

Adəm oğlu, fələk sənin
Bir gün donun biçər gedər.
Sənə vurar xəncərini,
Qızıl qanın saçar gedər.

Gəzmə dünyaya meyl edib,
Bihudə yerdə seyr edib,
Səndən əvvəlkilər ötüb,
Göz açıncan keçər gedər.

Ölsən, səni kim edər yad,
Kişnər, qalar min bədəv at,
Onu minən min qoç igid,
Qara torpaq qucar gedər.

Dünyanın sonu bərbaddır,
Binamazın yeri oddur,
Ölüm bir acı şərbətdir,
Hər kəs ondan içər gedər.

Könül deyər ki, ölməsən,
Məzarda tənha qalmasan,
Tanrıya doğru olmasan,
İman səndən qaçar gedər.

Məxdumqulu, bu nə vaydır,
Nə əcəb karvansaraydır,
Dünya bir qəhbəyə taydır,
Bir gün səni qucar gedər.

## DÖYMÜ?

Zəbaniyə mələklər,
Əllərində gürz döymü?
Səkkiz ərşi bürüyən
«La ilahə!» vəz döymü?

Bilməz, keçər axmaqlıq,
Qayğı, qüssə çəkməklik,
Gözdən yaşın tökməklik
Qadir haqqa ərz döymü?

Əlin üzməsin deyə,
Bivec gəzməsin deyə,
Mömin azmasın deyə
Şəriət bir mərz döymü?

Etməgil xəyanəti,
Atmagil dəyanəti,
Tanrının əmanəti
Can tənində qərz döymü?

Məxdumqulu, qovğamız,
Başdan aşa sevdamız,
Məhşər günü günahmız –
Sünnət ilə fərz döymü?

## DÜNYADIR

Ey yaranlar, müsəlmanlar,
Gəlib-keçməli dünyadır.
Gücü yetən qoç igidlər
Töküb-saçmalı dünyadır.

Heç kim bunda tutmaz orun,
Sağlıqda töküb, saç varın,
Bunca yığıb, netdi Qarun,
Qoyub qaçmalı dünyadır.

Bu dünyanın qəmin yersən,
Adəm oğlu, nə gülərsən,
Pər döşəyə sərt deyərsən,
Yeri quçmalı dünyadır.

Daş yağdırar başlarına,
Ağı qatar aşlarına,
Buradakı işlərinə
Hesab çəkməli dünyadır.

Məxdumqulu, oxu Quran,
Xudadan diləgil iman,
Hər igid ölsə binişan,
Odu keçməli dünyadır.

## GETMƏZMİŞ

Ellər hey, Məcnun dağının
Sərindən duman getməzmiş,
Münkirə bilik verməyin,
Könlündən güman getməzmiş.

Qoyuna dost olmaz qurddan,
Dilək etmə hər namərddən,
Ta ölüncə qoç igiddən
Mizraq, tir, kaman getməzmiş.

Qafil adəm oğlu, bilməz,
Ölümünü yada salmaz,
Malın-mülkün israf qılmaz,
Yanından iman getməzmiş.

Zamana yaxın gələndə,
Yeri, göyü su alanda,
Allahdan qeyri öləndə,
On səkkiz məkan getməzmiş.

Yer ilə göydən qüvvətli,
Ol Əzrayıldən heybətli,
Beş kişinin, Harış adlı
Önündən ilan getməzmiş.

Aşiqlər tərki-can etsin,
Gözdə yaşın rəvan etsin,
Qoç igidlər ehsan etsin,
Ehsanı rəvan getməzmiş.

Məxdumqulu, qaldın dərdə,
İşin düşəndən namərdə,
Məhşər günündə ol mərdə,
Duzəxdən ziyan yetməzmiş.

## BƏLLİDİR

Yaxşılığı pis bilməz –
Ər yanında bəllidir,
Görər gözün qiyməti,
Kör yanında bəllidir.

Dəli könül dayancı,
Yoxdur dünya inancı,
Sağ qulağın güvənci
Kar yanında bəllidir.

Əgər pirsən, əgər yaş,
Qılma sirrin xəlqə faş,
Sir saxlayan məhək daş
Zər yanında bəllidir.

Bu dünyanın muradı –
At, zənən, ər züryadı,
Arvananın qüvvəti
Nər yanında bəllidir.

Olsa qəmdən xilasım,
Yaza dönsə qış fəslim,
Məxdumqulu, ixlasım
Yar yanında bəllidir.

## DIŞDA BƏLLİDİR

Yaxşının qədrin el bilməz,
Yaxşılar dışda bəllidir,
Mövlam nəzər salsa kimə –
Olacaq başda, bəllidir.

Evdə yatıb etmə günah,
Əl-ayağın olar güvah,
Elə pünhan, haqqa agah,
Ər adam işdə bəllidir.

Bu dünyada maldır görkün,
Hər bir yerə yetər ərkin,
Öyündə laf vurar hər kim,
Batır savaşda bəllidir.

Xınanı yaxsan, rəng olar,
Qızılı söksən, səng olar,
Bütün bədəvlər tən olar,
Bədəv çapışda bəllidir.

Xoca, seyid əsalətli,
Fəqirlərə dəlalətli,
Xoş təbəssüm, məlahətli –
Hər kəs tay-tuşda bəllidir.

Məxdumqulu, şövqün günü,
Yaxşıdır islamın dini,
Yenə xas gözəlin sini
Göz ilə qaşda bəllidir.

## SAYAR

Dağlar yerin mıxıdır,
Təpə özün dağ sayar.
Qarğa deyər bülbüləm,
Sərçə özün zağ sayar.

Qənaətdə kamal var,
Mənlik etmə, zaval var,
Hər başda bir xəyal var,
Qul özünü bəy sayar.

Gücündən, qüvvətindən,
Dünyanın qismətindən,
Varlının izzətindən
Yoxsul özün bay sayar.

Nadanam, zad bilmənəm,
Bir günahlı qul mənəm,
Sirkə deyər: bal mənəm,
Neft özünü yağ sayar.

Hər səy çıxar bir evdən,
Özün kəm saymaz devdən,
Öz yanında bədəvdən
Eşşək özün yey sayar.

Dərd çəkənlər dərd bilər,
Namərd özün mərd bilər,
Tülkü özün qurd bilər,
Tula özün səg sayar.

Məxdumqulu bir quldur,
Qulluğuna qaildir,
Axmaq deyər aqildir,
Ölən özün sağ sayar.

## QABAQ

Adəm oğlu, yatma qafil,
Oyan dan atmazdan qabaq.
İgidlikdə taqət qılgil,
Qocalıq yetməzdən qabaq.

Qocalıq taqət qıldırmaz,
İşin əbəsdir, bildirməz,
Fələk ağladar, güldürməz,
Bu dövran ötməzdən qabaq.

Bəndəyə eyləmə qəsdi,
Ağlatma sən yarı-dostu,
Bir gün gəlib, əcəl dəsti
Yaxandan tutmazdan qabaq.

Qardaşların ağlar qalar,
Bir yaxasız dona salar,
Bir gün əmanətin alar
Sən tövbə etməzdən qabaq.

Bu dünyaya gələn keçər,
Hamı ol şərbətdən içər,
Bir əjdəha ağzın açar,
Vəhm eylə udmazdan qabaq.

Məşqulsan dünya oynuna,
Girərsən yerin qoynuna,
Əcəl bəndənin boynuna
Atılıb minməzdən qabaq.

Əcəl hamını yaxalar,
Qalmazlar şahü gədalar,
Haramdan qaç, kətxudalar,
Rusiyah olmazdan qabaq.

Saxla qeybətdən dilini,
Odla bağlarlar əlini,

Açılan tazə gülünü
Allah soldurmazdan qabaq.

Dur səhər, tanrıya ağla,
«Haq» deyib ürəyin dağla,
Tövbə qapısını bağla
Qırxına gəlməzdən qabaq.

Bəndəyə etmə xəyanət,
Qıl tanrıya sən itaət,
Bu haqda var hədis, ayət,
Fəhm elə ölməzdən qabaq.

Məxdumqulu, doğru söylə,
Ömrün gəlib, keçər böylə,
Durmadan yaxşılıq elə
Baş gora girməzdən qabaq.

## GÖRDÜM

Həqiqət dəftərin açdım,
Bir yazılan tumar gördüm.
Bu yurddan ol yurda köçdüm,
Yurdunu ixtiyar gördüm.

Bir evdə var on iki can,
Xoş gəlibsiz, əziz mehman,
Bir süfrədə dörd isti nan,
Üstündə yeddi nar gördüm.

Mustafaya indi varaq,
Münkir olan – dindən iraq,
Bir evdə var on iki çıraq,
Dörd məşəl, bir yanar gördüm.

Bu dünyanın qırağında,
Ağaclar bitmiş bağında
Beş alma var budağında,
Asılmış, bərqərar gördüm.

Məxdumqulu, nə fikrin var,
Ömürdən keçdi ruzigar,
Yetmiş iki sürü davar,
Çobanı bir baxar gördüm.

## GƏRƏKDİR

Mənəm deyən qoç igidə,
Bir münasib yar gərəkdir.
Döyüş günü ərəb atı,
Almaz Zülfüqar gərəkdir.

İgid oldur – yurd üstündə,
Canın verə din üstündə,
Qoç igidlər el üstündə,
Namus ilən ar gərəkdir.

Beş gün könül xoş etməyə,
Süfrə açıb, nan tökməyə,
Hörmət alıb, ad etməyə,
Əllərində var gərəkdir.

Məkkə varan olar hacı,
Ayrılıq ölümdən acı,
Qoç igidə din qılıncı,
Aşiqə didar gərəkdir.

Artırmada fələk zarın,
Alıb əldən ixtiyarın,
Məxdumqulu, sevər yarın,
Siyah zülfü tar gərəkdir.

## QARŞI

Ağız açdım, göz yumdum,
Əl atdım tasa qarşı,
Tas üstündə yatıbdır
Qələndər yasa qarşı.

Saqi durdu, səs etdi,
Kim gec qaldı, kim yetdi,
Qələndər tasın tutdu,
Düşdüm həvəsə qarşı.

Mən bikamal ol yerdə,
Eşq içrə düşdüm dərdə,
Gül üzə gülgün pərdə,
Tutdu palaza qarşı.

Xəbər tutan cahandan,
Ayrılar xanimandan,
Aşiqlər keçər candan,
Tutulsa kasə qarşı.

Bu dünya bir saraydır,
Gələn keçib varaydır,
Məxdumqulu haray der,
Xıdır İlyasa qarşı.

## İLƏNİ

Bülənd dağların başında
Bulud oynar sel iləni.
Qoç igidə toy-bayramdır
Hər iş gəlsə el iləni.

Yaz ötəli yay olubdur,
Altın, gümüş zay olubdur,
Milçək haçan tay olubdur
Uğraşanda fil iləni?

Otlağa qaçar buzovlar,
Önün başlar yaxşı gavlar.
Tanınar xəstə bədəvlər,
Köhnə, yırtıq çul iləni.

Haram işdən qaçar pirlər, –
Tülkü hiyləsindən şirlər,
Yediklərin olar hədər,
Quymaq yesən qıl iləni.

Haq bəndəsi haqqa qoşar,
Yaman öz felindən tapar,
Məxdumqulu, aybın yapar
Aş, qılıncü dil iləni.

## GÖRÜNƏR

Adəm oğlu, seyr qılsan,
Dünyada dükan görünər.
Bu faniyə nəzər salsan,
Gözünə cahan görünər.

İskəndərə torun quran,
Süleymana ərzə varan,
Qarun-Harun varın vuran,
Ol fələk pəlvan görünər.

Cəbr görüb yanan canlar,
Çarə tapmayan dərmanlar,
Dünyada çoxdur ümmanlar,
Beş sanı ümman görünər.

Sərinə duman bürünən,
Göz yaşı yerdə sürünən,
Göydə bulud tək görünən
Dağlarda duman görünər.

Çin-Maçində taxtın quran,
İranı, əfqanı saran,
Hindistan, Xotənə varan
Ataniyaz xan görünər.

Dağ sərindən güzər salsan,
Ol yeri yurd edib qalsan,
Şol yanından nəzər salsan
Ulu Dehistan görünər.

Pərdə çəkib üzlərimə,
Rəvac verib sözlərimə,
Məxdumqulu, gözlərimə
Bircə Mənli xan görünər.

# OLAR

Olsa özü mərd igid,
Hər bir yerdə yüz olar,
Namərdlər bilsəniz - it,
Hər kəslə üz-göz olar.

Nə günah var İdrisdə?
Oddan yeydir həris də,
Saz olmayan məclisdə
Gurlaşsan həm saz olar.

Mən iqbalım unudam,
Fanidən aldım qədəm,
Özün bilməyən adam
Hər yetənə söz olar.

Nə gözədir bu dağlar,
Saysız ovlar, ovlaqlar,
Gölə giribdir zağlar,
Misalı bir qaz olar.

Namərdlərdən yaman yey,
Hər zülümdən peyman yey,
Neçə qızdan cüvan yey,
Yaxşı, yaman qız olar.

Əzəl başdan verməsə,
Qayği-həsrət görməsə,
Fələk tiğin vurmasa,
Qış fəslimız yaz olar.

Verir yazda, əzəldə,
Alır fəsli-xəzəldə.
Əcəb nərsə gözəldə
Qaşın dartsa, naz olar.

Hər günə şükr eyləsən,
Ələmin zikr eyləsən,

Dünyanı fikr eyləsən,
Təşvişin lap düz olar.

Bir dərdlinin yanında,
Olsan adam sanında,
Aşiqlərin canında
Baqi sönməz köz olar.

Deyərlər, axır zaman,
Atəş-suzandan yaman,
Bavər qılmagil güman,
Böylə təşviş tez olar.

Qiyməti var zənanın,
Tərif qılsam var zadın,
Badam qabaq cananın
Boyları diraz olar.

Kimlər istər ulu mal,
Kimsələr etməz xəyal,
Fələyi qılsan ehmal,
Asmanda pərvaz olar.

Fani dünya gəzəndin,
Sən aləmdən bəzəndin,
Ağılsız, zay igidin
Eldə qədri az olar.

Kimlər zər libas geysə,
Oncalar zəhər yesə,
Yaxşı dost bir söz desə,
Canın içrə duz olar.

Fani təşvişə qoyar,
Kimlər pünhanın ayar,
Qarı özün qız sayar,
Amma qoynu buz olar.

Məhəmmədin ümməti,
Boynundadır sünnəti,
Hər gözəlin qiyməti
Üzdə imtiyaz olar.

Dərdim qılınsa ehsan,
Ürəkdə bitər bostan,
Qıldığım əcəb dastan
Məcnuna niyaz olar.

Nə iş gördü gözlərim,
Qəbahətdir üzlərim,
Məxdumqulu, sözlərim
Saza qoşsan, uz olar.

## DƏYMƏZ

Bir neçənin dövranı,
Fani cahana dəyməz.
Buncanın yeni salı
Dərya-ümmana dəyməz.

Kor əlində dayağı,
Göz yerində ayağı,
Buncaların ayağı
Xərə, madyana dəyməz.

Dağlar başı dumandır,
Yellər daim rəvandır,
Onca dağlar virandır,
Qədri dumana dəyməz.

Kiminə vermiş malı,
Kimi görər vəbalı,
Neçələrin iqbalı
Fani cahana dəyməz.

Görkü var mərmərlərin,
Damarıdır yerlərin,
Görün, neçə pirlərin
Əli Qurana dəyməz.

Məndən qeyri yox odlu,
Daim ondan adətli,
Məxdumqulu həsrətli,
Əli dastana dəyməz.

## GÖZLƏR

Mərd qədrini bilməz xan,
Eldə namərdi gözlər.
Ağzı yanan bir çoban,
Daima qurdu gözlər.

Hicran oduna bişən,
Ayrılıqdan pərişan,
Yurdundan ayrı düşən
Mehriban yurdu gözlər.

Bir dərd gələrsə yaman,
Nə mərd dözər, nə mərdan,
Dəri-dərmanlı Loğman
Mal deməz, dərdi gözlər.

Payın qiymətin görən,
Yaxın-irağı gəzən,
Səfil-sərgərdan yürən,
Xər deməz, atı gözlər.

Görüb qalar asmana,
Düşməz ulu ümmana,
Eşq aşiqi pərvana
Gecə ol odu gözlər.

Axır zamana haçan,
Varmıdır ondan qaçan,
Cəsədi qalan bican
Abi-həyatı gözlər.

Zinhar, olmayın sirdaş,
Qocaldar ol cavan baş,
Namərdə olsan yoldaş,
Durub fürsəti gözlər.

Gözüm bağlı mən uçub,
Bişmişəm nara qaçıb,

Müftilər Quran açıb
Ulu taəti gözlər.

Kim qaldı qocalmayan,
Düxtərlər oldu cavan,
Bağda sərvi-xuraman,
Gül deməz, badı gözlər.

Bir neçələr ar edib,
Beytinləri zar edib,
Gözəl elin xar edib,
Bir ulu adı gözlər.

Dəştdə qurbandır güllər,
Ruyin öpərmiş yellər,
Ovu hesabsız çöllər
Türgən sayyadı gözlər.

Ərşə çıxdı nalələr,
Harama döndü mallar,
Bu zamanda mollalar,
Yortub, zəkatı gözlər.

Üzündədir nurları,
Gözündədir narları,
Bu əyyamın ərləri
Atı, sursatı gözlər.

Hara dönübdür dini,
Məgər yoxdur imanı,
Xəsis yığıb dünyanı,
Feli-həcatı gözlər.

Pünhan sirrim aşkara,
Neylək, çıxıb şikara,
Məxdumqulu biçara
Bircə züryəti gözlər.

## EYLƏR

Xəsis adam mehman alsa,
Var zadını pünhan eylər.
Bir yurdun bazarı qızsa,
Hər bir adam dükan eylər.

Fələkdən çəkdim amanı,
Könlümdən getdi dumanı,
Daim hicran bu vətəni
Özü üçün məkan eylər.

Qaçmaz fanidən utanıb,
Gələrmiş qanadın yayıb,
Mərd igidin ərkin alıb,
Görün, fələk nadan eylər.

Cahanda öyüd verərəm,
Öyüd tutuşun görərəm,
Bihudə ağlar, yürürəm,
Fələk daim güman eylər.

Qəflətdən çıxmadı başım,
Daim fələkdir yoldaşım,
Oturmuşdır yaxın qonşum,
Bu sözümdən giryan eylər.

Çıxmışam zünnar bağlayıb,
Canü ciyərim dağlayıb,
Məxdumqulu, qan ağlayıb,
Bir həsrətli dastan eylər.

## CAN İÇİNDƏ

İmanım ərkanıdır
Bu gözəl can içində.
Namərdlər dövranıdır
Axmaq sultan içində.

İqbal atın sürmədim,
Əcəb zaman yürmədim,
Leyli deyər görmədim
Sən tək Məcnun içində.

Ürəyim oda dağlı,
İzim gördüm soraqlı,
Günəşim xuna bağlı,
Ciyərim qan içində.

Deyər kabab ol nara:
-Qoydun sən çox azara.
Dəhan içrə avara
Ağlar dəndan içində.

Daşlar deyər: «Qəllacam»,
Kəmər deyər: «Mən acam»,
Dağ deyər: «Naəlacam,
Başım duman içində».

Heyvan içrə ümmətəm,
Nə əcaib surətəm,
Bədəv deyər: «Qiymətim
Vardır köhlən içində».

Balıq deyər: «Üzərəm,
Dəştdən əlim üzərəm,
Mən ərkana gəzərəm,
Ulu ümman içində».

Gül deyər: «Boyanmışam,
Bülbüldən utanmışam,

İndi, neylim, solmuşam,
Qışda xəzan içində».

Bülbül deyər: «Can-tənim,
Bağ içində hər günüm,
Meyxanadır məskənim,
Ötüb reyhan içində».

Bars deyər: «Tövbə qıldım,
Təbana həmrah oldum,
Daim bəndi mən qaldım,
Mahi-təban içində».

Mey deyər: «Mən içildim»,
Çiçək deyər: «Açıldım»,
Ənbər deyər: «Saçıldım,
Bağı-bostan içində».

Kəlam deyər: «Sözlərim,
Yüzləşibdir yüzlərim».
Deyər gördüm: «Gözlərim
Yari-canan içində».

Mal deyər: «Mən iqbalam»,
Röya deyər: «Əhvalam»,
Göftar deyər: «Mən balam,
Şirin zəban içində».

Namərd söyləyər: «Aman»,
Deyər mərd: «Vergil düşman»,
Söyləyər şirin zəban:
«Yerim dəhan içində».

Aşiq deyər: «Pərvanam»,
Eşq söyləyər: «Suzanam»,
Məxdumqulu, heyranam,
Fani cahan içində.

## DÜŞMƏZ

Gözlərimin rövşəni
Əcəb nurana düşməz.
Bağİ-İrəm gülşəni
Fani cahana düşməz.

Boş qoyubsan bu səri,
Vurdu eşqin əsəri,
Can şəhrində bir pəri
Bazar-dükana düşməz.

Sevdiyim şirin candır,
Ol pəriyə qurbandır,
Külli aşiq heyrandır,
Atəş-suzana düşməz.

Mən fəqirəm, neyləyim,
Dərdi-halım söyləyim,
Yarım tərif eyləyim,
Qeyri zəbana düşməz.

Türküstandır xəyalım,
Açgil, tanrım, sən yolum,
Hicran qərq edən salım
Dəli ümmana düşməz.

Siyahdır bitən gülü,
Amma şirindir dili,
Dəşt içrə ərəb eli
Adil fərmana düşməz.

Gözüm görmüş Hindistan,
İran ilə həm Əfqan,
Ümman, Xəzər, Dehistan...
Yürsəm, mizana düşməz.

Mərd igidə ver qeyrət,
Viranı qılgil abad,

İti qılınc, ərəb at
Feli-yamana düşməz.

Qibləyə tutdum üzüm,
Qələt deyildir sözüm,
Məxdumqulu der, gözüm
Qeyri vətənə düşməz.

## SÖHBƏT OLMASA

Məclisin avazı olmaz,
İçində söhbət olmasa.
Şahlar gəlib, taxtın almaz,
Bu işdə şövkət olmasa.

Eşqin yaxan odu çıxmaz,
Aşiq yanar, tüstü çıxmaz,
Sultanların adı çıxmaz,
Bir ulu dövlət olmasa.

Çəkdiyim cəbri-həsrətdir,
Qullar məkanı Məşhəddır,
Adəm oğlu daim şaddır,
Könlündə firqət olmasa.

Hara qaçsan fələk yetər,
Gəl, yarışma, səni ötər.
Bir namərddən nə iş bitər,
Qaynar qan, qeyrət olmasa.

Ulu dağlar yerə batmaz,
Əgər batsa, geri çıxmaz,
Mürğ, heyvanın zarı çıxmaz
Dağlarda səyyad olmasa.

Fələk durub qanad yaymaz,
Fağır yoxsul qızıl saymaz,
Çın gözələ ara qoymaz,
Belində kəmənd olmasa.

Dünənki eşq bu gün sönər,
Pərvanələr mürğə dönər,
İgid ər namərdə dönər
Ərəbi səmənd olmasa.

Şirin canlar olsa cüda,
Cismin nə iş qılsın gəda,

Ərz eşitməz qadir xuda,
Ellərdə taət olmasa.

Yansa cəsəd, nara qalmaz,
Güllər solub xara qalmaz,
Dövlətli el xərə qalmaz,
İçində fəsad olmasa.

Fani cahan cana afət,
Qoyar bu sərə qiyamət,
Gözəl eldən gedər dövlət,
Eldə səxavət olmasa.

Canları torpaq eylərsən,
Cəsədə afət eylərsən,
Qara daşı, de, neylərsən,
Elinə hacət olmasa.

Yaxşı yerə fəsad varmaz,
Ariflər adın sorammaz,
Xəsis evdə mehman durmaz,
Neyləsin, hörmət olmasa.

Fələk uçar, heç yürüməz,
Ətrafına dönüb baxmaz,
Qoç igidlər heç qarımaz
Ürəkdə həsrət olmasa.

Günlər ötər, keçər aylar,
İlbəildən artar vaylar,
Miskin olar ulu baylar
Haqdan mürüvvət olmasa.

Derlər: «Yaxınmış axirət»,
Görən varmıdır aqibət,
Məxdumqulu, quru dərəxt —
Adamda züryət olmasa.

## YOL İLƏNİ

Namərd sözə qulaq asmaz,
Desən getməz yol iləni.
Can matahdır, fələk satmaz
Gövhər ilən, zər iləni.

Dərdimi qılmazlar asan,
Çəkməz onu hər bir insan,
Qılar oldu fələk yeksan
Onca canı yer iləni.

Can cismimdə ahəng qıldı,
Fələk ilə çox cəng qıldı,
Bədəv köhləni tən qıldı
İsa minən xər iləni.

Ötən ömrü hesab eylər,
Ötməyənə əzab eylər,
Bu fanini əcəb eylər,
Fələk, baxın, nur iləni.

Mahitabı ol yaşırdı,
Tündə nurunu qaçırdı,
Qansız heyvanı uçurdu
Bircə quru pər iləni.

İqbal atımı sürmədim,
Yaxşı-yamanı görmədim,
Beşcə gün dövran sürmədim
Əcəb türfə yar iləni.

Könül aşna olar oldu,
Zəfəran tək solar oldu,
Məşuqundan qalar oldu
Narlı tütün zar iləni.

İndi növbə bizə yetdi,
Tutan quşum fələk ütdü,

Oncaları aşna etdi
Əcəb camal huri iləni.

Hər kimə ki baxar oldu,
Onun arxı axar oldu,
Pərvanəni yaxar oldu,
Aldadaraq nar iləni.

Adam ağarmaz un ilə,
Can alınmaz zər-xun ilə,
Məxdumqulu, Məcnun ilə,
Oldu həmrah zar iləni.

## QALDI

Adəm oğlu, can şəhrində,
Gözlə, izdə xanın qaldı.
Qəllac qalıb sən cahanda,
Fanidə, bax, donun qaldı.

Gül şəhrinə düşdü talan,
Viran oldu köşkün, qalan,
Başın açıq, ayaq yalan,
Fələk əldə gönün qaldı.

Qara dağlar, mən sirdaşın,
Yalnızam de, tökmə yaşın,
Götürgil qocalan başın,
Sərində dumanın qaldı.

Tor qurublar bircə cana,
Düşməgil bavər cahana,
Fel tutarsan dünya-kanə,
Ol ulu süxənin qaldı.

Neylək, bizdən uzaq getdin,
Hansı yerdə məskən tutdun,
Miskinlərə cəbr etdin,
Kafirsən, imanın qaldı.

Adəm oğlu, degil sözün,
Bənddir, açgil iki gözün,
Siyah rəngi oldu üzün,
Məgər sənin canın qaldı.

Fələk deyər: darül-aman,
Əlimdədir gələn zaman,
Taxtın viran, ey Süleyman,
Ol yürür fərmanın qaldı.

Qəflət içrə yatar oldun,
Qəm layına batar oldun,

İndi görgil, ötər oldun,
Nə əcəb dövranın qaldı.

Gedər oldun, önün başla,
Doldu beytin, gözün yaşla,
Məxdumqulu, bağrın daşla,
İzində tabanın qaldı.

## KAR İLƏ

Qafil adam, qəm altında yatıbsan,
Ötdü ömrün ufaq-təfək kar ilə.
Dünya mardır, yastılanıb yatıbsan,
Dincələrmi söylə yatan mar ilə?

İman qazan, insafını udmagil,
Görə-görə özün oda atmagil,
Munda bidar-oyaq qalıb yatmagil,
Munca dözüb yatacaqsan gor ilə.

Hara getsən varan yerin gor olar,
Xeyir qazan, yatan yerin nur olar,
Yaxşı olsan, yerin cənnət-hür olar,
Yaman olsan, yandırarlar nar ilə.

Gözün yumdun, səndən ayrılar malın,
Ölərsən, dirilər nə bilər halın,
Yaxşı-yaman, hər nə isə amalın,
Qarşın alıb durar müdam var ilə.

Əsli kafir müsəlmana qatışmaz,
Düz müsəlman haram işə tutuşmaz,
Mənzil kəsməz, heç bir yana yetişməz,
Başçı tutub, yola girən kor ilə.

Ömrünə aldanma, ötənə yanma,
Malına güvənmə, mülkə dayanma,
Munda bəd işləmə, onda utanma,
Hesab günü xeyrin alıb var ilə.

Məxdumqulu, doğru sözə tən vergil,
Səvab mundan ötməz, tapsan, nan vergil,
Könlün tapan dost yolunda can vergil,
İşin nədir, səni deməz yar ilə.

## KÖZ İLƏ

Kimim var ki, yara ərzim yetirsin,
Eşq oduna yandım getdim köz ilə.
Gəlib öz əliylə odum söndürsün,
Yoxsa sönməz varan ilə, buz ilə.

Gələn keçdi, gələcəyə yurd qoydu,
Aşnalığı namərd açdı, mərd qoydu.
Yar sinəmdə dağ üstündə dərd qoydu,
Dərd üstünə bürc qoyubdur duz ilə.

Məşuqum tapdırmaz, tapsam, el verməz,
İqbalım oyanmaz, bəxtim həm durmaz,
Ürək həm dincəlməz, könül həm durmaz,
Dost camalın görməyincə göz ilə.

Bir dərdə düşmüşm, heç kimsə bilməz,
İsa anmaz, Loğman çarəsin qılmaz,
Gələr, durmaz, duman başdan sovulmaz,
Hər zaman bir dərd söylərəm söz ilə.

Min eşq ilə mali-dünya yığarsan,
Bir şahıyçün yüz könülə dəyərsən.
Dünya dərya, tən bir saldır, axarsan,
Haçanacan tay gedərsən düz ilə.

Bu dünya malından kim qandı bir zad,
Əvvəli qəm-qayğı, axırı bərbad,
Olacağın budur sənin, adəmzad,
Yox olarsən torpaq ilə, toz ilə.

Məxdumqulu, nə mənzildir, durarsan,
Yurd kimindir, ağır işlər vurarsan,
Qismət olsa, qarış yerə girərsən,
Nəsib etsə, altı arşın bez ilə.

## BƏLLİDİR

Eşşək özün əskik saymaz bədəvdən,
Qiymət etsən, at yanında bəllidir,
Bədəv desən, bütün atlar bir olmaz,
Çin bədəvlər meydanında bəllidir.

Uşaqlıqda bilməz idin, bəy idin,
Yamana heç keçməz sözün, öyüdün,
Arif olsan, əslin sorma igidin,
Ədəbində, ərkanında bəllidir.

Bu cahanda bilinməyən sir olmaz,
Hər yolbarsdan qaplan olmaz, şir olmaz,
İgid desən, hər igid də bir olmaz,
Qoç igidlər mehmanında bəllidir.

Dövlət qonsa ucalacaq başın da,
Həmayətin – elin gərək qaşında,
İgid özün məlum edər işində,
Qılıncında, zəbanında bəllidir.

Məxdumqulu, qəriblərin göz yaşı,
Dağları yandırıb, əridər daşı,
Fəqirə zülm edən zalımın işi
Ruzi-məhşər divanında bəllidir.

## GƏLSƏ

Dünyada neçə iş vardır, yamandır,
Biri ol kim, yersiz qəhri coş gəlsə,
Aşiqə hər bir gün axır zamandır
Yardan iraq düşüb, ara dış gəlsə.

Dostunu əyləmə, nəfdən qalmasın,
Düşməni saxlama, sirrin bilməsin,
Acda alğın, bəyə vergin olmasın,
İş müşküldür, anlamaza tuş gəlsə.

Zəmin səni diri-diri udarmı,
Aqil böylə yerdə biqəm yatarmı,
Heç bir masqaralıq bundan ötərmi,
Gedən quru getsə, gələn yaş gəlsə.

On qat öyün olsa dəmir qaladan,
Əcəl tapar, əmr olsa Allahdan,
Əsil kişi üz döndərməz bəladan,
Haq rizası ilə başa daş gəlsə.

Sofuyam der, laf vurarlar yalandan,
Mənasını soruş bəlli biləndən,
El gözüncə yüz il taət qılandan,
Yaxşıdır bir səhər gözdən yaş gəlsə.

Məxdumqulu, söylə ağlın yetincə,
Qiyamətin qazan, bekar yatınca,
Tamudadır ta dünyadan ötüncə,
Yaman xatın yaxşı ərə tuş gəlsə.

## HƏM OLMASA

Doxsan dürlü təam olsa qarşında,
Nə ləzzət, içində duz həm olmasa.
Nə bilərsən nə iş vardır başında,
Müşkül işdir başda göz həm olmasa.

Ayaq var getməyə, əl var almağa,
Hanı bəndə, sağlıq şükrün qılmağa,
Qulaq vardır eşitməyə, bilməyə,
Kim danışar dildə söz həm olmasa.

Yox yerdən can verib, yetirdi nanı,
Könül bostanında bitər imanı,
Adı bəndə olan, yiyəni tanı,
Gəlib sənlə üzbəüz həm olmasa.

Qismətin haq bilən rizqin azlamaz,
Söz bilənlər bilən sözün gizləməz,
Könül cuşə gəlməz, dil həm sözləməz,
Hər ürəkdə eşqdən köz həm olmasa.

İldən-ilə fəsad artar əyyama,
Haqqın özü gətirməsə əncama,
Dünya sözü bənzər duzsuz təama,
Söz içində gəlin-qız həm olmasa.

Yum gözünü, gəz qısaraq dişini,
Yaza yetsən, unutma sən qışını,
Təvəkkül et, Ona tapşır işini,
Səbr ilə bitər iş tez həm olmasa.

Məxdumqulu, xəyal düşüb özümə,
Çox tamaşa gəlib, keçər gözümə,
Eşidənlər, eyib etməz sözümə,
Ellər kimi sözüm uz həm olmasa.

## ƏLDƏ VARI OLMASA

Zamana belədir – gözə dəyməzlər,
Hər igidin əldə varı olmasa.
Yüz tümənlik sözün saya salmazlar,
Bir kişinin ixtiyarı olmasa.

Tən bir dar qəfəsdır, can bir vəhşidir,
Dilə gələn sözlər könül nəqşidir,
Odlu, sulu tamu ondan yaxşıdır,
Hər ölkənin bir bazarı olmasa.

Bəyzadələr qaldı çoban təhrinə,
Gen qaçan tuş gələr ilan zəhrinə,
Bərbad olub, dönər Lutun şəhrinə,
Hər ölkənin hakim əri olmasa.

Dünyada onlardan anlamaz kandır,
Bilməz bir bəladır, bilənlər – candır,
Ol igidlər adam dilli heyvandır,
Söz qanmasa, həm iqrarı olmasa.

İgidə yoxsulluq yaman bəladır,
Sözünü tay-tuşdan arxa saladır,
Pis hərəkət dostu düşmən qıladır,
Quru qalsın el dərkarı olmasa.

Haq hər kəsə bir yaxşı yar verməz ki,
Sözü ahdır, içi qəmdir, gülməz ki,
Yüz yaşasa, beş gün ömür sürməz ki –
Hər kimin münasib yarı olmasa.

Məxdumqulu, haqqa tapşır özünü,
Hər şey üçün gəl saraltma üzünü,
Xahişim var, tərk elə bu sözünü,
Nəyə gərək xiridarı olmasa.

## QƏLƏNDƏR İLƏ

Görərəm səfa mən, tanrıya dilkeş,
Divaneyi-dəhrəm qələndər ilə.
Çəkdiyim nalədir, ürəyim qəmkeş,
Xörəyim atəşdir səməndər ilə.

Cəsədim xoşnüma, ciyərim büryan,
Ürəyim pürqəmdır, gözlərim giryan,
Dilim quş dilidir, surətim insan,
Həmzəbanam bütün nəsnələr ilə.

Fələk kin bəsləyər, əyyam and etmiş,
Dövlətim boynuna qıl kəmənd atmış,
İqbalım, işığım, bəxtim bənd etmiş,
Dışın dəmir, için simuzər ilə.

Hacətim ver, ya haqq, eylə tədbirim,
Məqsədim şanına toxuna tirim,
Dərməndə qalmışam, eylə dəstgirim
Xıdır ata, İsa peyğəmbər ilə.

Məxdumqulu deyər, yer üzün üzsən,
Axırı ölümdür dünyanı düzsən,
Üç yüz əlli altı il aləmi gəzsən,
Filkus oğlu şahi-İskəndər ilə.

## VARDIR

Gündə yüz min köç olsa ol dünyadan,
Ol miqdar dünyaya gələn də vardır.
Yüz min axmaq olub, getsə rayinə,
Yüz min özün yola salan da vardır.

Yüz min dərviş sinə dağlı oturan,
Riyazətdə beli bağlı oturan,
Neçə yerdə görsən, ağlar oturan,
Neçə yerdə biqəm gülən də vardır.

Seyran etsən bu dünyanın dörd bürcün,
Qarışıbdır halal, haram, ərvah, cin,
Neçələr təmizlər, yol gedərlər çın,
Neçə yüz min gümrah olan da vardır.

Uğursız əyyamlar, anlamaz ərlər,
Kaş soran olaydı, saçaydım dürlər,
Hanı ol Süleyman, Rüstəmlər, şirlər,
Demə, pusub, susub qalan da vardır.

Məxdumqulu, qəlbə qayğı gətirmə,
Bu bir iş vaxtıdır, özün itirmə,
Sözüm anlayan yox deyib oturma,
Cahan gendir, çəndan bilən də vardır.

## GƏLMƏZMİ

Fələk, sənin bu dövlətli gərdanın
Bizə sarı çevrilməzmi, gəlməzmi?
Leşin yerə saldın neçə mərdanın,
Zəmin insaf eyləməzmi, dolmazmı?

Dünya, sənin at işləməz gərdişin,
Qızıl qandan qırmız olubdur dişin,
Keçi-qurd dostluğuna bənzər edişin,
Qəmli şad olmazmı, ağlar gülməzmi?

Oraqsız biçərsən, tiğsiz kəsərsən,
Yumruqsuz əzərsən, ipsiz asarsan,
Əl-ayaqsız bir bixəbər basarsan,
Yıxan basar yatar, dönüb gəlməzmi?

Fələk səni udar vuruşsan, söysən,
Gövdəni götürüb, qanadın yaysan,
Bu zülmü bir şəxsin boynuna qoysan,
Qorxusundan saralmazmı, solmazmı?

Məxdumqulu, hər səhərdən, səbadan,
Xali olma bu nalədən, duadan,
Bütpərəstlər bütdən alsa muradın,
Haqdan dilək diləyənlər almazmı?

## GEDƏCƏK

Bu dünya fanidır, tutmaz binanı,
Bu dünyaya gələn keçib gedəcək.
Kimdir kainatda tutan cahanı,
Tutanın əllərin açıb gedəcək.

Şirin-şirin salar hesaba dünya,
Acı-acı qoyar əzaba dünya,
Yetilməz, tutulmaz bu qəhbə dünya,
Tutdum-tutdum desən, qaçıb gedəcək.

Dövrlər dolanar, gərdişlər dönər,
Neçələr köçərlər, neçələr qonar,
Neçənin məşəli təzədən yanar,
Neçənin çırağı sönüb gedəcək.

Kimi haqdan qorxub, rəngi saralıb,
Kimi dünya qovar, yüyürüb, yetib,
Kimi yüz həsrətdə, kimisi gülüb,
Kimi gözdə yaşın saçıb gedəcək.

Kimi bəyliyində düşməz eyvandan,
Kimi yoxsulluqda yox olar candan,
Kimi haram bilib, tez qaçar bundan,
Kimi araq, şərab içib gedəcək.

Kiminin həyatı işrətdə keçib,
Kimisi haramı halaldan seçib,
Kimi fərq qoymadan hər işi edib,
Gözü bağlı quş tək uçub gedəcək.

Kim qaçsa düşəcək fələk dalına,
Dodağın həsrətdir dünya malına,
Bir gün orağını alıb əlinə,
Quru-yaş demədən biçib gedəcək.

İki gün xoş olsa, üç günü vaymış,
Neçəsi mənzilmiş, neçəsi caymış,

Bu dünya sanki bir karvansaraymış,
Gələn yük yazdırıb, keçib gedəcək.

Məxdumqulu deyər, tikan yox, gül yox,
Nə igid, nə qoca, nə şah, nə qul yox,
Dilənçi, dərməndə, bay yox, yoxsul yox, –
Hamı yer qoynunu qucub gedəcək.

## GƏZƏMƏK İLƏN

Yetmiş yaşlı qardaş, əl vurma yaya,
Oxun dolu keçməz gəzəmək ilən,
Güvənmə kəsəkdən qurulan öyə,
Kəsək bina tutmaz düzəmək ilən.

Adəmzaddan çıxar adamlıq işi,
Qəlp adamın nə qızılı, nə misi,
Möminə azardır adamın pisi,
Dönüb, dava edər duz-çörək ilən.

Uzaq yola bidövləti baş etmə,
Allahın əmrindən könlün dış etmə,
Axmağa sir verib, sirrin faş etmə,
Xəlbirdə su durmaz gözəmək ilən.

Dost tutma qocalmış kosa xəsisi,
Vara yox deyəcək, boşdur kisəsi,
Birivar boş etsə ağlın kasasın,
Nə fayda dışından bəzəmək ilən.

Əvvəl, Məxdumqulu, özünü düzət,
Xalq dünya dersə, sən məhşərə göz et,
Az yegil, az yatgil, sözünü az et,
Nə var mənasız söz uzamaq ilən.

## ƏLİF QƏDDİN DAL OLAR

Adəm oğlu, bu dünyada gəzərsən,
Bir gün sənin əlif qəddin dal olar.
Qafil olma, doğru yoldan azarsan,
Bülbül kimi ötən dilin lal olar.

Axır zaman olsa, fitnələr dursa,
Zalımlar yamanlıq məclisin qursa,
Padişahlar rüşvət deyib dəm vursa,
Fəqirlərə gün-nəfəqə hal olar.

Yaxşı-yaman, izzət qılar baylara,
Fəqirlər, yoxsullar qalar vaylara,
Hər igid ki, qərib düşsə caylara,
Həsrət çəkər, hər bir ayı ıl olar.

Hər kimsə şəriət yolun bilməsə,
Alimlərin sözün gözə almasa,
Qırx yaşında kişi tövbə qılmasa,
Onun işi hiylə, məkr, al olar.

Hər igid ki, qərib düşsə vətəndən,
Xəbər sorar hər bir yoldan ötəndən,
Naçar qalıb hacət dilər yetəndən,
Hacəti bitməsə, qeylü-qal olar.

Gəl, ey dostum, çəkmə qayği-qəmi sən,
Axıtma gəl gözlərindən nəmi sən,
Bu dünyada qənimət bil dəmi sən,
Qayğı çəksə, igid başı çal olar.

Məxdumqulu, nəsihətlər düzərsən,
Xəlayiqin ürək-bağrın əzərsən,
Lakin özün doğru yoldan azarsan,
Rüstəm olan bir gün piri-Zal olar.

## TÖKÜB GEDƏCƏK

Qəm dumanı basıb qərib könlümü,
Gözüm yaş saxlamaz, tökübüb gedəcək,
Kimdir rəhm eyləyən, sorub halımı,
Sınıq könlüm görkün yıxıb gedəcək.

Gərçi od yaxsalar aşiq yağından,
Ölüm asan olar dost fərağından,
Hicran məni qovdu səbr dağından,
Fəraq buğum-buğum söküb gedəcək.

Əvvəl dövranımı çərx bulaşdırdı,
Qəm canım qurutdı, od tutuşdırdı,
Eşq məni yandırdı, həddən aşdırdı,
Ürəyim içimdən çıxıb gedəcək.

Farağat yatırdım nəfsim bəsləyib,
Durdu könlüm yar camalın səsləyib,
Haqdan hacət, haqdan murad istəyib,
Gözüm ol yollara baxıb gedəcək.

Məxdumqulu, macalım yox, söyləyim,
Dostlara dərdimi əyan eyləyim,
Ey yaranlar, ağlamayım neyləyim,
Eşq məni yandırıb, yaxıb gedəcək.

## DIŞ QALDI

Çəkdik zövqü səfa cavanlıq çağı,
Bahar ötüb keçdi, bizdən dış qaldı.
Qocalıq yetişdi min əzab ilə,
Mizan ötdü, xəzan gəldi, qış qaldı.

Ömrümü sərf etdim hay ilə vaya,
Qulluq-taət eyləmədim xudaya,
Misilsiz gəncliyi ötürdüm zaya,
İndi nə güc-qüvvət, nə bir coş qaldı.

Ömrümün qalmadı bir zərrə şadı,
Heç kimsə eşitməz ahı-fəryadı,
Cismim kabab etmiş ayrılıq odu,
Ürəklər qan olub, gözdə yaş qaldı.

Ayrılıqdan cismimə od qalandı,
Gülüm soldu, xəzan gəldi dayandı,
Xəzinəm çapıldı, öyüm talandı,
Nə məndə bir ağıl, nə bir huş qaldı.

Qoydu məni yüz min azara firqət,
Gecəm uzun oldu, dan atmaq – riqqət,
Qüssə ilə gün keçirmək məşəqqət,
Nə canda farağat, nə bir eyş qaldı.

Ayrılıq canıma çox azar verdi,
Rəncü ələm çəkdim, tənim saraldı,
Qüssə ilə saç-saqqalım ağardı,
Nə ruhda şad, nə könüldə xoş qaldı.

Məxdumqulu, işim qeylü-qal oldu,
Şum ayrılıq ilə ağlım lal oldu,
Bilmədim, nə sevda, necə hal oldu,
Can təndən ayrıldı, quru leş qaldı.

## NƏDİR

Yeddi yaşar ərəb atın şanında
Məlum olmaz, təpə nədir, düz nədir.
Ünü yetən qoç igidin yanında
Əlli nədir, altmış nədir, yüz nədir.

Namərd oğlu qorxu çəkər meydandan,
Ağac adam olub görnər hər yandan,
Müxaənəslər xoflu yerdə düşmandan
Secə bilməz, duman nədir, toz nədir.

Süvar olub minər atın bilməyən,
Arif olub öz izzətin bilməyən,
Söhbət içrə söz ləzzətin bilməyən
Duya bilməz məclis nədir, saz nədir.

Məxdumqulu, söz coş edər dilindən,
Müxənnəsə yol vermədin yelindən,
Bu hünərlər gələr, gəlməz əlindən,
Dildən gələn bu cürətli söz nədir?!

## OLA

Geyinməyə köynək istər yalavac,
Köynəkli der: kaş üstündən don ola.
Can sağlığı haqdan dilər qarnı ac,
Durub deyər: kaş tükənməz nan ola.

Ol igid ki, çəkə-çəkə həsrəti,
Səfərə çıxmağa olsa dövləti,
İşdir, əgər tapsa yarağı-atı,
Beşin tapsa, arzu edər – on ola.

Çox nan tapıb, əgər olsa könlü şad,
Qız-gözəldən məhbub istər, həm övlad,
Bu dövləti fayda etsə, adəmzad
Könlü istər, böyük şəhrə xan ola.

Həm xan olsa, həm dünyası tay olsa,
Həm ölməsə, həm əsbabı şay olsa,
Həm verməsə, həm çürüməz bay olsa,
Yaxşı adı həm dünyada dan ola.

Məxdumqulu, görüb düşmən tənəsin,
Mərd oldur, şad tuta qəmdən sinəsin,
Yer yüzü doldurmaz gözün xanasın,
Qarun kimi xəznən necə kan ola.

## NƏ BİLSİN

Üz əlini özün bilməz adamdan,
Anlamaz ol, amü xası nə bilsin,
Nə fayda var xəmir içən gədadan,
Ol əyyaşdır, xeyri, yası nə bilsin.

Yamana yaxşı söz keçməz, hirslənər,
Qanan ərin anlaması güclənər,
İt yalın toprağa töksən xoşlanar,
Toprağı, tabağı, tası nə bilsin.

Bütpərəst min dəfə qılsa namazı,
Ona nəsib olmaz behiştin yazı,
Aləmi götürsə bülbül avazı,
Eşitməz, kar fağır, səsi nə bilsin.

Dinlə sözüm, nər zərbini nər tanır,
Xar baxan xar tanır, məhək zər tanır,
Ey yaranlar, ər igidi ər tanır,
Namərdlər yaxşını, pisi nə bilsin.

Məxdumqulu deyər, sözlərim haqdır,
Amma ki haq sözə tən verən yoxdur,
Bir gözlü deməsə, qaradır, ağdır,
Kor fağır gümüşü, misi nə bilsin.

## BİLMƏDİM

Abdal mənə əbəd camın verəli,
Məscid hansı, mehrab hansı, bilmədim.
Ol güdazda can əriyib yanalı,
Abad hansı, xarab hansı, bilmədim.

Bir kədərə tab etmədim, toz oldum,
Torpaq oldum, atəş oldum, suz oldum,
Dışdan bişdim, içdən yandım, köz oldum,
Od hansıdır, kabab hansı, bilmədim.

Güzər etdim bir məkansız məkana,
Seyran etdim bir meydansız meydana,
Heyran qaldım bir cahansız cahana,
Beyt hansıdır, həm bab hansı, bilmədim.

Nəfsə uydum, özün bilməz hirs oldum,
Aqil işin doğru sandım, tərs bildim,
Hər əşyadan yar sifətin dərs aldım,
Quran hansı, kitap hansı, bilmədim.

Məxdumqulu ol məkanda səs etdi,
Şıxlar durdu, igidlər tək rəqs etdi,
Hər əşyadan yar camalı əks etdi,
Ab hansıdır, şərab hansı, bilmədim.

## DƏYMƏZ

Baylar vardır, qəriblərə rəhm eylər,
Vardır baylar, dünya malına dəyməz.
Gözəl vardır, dünya malın xərc etsən,
Vardır gözəl, yeyən nanına dəyməz.

Dünyada xəsisin üzünü görmə,
Aş ilə nanını nə al, nə vermə,
Qul deyib, igidin əslini sorma,
Xocası var, bəlkə, quluna dəyməz!

Dünya malın versən, yiyəsi satmaz,
Şah istəsə, onun diləyi bitməz,
At var ki, pul versən, bahası yetməz,
At var ki, beldəki çuluna dəyməz.

At gərəkdir ərə savaşda sərxoş,
Yad ilə barışsan, olar qarındaş,
Yaxşı oğul, yaxşı əyal, qız, qardaş —
Bu dövlət hər kəsin əlinə dəyməz.

Məxdumqulu, bu dünyanın işrəti —
Yemək, içmək, minmək, qucmaq, söhbəti,
Bir neçələr müdam qılar taəti,
Neçənin səccadə alnına dəyməz.

## QİYLÜ-QAL OLAR

Bir kişinin iki olsa əyalı,
Gecə-gündüz işi qiylü-qal olar.
Hər birinin vardır yüz min xəyalı,
Ovqat sürüb, görəcəyi hal olar.

Birin söyüb, birin eyləsə naçar,
Elə rüsvay olub, öz aybın açar,
Ağlı heyran olub, varından keçər,
Tən tutmasa yarın, bikamal olar.

Gahi bülbül kimi oxur dilləri,
Tamaşaya hazır edər elləri,
Gahi yer yumruqlar, gahi külləri,
Ərin görə bilsə, dilsiz lal olar.

Qəhr eyləyib, gəlməz olsa yanına,
Söz deməsə hər birinin şanına,
Belə ər qoşulmaz adam sanına,
İki xatın, bir ər – üç əyal olar.

Məxdumqulu, kimsə bilməz batini,
Evlənsəniz, baxıb alın zatını,
Yiyəm görkəzməsin yaman xatını,
Adam özün bilməz, xam xəyal olar.

## GEDİB, GEDƏCƏK

Dostlar, bu dünyaya yoxdur ixtiyar,
Kim gəlibsə, hamı gedib, gedəcək.
Xoş keçir kimiyə, kimi ahü zar,
Qara yer hamını udub gedəcək.

Kimilər qocadır, kimilər yaşdır,
Kimilər varlıdır, kimi qəllacdır,
Məhşərə üz tutan bir ulu köçdür,
Hamımıza əcəl yetib gedəcək.

Fələk bir baqqaldır, dünya bir bazar,
Kimi yaxşı yolda, kimilər azar,
Kimilər Allahdan qılmazlar həzər,
Kimi haqq buyruğun tutub gedəcək.

Kimilər baxşıdır, kimi molladır,
Kiminin dilində ismi-Allahdır,
Hamısına ulu tanrı mövladır,
Kimi şeytan sözün bitib gedəcək.

Məxdumqulu, ümid etmək xudadan,
Yalvarmaq gədadan, əfv etmək şahdan,
Xeyir yoxdur sənə masəvalladan,
Kimi oyaq, kimi yatıb gedəcək.

## HALIMA MƏNİM

Kərəm eylə, ya rəb, qüdrətli sübhan,
Qərib, qəmgin keçən halıma mənim.
Ağlım heyrandadır, olmuşam peşman,
Bilməzlikdə keçən salıma mənim.

Məhşərdə olmasan sən mənə dalda,
Ya rəb, necə olar işim o halda,
İmanım mətahın aparan yolda,
Rəhzənlər qoymagil yoluma mənim.

Din qılıncı vurum, təndə zorum yox,
Möhtaca nan verim, əldə zərim yox,
Bir fəqirəm, səndən ayrı yerim yox,
Bir təsəlli vergil könlümə mənim.

İstəsə tay-tuşlar başa altın tac,
Fəqirlik mülkündən mənə verən bac,
Ya yaradan, etmə namərdə möhtac,
Diləyim, tuş etmə zalıma mənim.

Aciz mənəm, səndən özgə kimim var,
Öz verən canına cəbr etmə, cabbar,
Məxdumqulu deyər, kərəmli qaffar,
Baxma əməlimə, felimə mənim.

## HİCRAN HANSI, BİLMƏDİM

Fələk mənə qəm badəsin verəli,
Vüsal hansı, hicran hansı, bilmədim.
Haqq işinə tən vermişəm, görəli,
Arzu hansı, ərman hansı, bilmədim.

Bəndə olsan, gözlə haqqın rizasın,
Cəbr eyləsə, çəkməlisən cəzasın,
Əcəl atar bir gün tiri-qəzasın,
Kiriş hansı, kaman hansı, bilmədim.

Bir surətəm, baxman, bu gün özümə,
Arif olsan, qulaq vergil sözümə,
Dünya dibi yox görünər gözümə,
Dövr hansı, dövran hansı, bilmədim.

Az ömrümü çox sevdaya satmışam,
Bu canımı ol dəryaya atmışam,
Nə ümmandır, nə dənizdir, batmışam,
Zəmin hansı, zaman hansı, bilmədim.

Hər kim girsə ol dənizə-ümmana,
Başın alıb çıxa bilməz bir yana,
Qədəm qoydum ol səhraya, meydana,
Can hansıdır, cahan hansı, bilmədim.

Mən dünyanı asmandakı rəng bildim,
İsti-isti anlamadım, son bildim,
İndi onun varın-yoxun mən bildim,
Xeyir hansı, ziyan hansı, bilmədim.

Məxdumqulu, yolun önü, ardı var,
Çəkər yükün, hər kişinin mərdi var,
Ürəyimdə pünhan eşqin dərdi var,
Dərd hansıdır, dərman hansı, bilmədim.

## QALMIŞAM

Cahilliyin coşu çıxdı başımdan,
Mən ol coşdan xali olub qalmışam.
Bir qəmə tuş oldum, getdim huşumdan,
Bu dərd ilə dolu olub qalmışam.

Başım yüz həvəsdə, könlüm coşğunda,
Girdaba düşmüşəm dəli daşqında,
Nəcd dağında gəzən Məcnun eşqində,
Yanar odlu Leyli olub qalmışam.

İgidlik fəslini qışa yetirdim,
Kamillik gəmisin suda batırdım,
Böyük fikrə qaldım, ağlım itirdim,
El içində dəli olub qalmışam.

Bu dünyanı köçüb varan köç bildim,
İşini bəd sandım, özüm puç bildim,
Önün oyun gördüm, sonun heç bildim,
Diri ikən, ölü olub qalmışam.

Məxdumqulu, faş eyləgil sözünü,
Fələk müşti-xak etməyən gözünü,
Bu vaxtacan gənc bilərdin özünü,
İndi gör, bax, ulu olub qalmışam.

## QIZMALI OLDUM

Eşq dəryası doldu, daşdı, qaynadı,
Təzə xüruc edib qızmalı oldum.
Könül taxtı dalğa üstə oynadı,
Onda qəvvas olub üzməli oldum.

Yatırdım düş gördüm, diksindim, durdum,
Eşq bir müşkül işdir, oxudım, gördüm,
Şövqün şirin gördüm, bu yola girdim,
İndi çarə yoxdur, dözməli oldum.

Yarın yeli əsdi, özü gizləndi,
Ümid əlin gərdi, bunca gözləndi,
Hicran qüvvətləndi, eşq ekizləndi,
Ol mətbəxdə qaynar, qızmalı oldum.

Bu fikirdən, bu xəyaldan dış olub,
Nəfsi-hava, kibr, kindən boş olub,
Ol bazarda eşq talana tuş olub,
Bəlli, candan ümid üzməli oldum.

Qana-qana içdim dostun zəhrini,
Zəhrin şəfa sansam, salmaz mehrini,
Bu gövdədə duran könül şəhrini
Eşqə nökər olub pozmalı oldum.

Məxdumqulu, ol mənzilə, diyara,
Girən bir də çıxa bilməz kənara,
Ey yaranlar, varmı bu dərdə çarə,
Alışıb, tutuşub gəzməli oldum.

## NEYLƏYİM

Könlüm istər gəzə dünya-aləmi,
Qanadım yox, uça bilməm, neyləyim?!
Oxuyub görürəm feyzi-kəlamı,
Mənasını saça bilməm, neyləyim?!

Çoxlar onda qəvvas olub üzərlər,
Mənə zahir, xalqdan pünhan gəzərlər,
Gül badəyə gülgün şərab süzərlər,
El uzadıb içə bilməm, neyləyim?!

Öy dışında şərab içib nuş qıldım,
Getdi ağlım, özüm bilməz, coş qıldım,
Mey-məst oldum, bir qapıya tuş oldum,
Rüxsət olmaz, aça bilməm, neyləyim?!

İtdi yolum, dağ hansıdır, düz hansı,
Anmaz könlüm nəğmə hansı, söz hansı,
Fəhm eyləməm, yol hansıdır, iz hansı,
Ümid üzüb qaça bilməm, neyləyim?!

Məxdumqulu, bu dünyanın hamısın,
Yığıb, dürüb, yelə verdim namusun,
Fikir dəryasına ağlım gəmisin,
Batırmışam, kecə bilməm, neyləyim?!

## TAPMAZSAN

Neçə işi ağıl ilə cəm etsən,
Fələk çaşır, bir gün hesab tapmazsan.
Bu can sağlığında xeyir qazangil,
Yer altına girsən, səvab tapmazsan.

Burda nə iş etsən, orda soraqlı,
Yaxşıdan daim al öyüdü, ağlı,
Ucal pillə-pillə, ey adəm oğlu,
Alimlər azalsa, ədəb tapmazsan.

İyirmi yaşında ərin nə qəmi,
Yıxar dağı, daşı, əridər dəmi,
Bir gün ötər igidliyin mövsümü,
Yüz ağla, yüz ara, cavab tapmazsan.

İgid olsan, gəzgil yaxşı ad ilən,
Köhlən minib, gəzgil pərizad ilən,
Ömrünü ötürgil cəmaət ilən,
Məscidi yıxılsa, mehrab tapmazsan.

Məxdumqulu, deyər əcəb coş etdi,
Ərənlər söhbətdə bir gün tuş etdi,
Bir kasa mey verib gülgün, nuş etdi,
Hər gün kasa dolu şərab tapmazsan.

## ANLAMAZ

Bədəsilə bəylik yetsə bir gündə,
Alar ovun, salar quşun anlamaz,
Yarlığı yürüyən mürvətsiz bəylər,
Füqəra gözündə yaşın anlamaz.

Bələd başlar doğru yola çın ilə,
Aqil igid söz başlamaz «mən» ilə,
Namərd adam gənəşər zənən ilə,
Qoç igidlər zənən işin anlamaz.

Mərddən dilək etsən deyər: «Xub olar»,
Bir bəxşişdən yetmiş bəla dəf olar,
Müxənnəs gənəşi evdə çox olar,
Düşmən görsə, bu vərdişin anlamaz.

Haq yolunda kim xeyrat, ehsan qılar,
Qiyamətdə bir yerinə on gələr,
Namərd düşmən görsə, qüssədən ölər,
Qoç igidlər dördün, beşin anlamaz.

Məxdumqulu, bəy yanında dil başlar,
Qılıncı, qeyrəti olan el başlar,
Mərddən qardaş yığın görsə, yol başlar,
Namərd oğlu tayın-tuşun anlamaz.

## SİRR GEDƏR

Çox namərdə mal veribsən, dun dünya,
Gözü göydə, qayğısı yox, sirr gedər.
Hanı ağlın, oda düşüb yan, dünya,
Nə mərdlər var, yoxsulluqda xor gedər.

Az ömrünü sürsən əlvan işrətdə,
Şirin canın qalar uzun həsrətdə,
Axmaqlar bu yerdə qalar qəflətdə,
Aqil olan öz qəmini yer gedər.

Nə doğru gələnə mehrin endirdin,
Nə də gəlməyənə salam göndərdin,
Heç fərqi yox səndə mərdin, namərdin,
Aslan ötər, tülkü keçər, şir gedər.

Gələn fayda dilər dünya şəhrindən,
Canın verib, quru qalar qəhrindən,
Dünya mardır, ol ilanın zəhrindən,
Tük tökülər, qanad sınar, pər gedər.

Dünya zənən, çox oynaşlı, əri bir,
Bir öpüşdə ətin, qanın sorub yer,
O dünyada şahla gəda, hamı bir,
Burda kimin nəyi varsa, qor gedər.

Adəm oğlu, çox düynanın yalanı,
Doğru sanma əyri baxıb güləni.
Fikirləşmə az verib çox alanı –
Borc malıdır, aldın, geri ver, gedər.

Məxdumqulu, güclü ilə dalaşma,
Xeyri qoyub şər işlərlə uğraşma,
Yaxşı-yaman sözüm çoxdur, qarışma,
Çünki hər kəs bildiyincə der gedər.

## İRAQ EYLƏ ÖZÜNÜ

Dəli könlüm, məhəbbətsiz kişidən
Dış eyləyib, iraq eylə özünü.
Sevəni sev, sən sevənə ol rəfıq,
Sevməyəndən iraq eylə özünü.

Gidi namərd, getsə xidmət bitirməz,
Qədir bilməz, mərd bəhasın yetirməz,
Bir sirri söyləsən, içdə yatırmaz,
Sirdaş olma, iraq eylə özünü.

Xain kişi zər versə də xas olmaz,
Haqdan xofu yoxdur, onda rast olmaz,
Boynun burub, ərzin desən dost olmaz,
Sərxoş olma, iraq eylə özünü.

Sən inanma bu namərdin dilinə,
Altın-gümüş, xərac vermə əlinə,
Çöldə başın alıb gedər yoluna,
Yoldaş olma, iraq eylə özünü.

Məxdumqulu deyər, dava et dərdə,
Canım qurban olsun tanıyan mərdə,
Ağzı gülüb, qəlbi xain namərdə,
Qardaş olma, iraq eylə özünü.

## YAĞIDIR-YAĞI

Dünya düşmən dürur, qafil adəmzad,
Mal ilə övladı yağıdır-yağı.
On səkkiz min derlər külli aləmi,
Günahı, fəsadı yağıdır-yağı.

Qul-qarabaş, malın, atın-eşşəyin,
At-yaraq, əsbabın, donun, quşağın,
Sevgili xatının, oğlun-uşağın –
Dünyanın hər zadı yağıdır-yağı.

Bəradərlər, başım qurban etsələr,
Cömərdlər aç olub, gözdən itsələr,
Malsız-halsız quru adı tutsalar,
İgidin şol adı yağıdır-yağı.

Dünya bir saraydır, saz ilə söhbət,
Sipahiyə – dəstgah, şahlara – şövkət,
Şahlardan dolansa ərkana dövlət,
Gələn varidatı yağıdır-yağı.

At qocalsa, qalar yemdən, qaçmaqdan,
Böri dişdən qalar, qartal dırnaqdan,
Baylar pis görünər quldan-qırnaqdan,
Bəndisi, azadı yağıdır-yağı.

Qaragöz balalar, evin uşağı,
Canına bəladır xəstəsi-sağı.
İgidlik gülşəni açılan çağı,
Dəysə xəzan badı, yağıdır-yağı.

Məxdumqulu, həqiqətdən süz sözün,
Bu gözün görəni görməz ol gözün.
Hər şeyin yığaraq, qoygil məcazın,
Bir haqdan özgəsi yağıdır-yağı.

## TUT

Dünya görməz, tutqun qalsan bir küncdə,
Badi-pa tək yer üzünə gəldim tut.
Çin-Maçində, Rumda, hinddə, həbəşdə
Olan-olmuş hünərləri bildim tut.

Ac da olsan, varma yada diləyə,
De: «Köşkdəyəm, başım çatmış fələyə»,
Çöldə qalsan, heç tapmasan bir sayə,
İrəm bağı içrə sayə buldum tut.

Aş görəndə, özün atma irəli,
Gərçi ac olsan da, tez çəkil geri,
Zər tökübən, bəslə gerçək ərləri,
Tez ölsən də Nuh yaşına gəldim tut.

Möhtaclığın haqdan özgə bilməsə,
Ol ruzigar heç üzünə gülməsə,
Hindi kimin əynin-başın olmasa,
Sən şahların xələtini geydim tut.

Suya, yelə hökmü keçən Süleyman,
Baxsan, ondan nə nam qaldı, nə nişan,
Təşnə qalsan, yerin olsa çölüstan,
Dərya içrə mən İskəndər oldum tut.

Yoldaş olsan dilə düşməz mur ilə,
Fərş tapmayıb yerdə yatsan mar ilə,
İyirmi altı kərə yüz min ər ilə
Qarun xəzinəsin ələ aldım tut.

Məxdumqulu, çəksən cəfa, cəbr, bil,
Xudaya xoş gələr, şükr, səbr, bil,
Bu qıl cana qızıl təni qəbr bil,
Qızıl dilin sözlər ikən öldüm tut.

## YAR EYLƏR

Ağlın olsa, yaxşılara həmdəm ol,
Axmaq özün nadan ilə yar eylər.
Haqq aşiqi nazlı yarın camalın
Görmək üçün gecə-gündüz zar eylər.

Əgər sirrim olsa, deyərəm mərdə,
Karvan yata bilməz qorxulu yerdə,
Qoy tanrı salmasın çəkilməz dərdə,
Namərdə dərd versə, çəkməz ar eylər.

Namərd öz öyündə mərdə söz atar,
Haqq ona kar etməz, özünü dartar,
Qoç igid mal tapsa, himməti artar,
Namərd varlandıqca könlün dar eylər.

Məxdumqulu, indi özünü gözlə,
Xeyir işin artır, yamanı düzlə,
Ağlın olsa, mərəkədə az sözlə,
Çox söz səni el içində xar eylər.

## YETƏRSƏN

Gələn keçər, qonan köçər, adəmzad,
Yürü, sən də bir mənzilə yetərsən,
Bu dünyada yeydir qalsa yaxşı ad,
Bu dünyaya gəlmiş olsan, ötərsən.

Qafil adam yada salsın əslini,
Unutmasın gəlib keçən nəslini,
Fələk bilir əkən-biçən fəslini,
Orta yerdə sən nə işlər tutarsan.

Cəfa qoyma, qayıtmaz ki bu canın,
Bataqlıqdır hər tərəfi cahanın,
Tərpəndikcə bataqlığı dünyanın,
Qədəm qoysan, gövdən ilə batarsan.

Coşğun gəldi, həddin keçdi, söz açdı,
Doğru yoldan doğru gedən düz aşdı,
Bihudə deyildir ömrün güzəşti,
Hər çeştinə bir gününü satarsan.

Aldığı nə - al qumaşdır, simu zər,
Satdığı nə - dərdü əzab, qəm-kədər,
Dünya bazar, fələk, sən bir sövdəgər,
Məlumdur ki, bu alverdə udarsan.

Məxdumqulu, başında yüz köy vardır,
Ayrı mənzil, ayrı məkan, cay vardır,
Məzar adlı dar, döşəksiz öy vardır,
Ol öy içrə məhşərəcən yatarsan.

## YEL İLƏ

Göz, könül, dil, ağıl – qaldı bu dördü,
Can vətən arzular, durdu yel ilə.
Xahişim var, gəl, tərk etmə bu yurdu,
İşrət sürgil, söhbət qurgil gül ilə.

Bir əcəb mənzildir, ümidin üzmə,
Könlünü soyutma, vətəndir, qızma,
Dükanın dağıtma, bazarın pozma,
Tən mülkündə bir neçə gün qal ilə.

Mehman oldun bu dünyanın öyünə,
Könül verib getmə onun küyünə,
Başın bağlar, məşğul edər oyuna,
Getsən verməz, aldadar yüz dil ilə.

Burda qul ol, var ol cahan sənindir,
Əlvan nemət, tazə büryan sənindir,
Behişt, Buraq, huri-rizvan sənindir,
Asi adam, doğru getsən yol ilə.

Fələk qoymaz bu gəzdiyin sarayda,
Qurdla qoyun müdar etməz bir öydə,
Dünya dolu xəznə yığsan nə fayda,
Düz mal oldur – sərf edəsən el ilə.

Göyü büküb yazsa yerin üzünü,
Qurd qanrılıb qapa bilməz guzunu,
Mübarizlər tuta bilməz özünü,
Fil də durar, bağlasalar qıl ilə.

Məxdumqulu haq qulluğun bitirsə,
Ər ol olar – əmrin bərcay gətirsə,
Mövlam özü divan üçün otursa,
Milçək durub dava edər fil ilə.

## EHSAN HANSI, BİLİNMƏZ

Dərdim çoxdur diyarımdan, dövrümdən,
Xeyir hansı, ehsan hansı, bilinməz.
Zalımların cəfasından, cəbrindən
İslam hansı, iman hansı, bilinməz.

Söhbətlərdə haq kəlamı söylənməz,
Məclislərdə bir nəsihət eylənməz,
Halal hansı, haram hansı, söylənməz,
Xeyir hansı, ziyan hansı, bilinməz.

Xəlaiqdə görənək yox, görüm yox,
Baylarında səxavət yox, verim yox,
Əyallarda həya, qızda şərim yox,
Ədəb hansı, ərkan hansı, bilinməz.

Başqasının mal-mülkünü aldırar,
Təəssüblə qəlbinə kin doldurar,
Bir-birini nahaq yerə öldürər,
İnsaf hansı, aman hansı, bilinməz.

Məxdumqulu, can mehmandır, gövdə leş,
Yaxşıya dost çoxdur, pisə - yox qardaş,
Bu əyyamda baş ayaqdır, ayaq - baş,
Yaxşı hansı, yaman hansı bilinməz.

## BƏYLƏR

Mərd ilə namərdin işi tən gəlməz,
Namərdlər savaşda ziyandır, bəylər,
Namərd qoç igidin qədrini bilməz,
Namərdin hər işi virandır, bəylər.

Kamil qoç igidin haqqını yeməz,
Dünya malın versən, namərdlər doymaz,
Namərd məsləhətə, gənəşə uymaz,
Namərdin hər işi əyandır, bəylər.

Bir atada altı ata soyu var,
Bir nadanın yüz xəyallıq suyu var.
Qoç igidlər harda varsa öyü var,
Namərdin öz öyü zindandır, bəylər.

Dövlət başa gəlsə, dost-yarın görməz,
Qəza gəlsə, bağrın yerdən götürməz,
Haqdan deyər, ancaq iman gətirməz,
Məxdumqulu, böylə zamandır, bəylər.

## ÖTƏNDƏ

Gəl güvənmə bu dünyanın malına,
Malın burda qalar, özün ötəndə.
Varın keçər varislərin əlinə,
Paylaşarlar əcəl yaxan tutanda.

Hamı getdi, burda tayın-tuşun yox,
Məscid ilə, mehrab ilə işin yox,
Rövzə ilə, namaz ilə xoşun yox,
Nə deyərsən ol mənzilə yetəndə.

Diş tökülüb, artıq tutmaz dizlərin,
Oğluna-qızına keçməz sözlərin,
Dünya həvəsindən doymaz gözlərin,
Gözün doyar ayın-günün batanda.

Ey adəmzad, bir gün odda yanarsan,
Bir şüşəsən, bu gün-sabah sınarsan,
Bir gün olar ağac ata minərsən,
Durammazsan qum altında yatanda.

Qüvvə qalmaz, bel bükülər, huş gedər,
Kimi naxoş gedər, kimi xoş gedər,
Məxdumqulu iki əlin boş gedər,
El yığılıb tabutunu tutanda.

## SEVMƏK İLƏNİ

Eşqin odu xüruc alıb badlanır,
Heç sönməyir, yarım, sevmək iləni.
Yeni başdan dərd atına atlanır,
Heç getməz qapımdan qovmaq iləni.

Bədəsildə ağıl olmaz, dərd olmaz,
Min tülkü yığılsa, bircə qurd olmaz,
Namərd kişi ta ölüncə mərd olmaz
Tərif edib onu öymək iləni.

Yaxşı ər qədrini öz eli bilməz,
Başına iş gəlsə, yanına gəlməz,
Ol mərd igid zarlar, dərdi əskilməz,
Dad edib «Ya elim» demək iləni.

Balıqçı der: salım var da, suyum yox,
Namərd mehman görsə deyər: öyüm yox,
Bil, insan oğluna maldan doyum yox,
Yaxşı geyib yenə yemək iləni.

Dostlar, deyin, zəmin haçan qanarmış,
Pis niyyətdən, pis feldən dönərmiş,
Adəm oğlu bircə onda dinərmiş,
Ol amanat canın vermək iləni.

Dünya, heç bilməzdim belə basarsan,
Sən əlsiz tutarsan, ipsiz asarsan,
Fəraqi, dilin yığ, dilin kəsərsən,
Ağ don geyib yerə girmək iləni.

## RÜSVA CAHANDAN

Könüllər köşkündə biqəm oturan,
On iki kişi var rüsva cahandan.
Arif olub dünyaya söz yetirən,
Gap edərmiş yetmiş iki zəbandan.

Yalavac oturmuş haqqı zarlayıb,
Fələk onu dan-səhərlər varlayıb,
Gündüzü uçarmış göyə parlayıb,
Çox lənət tökərmiş yerə asmandan.

Zəbərdəst pirlərə olmuş xəlifə,
Gündə beş vəqt uçub gedər məğribə,
Zəmindən əzm edər ol afitaba,
Ağlın yetsə soruş bunu Qurandan.

Doqquz il su içməz, nə də aş yeməz,
İyirmi beş il gəzər, cahana enməz,
Əlli il yaş tökər, gecələr dinməz,
Tökən yaşın, varıb sorar ümmandan.

Səksən dörd qulu var, yetmiş əyalı,
Yenə yüz beşində qalmış xəyalı,
Dünyaya sığmayır dövləti-malı,
Ot yeməz heyvan tək doymayır nandan.

On beş ağ öy qurub, taxtın saldırmış,
Yeddi minarəni başdan qaldırmış,
Nərə çəkib aləmə od doldurmuş,
Onca sorub, gözü doymayır qandan.

Gözündə od yanar, ağzında tütün,
Gecələr yeyərmiş özü öz ətin.
Qoparıb sağ gözün, sağala çətin,
Üstünə gələndə keçər imandan.

Məxdumqulu, ağlı olan söz kəsər,
Başqası söz desə, ol nəcis əsər,
Kim bilir, ol nərsə dünyanı basar,
Çoxu naümiddir cəsəddə candan.

## İL İLƏ

Başına gələndir qocalıq qışı,
Heç ayrılmaz aylar ilə, il ilə,
Töküldü dəhandan haq verən dişi,
Yoxdur xoşum şirin sözlü dil ilə.

Nurlu cahan gözlərimə zindandır,
Gecə-gündüz qanlı yaşım rəvandır,
Ürəyim taqətsız, qəlbim ərmandır,
Həvəsim yox, dostlar, qızıl gül ilə.

Ötdü məndən ol igidlik qeyrəti,
Qocaldı, ayrıldı ilxıdan atı,
Fələk başa saldı çıxmaz afəti,
Dizdə qüvvət yoxdur, əyri bel ilə.

Dolandı başıma baqi gərdişi,
Yatsam-dursam çıxmaz dünyanın işi,
Dad edib çəkərəm onca xahişi,
Ömrüm keçib varar altmış sal ilə.

Fəraqi der, yox dünyada həvəsim,
Bircə dində olub qaldı ixlasım,
Zar edib ağlasam, dinlənməz səsim,
Heç arzum qalmadı gözəl il ilə.

## MƏRDAN HANSI, BİLMƏDİM

Mərd gözləyib öz elimdən çıxmışam,
Eyya dostlar, mərdan hansı, bilmədim.
Qürbətdən ayrılıb, laya çökmüşəm,
Suya girib, ümman hansı, bilmədim.

Qanadsız uçmuşam qarçqay quş olub,
İndi biqədirəm, qara daş olub,
Kitab açıb, neçə dinə tuş olub,
İslam hansı, Quran hansı, bilmədim.

Bir gapa duşmüşəm, aça bilməzəm,
Qanadsızam, göyə uça bilməzəm,
Taqətsizəm, yurddan köçə bilməzəm,
Cəfa hansı, dövran hansı, bilmədim.

Məğlub oldum fələklə ox atışıb,
Ayaqlara düşdüm, yaxa tutuşub,
Səhər çağı bir mehraba sataşıb,
Namaz hansı, əzan hansı, bilmədim.

Qaplana uğrayıb, tuş oldum qurda,
Özüm bilməm, nə edirəm mən burda?
Çox sözləyib, düşdüm çarəsiz dərdə,
Loğman hansı, dərman hansı, bilmədim.

Ürəyimdə qalar oldu ərmanım,
İsa, Mehdi, Loğman bilməz dərmanım,
Məxdumqulu deyər, dostum-yaranım,
Kəlam hansı, dastan hansı, bilmədim.

## GÖRÜNMƏZ

Durgil, Cəbrayıldan xəbər sorayım,
Nə səbəbdən gözəl yarım görünməz?
Dolanıb qapına gündə varayım,
Əhdi-peyman – ol iqrarım görünməz.

Fələk, çərxi-dövran biqərar gəlmiş,
Namusdan dış düşüb, haqdan utanmış,
Çox gənclərlər qocalıb, qoca gənc olmuş,
Çırağım sönübdir, narım görünməz.

Xəsislər mərd olub, gəda şah olub,
Mərdlər namərd olub, pir dindən qalıb,
Əzanlar kəsilib, məscid yapılıb,
Haqdan özgə bir azarım görünməz.

Məxdumqulu deyər, bu nə hekayət,
El varı alimdır, tutmaz nəsihət,
Asmandan enibdir zəminə afət,
İsa, Mehdi, Məlik Əjdər görünməz.

## İNDİ

Səf tutuşub, heybət atar tülkülər,
Arlı pələng, ölər olsan, öl indi.
Arif olub, məst olubdur „bilgələr”,
Alim molla, bilər olsan, bil indi.

Çılpaqlar geyinıb, açlar doyubdur,
Qarun tövbə edib, felin qoyubdur,
Nadan: «Quran bunu deyər»... deyibdir.
Quran, savaş salar olsan, sal indi.

Bir söz ilə yanan bağrım yandırdın,
Ciyərdən ayırdın, beldən sındırdın,
Üz görkəzməz, xoş söz ilə qandırdın,
Nazli yarım, gələr olsan, gəl indi.

Məxdumqulu çaşıb, lala dönübdür,
Yandı təni, canı, külə dönübdür.
El içində adı qula dönübdür,
Xoca, seyid, bilər olsan, bil indi.

## DƏRD NƏDİR

Ağıl, göz, həm iqbal, iman, bu dörd şey
Uzaq olsa, dərman nədir, dərd nədir.
Ər igidin olmaz üzdə pərdəsi,
İqbal yatsa, namərd nədir, mərd nədir.

Yaxşı dərdə düşər, ağlar yamana,
Namərd qara görsə, gələr amana,
Nəsib olsa, minsə yorğa madyana,
Tanıyammaz, başı nədir, art nədir.

Namərd çaşar, kürən ilə baş olsa,
Aybın açar, öz elindən dış qalsa,
Sərxoş olan qoç igidə tuş olsa,
Çalar qılınc, üçü nədir, dörd nədir.

Rüstəm Zal ad aldı, atlanıb atın,
Nə ziyad iş etdi, deyin, qeyrətin,
Pələng qəzəblənib vursa heybətin,
Dura bilməz, bars nədir, qurd nədir.

Məxdumqulu, dönər fələyin çərxi,
Tanırsan şol zaman tuş gələn nırxı,
Namərdin yanında yox elin fərqi,
Felin gözlər, məkan nədir, yurd nədir.

## YETDİN

Bir gün atan eşq etdi,
Sülbündan cuşə yetdin.
Əvvəl sudun, qan oldun,
Qandan son leşə yetdin.

Hökm eylədi ol xuday,
Doqquz saat, doqquz ay,
Yeddi əndam caybacay,
Sünnə ulaşa yetdin.

Guş verdi, dəhan verdi,
Dəhana zəban verdi,
Ağıl verdi, can verdi,
Göz verdi, qaşa yetdin.

Yaşdın, ələ ulaşdın,
Yürüb, yola ulaşdın,
Sözlə dilə ulaşdın,
Nan yedin, aşa yetdin.

Yeddində məktəb gördün,
Oxudun, yolun bildin,
Qız ilə bazı qurdun,
Ta on dörd yaşa yetdin.

Haq verdi, yeyib-içdin,
Hər yola bir baş qoşdun,
Məhbub ilə sevişdin,
Elə çolaşa yetdin.

İyrmi dörd yaşa gəldin,
Igid olub, sən yeldin,
At mindin, qılınc aldın,
Cəngə-savaşa yetdin.

Otuzunda yerindən,
Duman getməz sərindən,

İgidliyin zorundan,
Gəzdin tamaşa yetdin.

Sürdün, dünyanı sürdün,
Axır vəfasın gördün,
Qırxına qədəm vurdun,
Kamil sən, huşa yetdin,

Var almadın bağından,
Xəzan vurdu tağından,
Əlli, saqqal ağından,
Utan, bir yaşa yetdin.

Altmışa yaş yetirdin,
Başın qəmə batırdın,
Xoş günlərin ötürdün,
Yazın yox, qışa yetdin.

Yetmişdə aşdan qaldın,
Qüvvətin yox, yıxıldın,
Qocaldın, işdən qaldın,
Söylə, nə pişə yetdin.

Səksənə yetişsə sal,
Necə keçər böylə hal,
Ötdü ol coşğun mahal,
Oraqsız xoşa yetdin.

Doxsanda yanılar söz,
Qara rəngi görər boz,
Tamam nurdan düşər göz,
Yüz min əndişə yetdin.

Məxdumqulu oturdun,
Ömrün qafil ötürdün,
Haqçün nə iş bitirdin,
Əgər yüz yaşa yetdin.

## MƏNA BİLMƏZ YAŞINDA

Ey yaranlar, adəmzad
Məna bilməz yaşında
Biqəm olar dünyada,
Dördündə, ya beşində.

Beşində bəydir, bilməz,
Dünyanı gözə almaz,
Zərrə qayğısı olmaz,
Gəzər oyun daşında.

Əgər ki on yaş gələr,
Cavanlıqdan huş gələr,
Yemək-içmək xoş gələr,
Küy çox olar başında.

On beşə yetsə salı,
Uçar könül xəyalı,
Əsər cavanlıq yeli,
Cüvan görər düşündə.

Cüvanlıq odu yanar,
Cavanlıqdan nırx dönər,
Hər gün bir eşqə minər,
Ol iyirmi yaşında.

Gözü sataşsa mala,
Uğrarsa xam xəyala,
Gücü gələr kamala,
Otuza ulaşanda.

Cahil olan kəm olar,
Nə ona mərhəm olar,
Qırxda ağıl cəm olar,
Adamzadın başında.

Yaş əlliyə gedəndə,
Olar qoca adında,

Ölüm olar yadında,
Diqqət edər işində.

Düşmüşəm sevdaya der,
Sevdalı qovğaya der,
Keçdi ömrüm zaya der,
Ah edər altmışında.

Yetmişində «ah»lanar,
Can cəsəddə saxlanar,
Qayği-həsrət çoxlanar,
Asta olar işində.

Qüvvəti yox tutanda,
Dincəlmməz yatanda,
Yaş səksənə çatanda,
Tanımaz uğraşanda.

Çıxmaz içərdən dışa,
Baxmaz qohum-qardaşa,
Ölü derlər ol kişə,
Yaş doxsandan aşanda.

Məxdumqulu hümməti,
Qalmaz qədir-qiyməti,
Peyğəmbərin ümməti,
Heç olar yüz yaşında.

## GƏRƏK

Nə bəlasan, adəmzad,
Çılpaq doğdun, don gərək,
Ağ süd əmdin, böyüdün,
Ağlayırsan, nan gərək.

Atan xoşnud olmağa,
Anan mehrin salmağa,
Yeddində din bilməyə,
Oxuya Quran gərək.

Əgər seçsən dilbəndin,
Bərkiyər belin, bəndin,
On beşdə arzuməndin,
Qız gərək, cüvan gərək.

Cüvan tapdın qucmağa,
Eyşi-işrət açmağa,
Sonra yeyib-içməyə,
Bir tükənməz nan gərək.

Könlün incidib xəlqin,
Xoşnud etsən öz xülqün,
Rum, Firəng olsa mülkün,
Hənüz «azdır», kan gərək.

Yatsan döşəkdə bimar,
İsti etməz malu kar,
Zər töksən xalvar-xalvar,
Gözə gəlməz, can gərək.

Dua ilə ər göyər,
Yağmir ilə yer göyər,
Ər oldur – alqış alar,
Yerlərə varan gərək.

Əcəl gələr rəydə yox,
Görmək ildə, ayda yox,

Heç bir zaddan fayda yox,
Bir nuri-iman gərək.

Məxdumqulu, sözləyən,
Neçə məxfı gizləyən,
Bir məna fəhm eyləyən,
Ağıllı yaran gərək.

## ÖTƏR BU DÜNYA

Xoşca qalın, yarlar, dostlar, yaranlar,
Güvənmə, hamıdan ötər bu dünya.
Çarə tapmadılar ötən vəlilər,
Hamının başına yetər bu dünya.

Birini şah edər, verər çox rəvac,
Neçələri ağlar, bir pula möhtac,
Heç kim çarə tapmaz, ötər naəlac,
Hər kəcə yüz ələm verər bu dünya.

Nəzər etsə para edər daşları,
Neçəsinə ağı edər aşları,
Neçələri alıb əziz başları,
Onları qürbətə atar bu dünya.

Nurundan yaratdı İsanı cabbar,
Ərk özündə, hər nə qılsa, Birivar.
Bir qəribəm, səndən özgə kimim var,
Məni çox zəhmətə salar bu dünya.

Həzrəti Adəmi eylədi heyran,
Həvva cüda düşdü, gözləri giryan,
Xudaya sirr dedi həzrəti Loğman,
«Diləyim: tuş etmə namərdə, dünya!»

Həzrəti İskəndər, hanı Süleyman,
Axırda oldular əhli-goristan,
Hanı Söhrab, Vərzu, Rüstəmi-dastan,
Hamını oraqla biçər bu dünya.

Məxdumqulu, könlümdə yüz külfət var,
Bizlər bir qazana olduq giriftar,
Yaradan, xar etmə, eylə xəbərdər,
Yoxsa işim ərman edər bu dünya.

## İÇİNDƏ

Fikir qıldım yer-göyü
Ağılsız can içində.
Gördüm can da «Allah!» der,
Ət, sinir, qan içində.

Gedər yolun bilməsən,
Doğru yola gəlməsən,
Haqqı yada salmasan,
Qaldın ərman içində.

Yerdən çıxan nəbatlar,
Qızıl güllər, göy otlar,
Qafil adam, bu zadlar,
Külli fərman içində.

Nəfsin deyər: «Xoş olsam,
Göyçəklərə tuş olsam,
Yesəm-içsəm, xoş olsam,
Yatsam eyvan içində».

Könül, sən bir bazarsan,
Hər işə bir qızarsan,
Dönsəm deyər, gəzərsən,
Cürmi-üsyan içində.

Yayılar qanad-pərlər,
Xub açılar dəftərlər,
Bir bölük kəbutərlər,
«Hu!» der xırman içində.

Bülbül deyər: «Keşiyəm,
Bahara gözləşiyəm,
Gülzar üçün aşiqəm,
Bağı-bostan içində»

Aşiq deyər: «İlləllah!»
Qarışqa «Əlhəmdülillah!»

Ləylək oxur: «Qulhuvallah!»
Xənnan-mənnan içində.

Yarasa der: «Ya mövla,
Saldın məni bu yola,
Vermə ay, günə, yelə,
Saxla pünhan içində!».

Ənqa deyər: «Yolçuyam»,
Hophop deyər: «Elçiyəm,
Süleymana savçıyam
Yalan cahan içində».

Tərlan qalıb heyrana,
Heyran baxıb hər yana,
Turac çıxıb seyrana,
Gəzər dövran içində.

Durna der: «Pər açaram,
Bağdad suyun içərəm,
Qış Hindistan köçərəm,
Taləzaran içində».

Bayquş deyər: «Dərdim var,
Təsbehim var, virdim var,
Viranədə yurdum var
Zari-giryan içində».

İsaq deyər: «Fəqirəm,
Qulluğumga həqirəm,
Haqq yadını oxuram,
Şam-şəbistan içində».

Musaq der: «Gedərəm,
Gəldim, bildim – ötərəm,
Üç ağacı çataram,
Orda, viran içində».

Laçın deyər: «Coşumdan,
Məst oldum öz huşumdan,
Qaldım tanrı işimdən,
Bəndi-zindan içində».

Turac dili sənada,
Ördək dili duada,
Qazlar qalxıb havada,
Gözü ümman içində.

Qumrular avaz ilən,
Tavus işi naz ilən,
Kaknus quş min saz ilən,
Şol Hindistan içində.

Tuti quşlar razlaşıb,
Əmri-haqqı gözləşib,
Adam dilin sözləşib,
Gəzər insan içində.

Turqay həzar yiyəm der,
Əcaib xoş əyyam der,
Duzəx odu haram der,
Axır zaman içində.

Bilməz fələyin fərcin,
Yeldir, tutmuş göy bürcün,
Bir bölücük göyərçin
«Hu!» der xırman içində.

Geyik deyər: «Ağlaram,
Haqqa sidqim bağlaram,
Balalarım dərdindən,
Ürəyim qan içində».

Qurd deyər ki: «Üzərəm,
Hardan olsa keçərəm,
Rizqim arar, gəzərəm
Çöl-biyaban içində».

Yeddi yer olmuş bina,
Hər zat oxur bir səna,
Otlar həm der: «Rəbbəna!»
Novruz-varan içində.

Məşhər günü əlindən,
Xəbər verlər halından,
Qayıt yaman yolundan,
Gördün fürqan içində.

Ümidli ol Yusif tək,
Səbrli ol Əyyub tək,
Gər uğraşsan Yaqub tək,
Dərdi-Kənan içində.

Nəfsim deyər: «Xoş eylə,
Cami-cürə nuş eylə,
Kəraminə tuş  eylə,
Hər an divan içində».

Məxdumqulu, özünə
Bax, yaş gətir gözünə,
Əməl elə sözümə
Yaru yaran içində.

## ATI GƏRƏK

Ad qazanan qoç igidin
Əvvəl bədəv atı gərək.
Gələnə qarşı durmağa
Yaxşı məhəbbəti gərək.

Mərd gərək cəfa çəkməyə,
At gərək zireh sökməyə,
Süfrə yayıb, nan tökməyə
Könlünün hümməti gərək.

Əl götürün xam xəyaldan,
Sizə fayda yoxdur maldan,
Ruzigar keçsə halaldan,
Ariflər söhbəti gərək.

Yürüsə qulluq qılmağa,
Peyğəmbər yolun bilməyə,
Dərvişlər könlün almağa
Əlində dövləti gərək.

Məxdumqulu, bir gədaydır,
Bizi saxlayan xudaydır,
Əgər miskin, əgər baydır –
Gələnə xidməti gərək.

## BƏNZƏR

Oba ucundakı təpə
Yəhərlənən ata bənzər,
Ağılsız ərlər zər ilə
Yazılan bəd xəttə bənzər.

Bu dünya bir dibsiz dərya,
Qərq edər, olma bipərva.
Məğrur olma mali-dünya,
Gəzəkli növbətə bənzər.

Qardaşsıza qüvvət yoxdur,
Oğulsuza dövlət yoxdur,
Əyalsıza işrət yoxdur,
Xoş günü həsrətə bənzər.

Yamandan yaxşı səd olmaz,
Əsli yaxşıdan bəd olmaz,
Dünyalıqdan dövlət olmaz,
Oğul çın dövlətə bənzər.

Bürc ilə duz təzə yara,
Ağı qatar ruzigara,
Yaman xatın yaxşı ərə
Sovulmaz töhmətə bənzər.

Yatan yeri ilan qoynu,
Asılanı itin boynu,
Pis ərin yaxşı xatını
Dürri-biqiymətə bənzər.

Məxdumqulu, namuradam,
Ellər xoşdur, mən naşadam,
Söz mənasın qanmaz adam
Bir quyruqsuz itə bənzər.

## YAXŞIDIR

Adam olsan, qulaq as bu öyüdə,
Alimlər yanında söhbət yaxşıdır.
Atıb-tutan, çalıb-çapan igidə,
Yeri gəlsə aman-mürvət yaxşıdır.

Həmrah olub sən oturma pis ilə,
İşə düşsən, beynin dolar his ilə,
Gövhər daşın üzük etsən mis ilə,
Qiyməti əskilməz, hörmət yaxşıdır.

Zinhar, qəst eləmə yediyin nana,
Könlün xeyrə bağla, sidqin imana,
Heç azar vermə sən bir müsəlmana,
Oğru ərdən bir doğru it yaxşıdır.

Kaş ki adam bu dünyaya gəlməsə,
Əgər gəlsə, ömür sürüb ölməsə,
Əldən gələn yaxşı işin olmasa,
Könül içrə yaxşı niyyət yaxşıdır.

Məxdumqulu, necə keçsə ruzigar,
Haqqa şükr et, getmə namərdə, zinhar,
Yox dövlətdən yeydir, olsa bir hünər,
Min hünərdən zərrə dövlət yaxşıdır.

## RƏBBİYÜL-ƏLA

Ey əmrindən asman indi rükuda,
Sənası: «Sübhana, rəbbiyül-əla».
Bərdər olub yer də vardı sücuda,
Səcdədən sər pozmaz, deyər «Ya Mövla».

Adəmə qəzadır, hay ismin – həlva,
Zəmin sənə döndü, asman həm dəlvə,
Ol sənə eyləcək camalın cilvə,
Zövqi-vəslin çölü döndərdi dərya.

Ey zatından əla eylədi əkbər,
Möminə miratın, mirata bənzər,
Sən sanki məhtabsan, əshabın əxtər,
Tapdı onun tacı ilən ihtida.

Ağıldan bidərdlər füzundur, əzhər,
Oldu huş əhlinə hər vərəq dəftər,
Həmdinə mövcudat olubdur əzbər,
Hər biri bir ayrı dil ilə guya.

Yerində yox ikən, iki cahanı
Qüdrətdən var etdin bir dəmdə anı,
İradən eyləmiş işbu dükkanı,
Bu bazara sənsən danayu bina.

Fəraqi fanidən fərş fərq etmiş,
Bəni-insan yeri cürmə qərq etmiş,
Zər zövqün can xofu rizə tərk etmiş,
Mənşeyi-bəlada mənzili-məva.

## YAĞMUR YAĞDIR, SULTANIM

Sənin tək qadirdən dilək dilərəm,
Rəhm eyləyib yağmur yağdır, sultanım.
Qəribəm, qəmginəm, nalış eylərəm,
Rəhm eyləyib yağmur yağdır, sultanım.

Qadir Allah tökgil rəhmət varanı,
Ikinin həmdəsti, yerin yaranı,
Yerin, göyün, ərşın, kürşün sübhanı,
Rəhm eyləyib yağmur yağdır, sultanım.

Bülbüllər məst olsun, aləm ayılsın,
Qayğılar dəf olsun, qəmlər sovulsın.
Novşirvan vaxtı tək cahan yayılsın,
Rəhm eyləyib yağmur yağdır, sultanım.

Rəhmətin işığı ərşdən açılsın,
Nurun enib, yer üzünə saçılsın,
Qubar köçsün, aləm üzü açılsın,
Rəhm eyləyib yağmur yağdır, sultanım.

Bəndə-biçarəyəm, nə vardır məndə,
Rəhmsən, rəhmansan, kərəm-kan səndə,
Kərəmin olmasa, qaldıq dərməndə,
Rəhm eyləyib yağmur yağdır, sultanım.

Dərgahdan diləyər nalışlı qullar,
Münacat eyləyib, açılar dillər,
Yamanlıq yox olsun, yayılsın ellər,
Rəhm eyləyib yağmur yağdır, sultanım.

Məxdumqulu, eşqin eylər irada,
Eşqini kamal et, qoyma arada,
Yetirgil məqsədə, məhşər – murada,
Rəhm eyləyib yağmur yağdır, sultanım.

## YA ZÜLCƏLALIM

Ya yaradan, qadir, qüdrətli cabbar,
Ərmanda qoymagil, ya zülcəlalım.
Nəfsimin rayında kərəmli qaffar,
Fərmanda qoymagil, ya zülcəlalım.

Tənim dərdli qılma, özümü qəllac,
Könlümü gen eylə, qoyma yalavac,
Zalıma tuş etmə, namərdə möhtac,
Qəm məndə qoymagil, ya zülcəlalım.

Saxlagil qayğıdan, qəmdən, möhnətdən,
Xali qılma dünyalıqdan, dövlətdən,
Namüd etmə şəfəqqətdən, rəhmətdən,
Dərməndə qoymagil, ya zülcəlalım.

Ey ya qadir, səndən qüdrətli kim var,
Kərəmin güclüdür, günahım bisyar,
Bir zalim əlində edib giriftar,
Heyranda qoymagil, ya zülcəlalım.

Fəraqi der, şər də olsa şanımda,
Xeyrə döndər, ərman qoyma canımda,
Əvvəl-axır, dost-düşmənin yanında
Şərməndə qoymagil, ya zülcəlalım.

## NƏSƏN SƏN?

Əsla səni görməmişəm, dildarım,
Qumrumusan, bülbülmüsən, nəsən sən?
Qəmgin könlüm xəyalında aldaram,
Bağ içində gülgülmüsən, nəsən sən?

Qaraçımı, ya seyidmi, xocamı,
Ya saqimi, ya şərabmı, ya cammı,
Ya ilmisən, ya gündüzmü, gecəmi,
Ya aymısan, ya günmüsən, nəsən sən?

Ya müşkmüsən, ya ətirmi, ənbərmi,
Yoxsa, bilməm, çərxi-fələk, çənbərmi,
Ya dəryamı, ya dalğami, ləngərmi,
Girdabmısan,burğunmusan, nəsən sən?

Altınmısan, gümüşmüsən, zərmisən,
Ya ərşmisən, ya kürşmüsən, yermisən,
Ya yaqutmu, ya mərcanmı, dürmüsən,
Çıraqmısan, rövşənmisən, nəsən sən?

Məxdumqulu, keç namusdan, arından,
Əl götürgil bu vəfasız karından,
Cahan dolu, sən qafilsən yarından,
Mey-məstmisən, şeydamısan, nəsən sən?

## MÖHTAC EYLƏMƏ

Qadir cabbar, səndən diləyim budur,
Sən məni namərdə möhtac eyləmə.
Xəzinəndə vergil mənim rizqimi,
Bəndəni bəndənə möhtac eyləmə.

Qoyma azam doğru yoldan əyriyə,
Qoyma əyri üstün gələ doğruya,
Ər malını nəsib etmə oğruya,
Halalı harama möhtac eyləmə.

Namərd körpüsündən ölsəm keçmərəm,
Karvan olsam, halal işdən qaçmaram,
Əlindən bir kasa şərab içmərəm,
Sağ əli sol ələ möhtac eyləmə.

Səndən yaxşı niyyət, diləyim çoxdur,
Acı sözlər dildən çıxan bir oxdur,
Qardaşın qardaşa bahası yoxdur,
Böyüyü kiçiyə möhtac eyləmə.

Məxdumqulu, haqdan dilə varını,
Dilər olsan, dilə öz imanını,
Abad eylə iki gözüm nurunu,
Sağ gözü sol gözə möhtac eyləmə.

## KEÇİBDİR HƏDDƏN

Cəlil ey, cabbar, ey, özün bilərsən,
Cahan içrə cürmüm keçibdir həddən.
Bəndəyəm, nə qılsan özün qılarsan,
Günahım güc alıb, artdı gün-gündən.

Dərgahından dərman diləyim necə,
Uzun ömrü, heyif, sərf etdim heçə,
Yük ağır, yol iraq, qaranlıq gecə,
Can da cövlan vurar çıxmağa təndən.

Yolu azdım, peşman olub oturdum,
Kəráminə sığnıb, pənah gətirdim,
Yoldaşım yox etdim, yolum itirdim,
Nəfs insafdan etdi, şum şeytan dindən.

Hasilim üsyandır gündəliyimdən,
Ölüm asan olar zindəliyimdən,
Xəcalətə qaldım bəndəliyimdən,
Sənə layiq əməl gəlmədi məndən.

Həsrət ilə keçdim, heyranda qaldım,
Dərgahın daldadır, sığınıb gəldim,
Nəfs ilə şeytanın paymalı oldum,
Sahibimsən, lütf et, qurtargil ondan.

İxlasım arı qıl, yalanım yox et,
Dilimi uzun qıl, üzümü ağ et,
Xətərdən hifz eylə, haramdan pak et,
Tövfiqin yar eylə, tövbə ver çından.

Məxdumqulu, aşnalıq ver eşq ilə,
Sinəmə sirr ilə, gözə əşk ilə,
Amalım anlasam, qaldım müşkülə,
Yerim yox ayrılıb getməyə səndən.

## VAR

Səhər durdu peyğəmbər,
Məscid içrə Bilal var,
Çıxdı Bilal içərdən,
Gördü iki hilal var.

Davud əlində polad,
Bunca tutmaz nə halət,
Yetmiş iki, dörd millət,
Yüz on dörd də dəllal var.

Çarən yox, bitədbirsən,
Söylə, nə cavab versən,
Niyə haram yeyirsən,
Haq verdiyi halal var.

Yeddi dərviş, əhli-hal,
İsfəndiyar, Rüstəm Zal,
Qırx aşiq var, qırx abdal,
Hər başda bir xəyal var.

Məxdumqulunun bəndi, –
Dəştdir, bil, bəndlər bəndi,
Bütün işin sərbəndi,
Yaradan – zülcəlal var.

## GÜZƏŞT EYLƏ

Ey kərimi-karisaz,
Günahım güzəşt eylə.
Ey rəhimi-çarəsaz,
Günahım güzəşt eylə.

Gəlməsə kərəm səndən,
Getdi ixtiyar məndən,
Suçu çıxardım təndən,
Günahım güzəşt eylə.

Yüz qəm ilə təndə can,
İstəyir səndən aman,
Fəzlin ilə, ya sübhan,
Günahım güzəşt eylə.

Mən ki oldum günahkar,
Açma eybimi, səttar,
Kərəm eylə, ya cabbar,
Günahım güzəşt eylə.

Lütfünü izhar eylə,
Könlümü qərar eylə,
Tövfiqini yar eylə,
Günahım güzəşt eylə.

Ağıl yetməz zatına,
Fikr ərməz isbatına,
Birliyin hörmətinə,
Günahım güzəşt eylə.

Maliki-məxluq, hər nə,
Kim yetdi ki sirrinə,
Üç min ismin xətrinə
Günahım güzəşt eylə.

Biz biçarə ümmətin,
Ümməti-Məhəmmədin,

Hörmətinə Əhmədin
Günahım güzəşt eylə.

Şölən düşüb şövqünə,
Rəsul Əhməd zövqünə,
Yerin, göyün haqqına
Günahım güzəşt eylə.

Səxavət ehsanına,
Şəhidlərin qanına,
Cünbəndələr canına
Günahım güzəşt eylə.

Sənə baxan üzlərçün,
Sənə ağlar gözlərçün,
Həmd oxuyan sözlərçün,
Günahım güzəşt eylə.

Göydə ulduz hörməti,
Yerdə novruz hörməti,
Gecə-gündüz hörməti,
Günahım güzəşt eylə.

Bülənd dağlar haqqına,
Çöllər, qırlar haqqına,
Yerlər, sular haqqına,
Günahım güzəşt eylə.

Səndən olmasa haray,
Mənim bu halıma, vay,
Fəraqi der, ya xuday,
Günahım güzəşt eylə.

## MƏHƏMMƏD

Əvvəl-dəslab varıb Xeybər dağında,
Kafirlər qanını saçdı Məhəmməd,
Ləkləhərdə, Səkvan, Kabil şəhrində
Cəfa çəkib dinin açdı Məhəmməd.

Aşiqlər faş olub, eşqə minəndə,
Tura nəzər düşüb, dağlar yananda,
Buraq göydən gəlib, yerə enəndə,
Rəfrəf minib ərşə uçdu Məhəmməd.

Mikayıl, İsrafil, Əzrayıl ilə,
Gəldilər, durdular Cəbrayıl ilə,
Seyr etdi Səlsəbil, Zəncəfil ilə,
Kövsər bulağından içdi Məhəmməd.

Meracın gecəsi seyrə varanda,
Ya Cəbrayıl əmin ilə yürəndə,
Behişt qapısına gəlib duranda,
«Bismillah!» deb, işıq saçdı Məhəmməd.

Məxdumqulu, özgə dini pozdular,
İqlim-iqlim, şəhər-şəhər gəzdilər,
Cəfa çəkib, islam dinin düzdülər,
Altmış üç yaşında köçdü Məhəmməd.

## ƏNBƏR SAÇDILAR

Məhəmməd gələcək deyə asmanda
Mələklər müşk ilə ənbər saçdılar.
Bağlı idi, açılmazdı əvvəllər,
Qırx gündən irəli qapı açdılar.

Məhəmməd basıldı Bədrin cəngində,
Bir neçə müsəlman qaldı yanında,
Şahi-mərdan çıxıb gəldi sonunda,
Atın gövdəsindən al qan saçdılar.

Axırı kafirdir, əvvəli tərsa,
Mələk pərin atar asmanda görsə,
Dağyanus dövründə neçə kimlərsə
Bir it ilə həmrah olub qaçdılar.

Rüstəm dağ sürərdi bir əfi ilə,
Devlər titrəşərdi gürz xofu ilə,
Xoca Əhməd Yəsəvi yüz sufı ilə
Dəryanı gəmisiz böylə keçdilər.

Məxdumqulu təcüb qaldı bir işdə,
Yer üzündə tutmaq üçün sərıştə,
Harut, Marut adlı iki fəriştə
Babil quyusunda çaya düşdülər.

## BƏLLİ

Nuri-məhvəş, günəş, qutlu həbibım,
Adın sər dəftərdə, lövhədə bəlli.
Yeddi asman, doqquz fələk üstündə,
Bəşər rəsulunda ziyadə bəlli.

Mahların tacısan, gözlər çırağı,
Göydə mələk, yerdə bəşər yəyrägi,
Zəminin rəfiqi, göyün dirəyi,
Lövhi-məhfuzda, həm səmada bəlli.

Şəfıqül-müznibin məhşər günündə
Maqamı əlasan haqqın yolunda
Şamü səhər ümmətlərin dilində
Mömin diləyində duada bəlli.

Məhəbbətin təndə, ürəkdə, canda,
Nə bir canda, bəlkə cümlə cahanda,
Huri-rizvan oxur cənnət məkanda,
«Təha», «Yasin», bütün surədə bəlli.

Gəlsin deyib xəbər gəlcək həbibdən
Buraq minib çıxdın ərzi-şərifdən
Şəfaətin əskik etmə qəribdən,
Məhşər gün yetirən murada bəlli.

Ağlımı unutdu eşqin havası,
Yüz can ola bir görnüşün fədası,
Məxdumqulu derlər, şərməndə, asi,
Atası səhrayi-Azada bəlli

## QURBAN, YA RƏSUL

Bu mənim canım sənin yolunda qurban, ya rəsul,
Hər nə kim qılsan cəfa, bu cana dərman, ya rəsul.
Sevibən, var eyləmişdir səni rəhman, ya rəsul,
Qulluğunda intizardır işbu cahan, ya rəsul.

Ol əzabun-narindən olmuş sənin yolun iraq,
Özünü gəlmiş xuda firdövsi-əla, həm Buraq,
Sən ki gəldin dünyayə, bu aləmə yandı çıraq,
Şükrülilla, ta bəyanı oldu cahan, ya rəsul.

Dərd ilə bu ürəyim hər ləhzə ah qıldı neçə,
Ahımın dərmanı əvvəl Abdulla, Veysəl xoca,
Hər zaman mahi-camalın düşümə girməz gecə,
Qalar ol-bu bunca kim canımda ərman, ya rəsul.

Zari-zarı ağlayıban istəyirdim mən səni,
Bu zəlillik içrə sən çox qoymagil xara mani,
Həm yenə mizan çəkilib, ola məhşərin günü,
Çox inancımsan durarsan, ulu divan, ya rəsul.

Aşığa «hu-hu» deyib olğusu mərifət gülü,
Bu zəlil biçarənin, bəlkə, sənə yetər əli,
Ahü əfğanın sənin kim, yad edib Məxdumqulu,
Qəm içində böylə bir bimarü heyran, ya rəsul.

## SƏNİ

Həbibulla, səni sevən,
Tapar hansı yolda səni?
Vallah, görməyə müştaqdır,
Bəy də, xan da, qul da səni.

Aşiqlər gül üzü solar,
Min gün ağlar, bir gün gülər,
Bülbül sənədə arzular,
Tazə qönçə, güldə səni.

Nə gövhərsən, yox qiymətin,
Cahanı tutmuş hümmətin,
Durmaz, yad edər ümmətin
Dağda, düzdə, çöldə səni.

Ərənlər yolunu izlər,
Dərvişlər sirrini gizlər,
Məşriq-məğrib tamam gözlər
Hamı sağda-solda səni.

Dövlət fələk ilə dönər,
Kimdən uçar, kimə qonar,
Görməsə, aşiqlər yanar,
Həftə, ayda, ildə səni.

Biz həm ümmətin xasların –
Yad edərik həvəslərin,
Çağırıb mədəd istərik
Yaxşı-yaman halda səni.

Məxdumqulu der, odum var,
Ərzim var, haqqa dadım var,
Şəfaətdən umudum var –
Qıl körpüdə dalda səni.

## SEVMİŞƏM SƏNİ

Ya həbib, haq rəsulu sən,
Çın candan sevmişəm səni,
Dərvişlər qədir gecəsin
Sevən tək sevmişəm səni.

Eyləyib seyrü seyranı,
Gəşt etsəm külli İranı,
Misli İbrahim Saranı
Sevən tək sevmişəm səni.

Yaqub yurd etdi Kənanı,
Oğludur Misir sultanı,
Misli Yusif Züleyxanı
Sevən tək sevmişəm səni.

Kainatı tutdu adı,
Onlardır eşqin bünyadı,
Məcnun Leyli pərizadı
Sevən tək sevmişəm səni.

Dəldi dağların zirini,
Tapmadılar bir-birini,
Aşiq Fərhad ol Şirini
Sevən tək sevmişəm səni.

Əydi məni dünya malı,
Olmadı eşqim kamalı.
Seyfəlməlik Mahcamalı
Sevən tək sevmişəm səni.

Gəşt eyləyib dörd köşəni,
Basdı məhəbbət nişanı,
Yəməndə Vərqa Gülşanı
Sevən tək sevmişəm səni.

Getdi eldən ixtiyarı,
Qalmadı namusu, arı.

Aşiq Novruz Gülfərxarı
Sevən tək sevmişəm səni.

Bir gün rast gəldilər Xızra,
Durdular niyaza, nəzrə,
Bir-birini Vamiq, Əzra
Sevən tək sevmişəm səni.

Gəzdilər Rumun düzünü,
Verdilər haqqın xərzini,
Necə ki Qənbər Arzunu
Sevən tək sevmişəm səni.

Tutmadı olar dünyanı,
Qalmadı yarı-yaranı,
Misli ol Tahir Zöhrəni
Sevən tək sevmişəm səni.

Bu dünya qoyubdur kimi,
Xoş tutun beş günlük dəmi,
Aşiq Qərib Şahsənəmi
Sevən tək sevmişəm səni.

Məxdumqulu, dünya fani,
Ötübdür Rüstəmlər, hanı?
Ay, gün zəmin, asimanı
Sevən tək sevmişəm səni.

## GƏLDİ

Doğru məğrib tərəfdən
Ol mehribanım gəldi.
Yüz işveyi-naz ilən
Canım, cananım gəldi.

Mən yarın sərnəgünü,
Baxmaz, yumar gözünü,
Tökər ciyərdən xunu,
Şahi-sultanım gəldi.

Aləmə şahi-pərvər,
Oldu ümmətə sərvər,
Cahan oldu münəvvər,
Dürri-qəltanım gəldi.

Qaməti sərvi, tuba,
Qəddi, özü müntəha,
Vəchi-ruyi «vüz-züha»,
Sərvi-rəvanım gəldi.

Niqabın üzə salan,
Üz göstərib, can alan,
Bunca alışıb yanan,
Ahi-fəğanım gəldi.

Məlik fərmana baxan,
Sidrəti səhra çıxan
Ah çəksə, ərşi yaxan,
Sahibgiranım gəldi.

Məxdumqulu binəva,
Gözləməz səndən səva,
Ümmət deyib daima,
Həzrət işanım gəldi.

## YUSİF DEYƏ-DEYƏ

Mən Yaqubam, ahı-zarı
Çəkəm Yusif deyə-deyə,
Gözlərimin qanlı yaşın
Tökəm Yusif deyə-deyə.

Fələk ağlar göz yaşıma,
Nə sevda saldın başıma,
Məcnun olub dağ başına
Çıxam Yusif deyə-deyə.

Hər tərəfdən bölgə-bölgə,
Bulud oynar, salar kölgə,
On iki dağ, yeddi cülgə
Sökəm Yusif deyə-deyə.

Getdi Yusif, gəlməz xəbər,
Duraram ağlar hər səhər,
Qala-qala, şəhər-şəhər
Sökəm Yusif deyə-deyə.

Məgər Yusif düşdü çaya,
Camalın deb baxam aya,
İraq zəmin Kərbalaya
Baxam Yusif deyə-deyə.

Həsrətimə fələk ağlar,
Aşiq oldu dilsiz zağlar,
Fərhad olub böyük dağlar
Yıxam Yusif deyə-deyə.

Yusif gəzər dildən-dilə,
Şeyda olub çöldən-çölə,
Soraq salıb eldən-elə
Çıxam Yusif deyə-deyə.

Ötər əyyam dönə-dönə,
Keçər bu can yana-yana,

Ertə, axşam aya, günə
Baxam Yusif deyə-deyə.

Məxdumqulu, dost üzündən,
Durmaz, yaş axar gözündən,
Bülbül olub yar sözündən,
Oxam Yusif deyə-deyə.

## GÖRSƏM

Dehistanın bayrında
Badi-səbanı görsəm.
Bəhaəddin Mirqulal,
Zəngi Babanı görsəm.

Nəleyni ərşə tacdır,
Adı aləmə bacdır,
İki cahan möhtacdır,
Ərəb zəbanı görsəm.

Gələn keçər çeşt edib,
Əylənməz güzəşt edib,
Könül deyər gəşt edib,
Gəzsəm, cahanı görsəm.

Xıdır kimi çöllərdə,
İlyas kimi sularda,
Kavus kimi dağlarda,
Yaxşı-yamanı görsəm.

Yuxarda Hindistanı,
Arxada Türküstanı,
Övliyalar ümmanı
Ol Rumistanı görsəm.

Can dəli, cahan şeyda,
Bundan gələrmi fayda,
Yeddi dağ, yeddi dərya, –
Dəli ümmanı görsəm.

Məxdumqulu xoş olsa,
Axsa didəm, yaş olsa,
İmanım yoldaş olsa,
Varsam, Kəbəni görsəm.

## RƏVAN OLDU

Məkkədən çıxdı bir gözəl,
Mədinəyə rəvan oldu.
Görən tac etdi sərinə,
Görməyən bağrı qan oldu.

Haqdan ona endi kəlam,
Adı şam, çirağül-islam,
Müti oldu cümlə aləm,
Böylə sahib zaman oldu.

Dosta yetdi vara-vara,
Yeddi göyü yara-yara,
Hər kim münkirdir ol ərə,
Kafirdir, biiman oldu.

Əl götürüb, rəsul ağlar,
Saraldı qönçələr, bağlar,
Bədr vuruşında dağlar
Yeddi ayla duman oldu.

Səf çəkdi batır bəngilər,
Döyüşə çıxdı zəngilər,
Qana batdı üzəngilər,
Əlinin dəsti qan oldu.

Müqadil etmədi təşviş,
Əli ilə saldı döyüş,
Torpaq, dəmir, polad, gümüş,
Qalaları viran oldu.

Məxdumqulu, Rumistana,
Çaldı qılınc Hindistana,
Bədəxşana, Türküstana,
Yeddi iqlimə xan oldu.

## ƏRƏB DİLLİ, SEVDİYİM

Boyadılar köynəyini qan ilə,
Adı bəlli, ərəb dilli sevdiyim.
Ayrılıqda yaundu atan can ilə,
Adı bəlli, ərəb dilli sevdiyim,
Şam əbalı, Rum qəbalı cananım.

Ağla-ağla cəfaların dərdindən,
Qorxa-qorxa səhraların qurdundan,
Ayrıldın atandan, Kənan yurdundan,
Adı bəlli, ərəb dilli sevdiyim,
Şam əbalı, Rum qəbalı cananım.

Çılpaq oldu, gül bədənin soyuldu,
Daği-hicran sinən üstə qoyuldu,
Ağlamaqdan Yaqub gözü oyuldu,
Adı bəlli, ərəb dilli sevdiyim,
Şam əbalı, Rum qəbalı cananım.

Gəldi ol dəm qardaşların böyrüşüb,
Qorxusundan qurdlar gəldi yüyrüşüb,
Gələn guduk üstə durdu çırpışıb,
Adı bəlli, ərəb dilli sevdiyim,
Şam əbalı, Rum qəbalı cananım.

Məxdumqulu deyər, aləm paxıldı,
Fələk səni Misrə aldı, çəkildi,
Peşman olub, ayağına yıxıldı,
Adı bəlli, ərəb dilli sevdiyim,
Şam əbalı, Rum qəbalı cananım.

## İKİ DÜNYANIN SULTANI

Ey yaranlar, müsəlmanlar,
İki dünyanın sultanı
Ruzi-əzəldə yaratdı
Rəsul cəsədində canı.

Yerdə Musanın Turundan,
Göydə behiştin hurindən,
Yaratdı rəsul nurundan
Ay-günü, yer-asimanı.

Arzu edib gül rüxsarın,
Gəzdim dağında əbrarın,
Sorağını salıb yarın,
Gəşt etdi könlüm dünyanı.

Ağlım heyran olub çaşdım,
Axır bir ərə sataşdım,
Altmış altı dağdan aşdım,
Keçdim on iki dəryanı.

Məxdumqulu, biqərarsan,
Bu nə oddur, sən yanarsan,
Sən hər zaddan çox kənarsan,
Bilməzsən xeyri-ziyanı.

## ƏLİDİR

Zərb uruban Cəngədilin şəhrinə,
Kafirlərə qəzəb salan Əlidir.
Göz yumub açınca qırx günlük yolu,
Düldülə bir fərsax qılan Əlidir.

Başlar azad etdi dev qucağından,
Əjdəha ləbindən, dağ bucağından,
Darvazasın çəkib Xeybər dağından,
Yeddi qala birdən dolan Əlidir.

Gəşt eylədi dağı-daşı ələyib,
Qılınclar gəmirib, qanlar yalayıb,
Doğru gəlib, Ədhəm qanın diləyib,
Muqadilə qovğa salan Əlidir.

Arslan kimi qovdu kafir ovları,
Güşad etdi neçə Kəbərövləri,
Yer altından ölkə çapan devləri,
Varıb, bölük-bölük qılan Əlidir.

Kəllə gəldi dərgahinə dad ilə,
Nizam verdi sərxorlara xətt ilə,
Kamkam qılınc ilə, Düldül at ilə,
Taxtı-taca yetib varan Əlidir.

Məxdumqulu deyər, təndə bu canın,
Yolunda nisar et Şahi-mərdanın,
Əl uzadıb dörd küncünə dünyanın,
Məhəmməd dininə salan Əlidir.

## SÖZÜM VAR

Qulaq asın, qardaşlar,
Bir əcaib sözüm var.
Nə fərmayiş eyləyər
Dostlara pərvərdigar.

Cahan işidir cəfa,
Kim gördü ondan vəfa,
Haqqın dostu Mustafa,
Qalmamış bu ruzigar.

Peyğəmbər yox izindən,
Nur tökülər üzündən,
Aləm onun sözündən
Tapdı nizamü qərar.

Ey din istəyən dostan,
Olma maldan mey-məstan,
Söyləyim bir xoş dastan,
Əgər olsan xiridar.

Səs düşcək zəminlərə,
Yol yox oldu dinlərə,
Məsciddə möminlərə,
Vəz deyərdi peyğəmbər.

Rəsul minbərə qalxmış,
Otuz üç min yığılmış,
Cümə bura cəm olmuş,
Sahabələr nə ki var.

Yaranlar heyran ola,
Söz yetişcək bu hala,
Haqq üçün verlən mala,
Hər birinə on təyyar.

Dedi Əli: «Varayım,
Nə var-nə yox görəyim,

Allah üçün verəyim,
Azdan-çoxdan hər nə nə var».

Gəldi dedi: «Ya Zəhra,
Könlün uydurma qəhrə,
Verib, alalım bəhrə,
Gər təngə olsa təyyar».

Fatma der: «Olsa dirhəm,
Varsam, təama versəm,
Bu iki nuri-didəm,
Gün yarım açdır, ağlar».

Dedi Əli: «Ya sübhan»,
Dolandı, baxdı hər yan,
O çıxınca qapıdan,
Gəldi bir sail düçar.

Dedi: «Olma naşad sən,
Eylə başım azad sən,
Sən bir müşkül güşad sən,
Qırx min qızıl borcum var.

Xatınım vardı, öldü,
Südəmər qızım qaldı,
Evim həm viran oldu,
Bunca oldum iflaskar».

Gədaya: «Sən qal» dedi,
Oğlanlara: «Gəl» dedi,
Bir cuhuda: «Al» dedi,
«Oğlanlarımı, zinhar.

Pulun verərəm geri,
Öyümə gəlmiş biri,
Oğlanlar olsun girov,
Pulun olunca hazır».

Cuhud alıb cüt oğlu,
Əliyə verdi pulu,
Diləncçi tutdu yolu,
Getdi xoş, xürrəmivar.

Fatma oturar evdə,
Oğlanları girovda.
Kiçik qardaş cuhuda
Der: «Kimdir bu oğlanlar».

Cuhud der: «Oğulları,
Satdı Əli bunları,
Tutacağam qulları,
Pulu alana qədər».

Der: «Ağa, aman-mürvət,
Ta gəlincə ol həzrət,
Elə bunlara hörmət,
Axırda çox olar kar».

Söz cuhuda kar etməz,
Qardaşını eşitməz,
Otuz qulac ip yetməz,
Qırx qulac quyusu var.

Cuhud deyər qullara:
«Haydı, düşün yollara»,
İpsiz kuzə qollara
Verdi ki, su çəksinlər.

Götürdülər kuzəni,
Gördü Cəbrayıl onu,
Mikayıl sıxdı yeri,
Axdı quyu çeşməvar.

Kuzəni qaldırdılar,
Çeşmədən doldurdular,
Durmayıb gətirdilər,
Bildi cuhud qüdrət var.

Kuzəni huma tökdü,
Tükənməz holuq axdı,
Çay daşıb, düzə çıxdı,
Cuhud qorxub etdi zar.

Cuhud eyləyib xidmət,
Gətirdi nazü nemət,
Etdi onlara hörmət,
Der: «Olmayın biqərar».

Şahzadələr səlamət,
Könülləri imarət,
Əli edib təharət,
Könlündə qəmi bisyar.

Haqqa eyləyib niyaz,
Dedi: «Sən, ey çarəsaz»,
Qıldı dü rükət namaz,
Gördü bir quş, zərnigar.

Boynu mirvari inci,
Bahası aləm gənci,
Şazadələr güvənci,
Deyib tutdu beyekvar.

Quş rəvan qanad çaldı,
Əlini göyə aldı,
«Bərk tut» deyib səs saldı,
Getdi Əli varhavar.

Ol mürği-zərrin nəqqaş,
Asimana vurub baş,
Əlini ölkədən dış
Edib, saldı bir diyar.

Yetişdi bir diyara,
Heyran oldu bu kara,
İstədi bir şey sora,
Heç kişi yox, əyal var.

Der: «Bihesab kansınız,
Nə xoş sifət cansınız,
Niyə həp zənansınız,
Qəribəm, verin xəbər».

Derlər: «Eyd mahalıdır,
Xəlq içərdə doludur,
Xüms, əşar malıdır,
Məscidlər xalvar-xalvar».

Əli bunu eşitdi,
Tazə təharət etdi,
Xəlqin cəminə getdi,
Tutdu bir küncdə qərar.

Vaiz çıxdı minbərə,
Xəlqə nəsihət verə,
Söz tapmadı biçarə,
Ağlar oturdu naçar.

Der cəmaət, şah, vəzir:
«Nəsihətin dilpəzir,
Dildə, ağızda gəzir,
El sözünə intizar».

Vaiz der: «Olun agah,
Yadıma gəlməz nagah,
Ey vəzir, ey padişah,
Burda Məhəmmədi var».

Derlər: «Tapsaq Əhmədi,
Eyləriz ona bədi,
Var olsa Məhəmmədi,
Pullarmız səd həzar.

Şirin edib dilləri,
Ələ almış elləri,
Ata-baba yolları
Tərk edib olmuş bizar».

Vaiz deyər: «Ey mərdan,
Könlüm qorxar ol ərdən,
Çağırım qoy minbərdən,
Ol özün eylər aşkar».

Vaizə qulaq salıb,
İşbu pəndini alıb,
Hamısı razı olub
Oturdular intizar.

Vaiz der: «Haq qüdrəti,
Peyğəmbərin hörməti,
Özün bildir, ey fəti,
On iki sualim var.

Əgər özün bildirsən,
Qarşımda gəlib dursan,
Sözüm cavabın versən,
Mal verək xalvar-xalvar».

Qəhri qaynar başından,
Durdu Əli coşundan,
Vardı vaiz peşindən,
Der: «Mənəm Əhmədə yar.

Qul olarıq təqdirə,
Bilmərik bu yer hara,
Nə sözü olsa sora,
Sonra üç sualım var».

Məscid içrə züha tək,
Hamı dedi Süha tək,
Əli bir əjdərha tək,
Gəlib durdu sütunvar.

Xofa düşər təndə can,
Lərzana gələr cahan,
Vaiz deyər: «Ey cavan,
Gəlməsin qəhrin, zinhar».

«Danışmağa yox tabım,
Oxumağa kitabım,
Vaiz desə cavabım,
Mən soraram suallar».

Şir sözün tamam etdi,
Dürüst bir kəlam etdi,
Növbə kafirə yetdi,
Görün, sualın sorar.

«Bir nədir, iki olmaz,
İki nədir, üç olmaz,
Üç həm nədir, dörd olmaz,
Beş, altı, yox bərabər.

Beş nədir, altı olmaz,
Altı var, yeddi olmaz,
Yeddi həm səkkiz olmaz,
Doqquzdan sözlə əxbar.

On nədir, on bir olmaz,
On bir on iki olmaz,
On iki on üç olmaz»,
Söz tamam etdi küffar.

Əli haqqın kitabın,
Açıb mərifət babın,
Verdi vaiz cavabın,
«Dinləyin, ey şəhriyar.

Tanrı bir, iki olmaz,
İki – ay, gün, üç olmaz,
Üç rükət həm dörd olmaz,
Dörd ənasirdir çahar.

Beş namazdır bil, beş vəxt,
Altıdır altı cəhət,
Yeddi duzəx, səkkiz cənnət,
Doqquzdan cümlə qərar.

On hacılar işi xub,
On bir pesəri-Yaqub,
On iki aydır mərğub,
Der dəxi nə sözün var».

Rastdır deb, açdı ağız,
Xətt edib yazdı kağız,
Qəbul eylədi vaiz,
Həm bütün xəlayiqlər.

Vaiz döndü dəliyə.
Qail olub vəliyə,
Xəlq söylədi Əliyə:
«Sən sor nə ki sözün var».

Əli açdı kitabın,
Töküb gözündən abın,
Desə vaiz cavabın
Hamı birdən aydınlar.

Əli der: «Vaiz desin,
Vaiz sözün şah desin,
Şah dediyin xəlq desin,
Mənim də sualım var».

Xəlq ondan olub agah,
Qəbul etdilər nagah,
Vaiz, vəzir, xəlqü şah,
Hamı etdi ixtiyar.

Şiri-xuda şad olub,
Xudaya şükür qılıb,
Növbə Əliyə gəlib,
Soruşdu şiri-cabbar.

«Nədir ərşə bitilmiş,
Bərgi-tuba bitilmiş,
Behişt qapı bitilmiş»,
Der, tamam etdi göftar.

Vaiz eylədi fikir,
Qılmaq gərək çox zikir,
Vaiz gördi, iş çuxur,
Deməli oldu, ey yar;

«La ilahə illəllah,
Məhəmməd rəsulullah»,
Üç dəfə dedi xəlq, şah,
Müsəlman oldu küffar.

Xalq, şah, vəzir özləri:
«Dinlədik bu sözləri,
Başa saldız bizləri,
Dedilər olduq iqrar».

Xəlqə elan verildi,
Küfrdən din çevrildi,
Dinə təlim verildi,
Qıldılar qüsl küffar.

Haqq ondan rəhmət saçıb,
Nur gəlib, zülmət qaçıb,
Şah Əli boynun guçub,
Çox ağladı zar-zar.

Der: «Ey şahi-vəlayət,
Biz xoşbəxt olduq qayət,
Səndən tapdıq hidayət,
İslamı etdin aşkar».

Sordu onlar gəlişi,
Əli dedi təşvişi,
Bütün qızıl-gümüşü
Etdilər ona nisar.

Yüz min altın pul, baxdı,
Çib-qoynuna buraxdı,
Aldı, qaladan çıxdı,
Gəldi ağ quş zərnigar.

Əvvəlki kimin etdi,
Quş ayağın bəy tutdu,
Quş uçub, hava getdi,
Eylədi daxili-dar.

Cuhudlar qarşı gəlib,
Ehzazü ikram qılıb,
Hamısı razı olub,
Mal verdilər bişümar.

Haqqa edib zarların,
Ələ alıb varların,
Gətirdi oğlanların,
Fatma ondan bixəbər.

Şəkk eyləmə bu köydə,
Artığın qoyub öydə,
Qırx min altın cuhuda,
Verdi ol şahi-səfdər.

Cuhud həm pulun aldı,
Əli məscidə gəldi,
Ol peyğəmbəri gördi,
Salam eylədi, ey yar.

Bu iş həzrətə bəyan,
Rəsula olmuş əyan,
Rəsul söyləyər: «Yaran,
Bax, gəlmiş şiri-cabbar.

Əli məsciddən getdi,
Gör, necə işlər bitdi,
Bir şəhri islam etdi,
Xəlq namaza intizar.

İşlər gördü haqqıda,
Gəldi durdu qapıda,
Rəsul deyər: «Əlidə,
Soranlar, çox xəbər var».

Əli ol tutan quşun,
Haqq üçün edən işin,
Şəhri islam edişin,
Cümləyə verdi əxbar.

Xəbərin verdi Heydər,
Derlər: «Allahü əkbər»,
Təhsin qaldı peyğəmbər,
Son namaza durdular.

Haq der gözdən töküb‌ xun,
Hər kim munda versə don,
Bu dünyada birə on
Verər ol pərvərdigar.

Bir üftadə-düşkünə,
Könül gəlsə coşğuna,
Haqqa, Əli eşqinə,
Bir verən on qat alar.

Əli gər bunu yazdı,
Möminlər könlü qızdı,
Olar axirət muzdu,
Bihesabü bişümar.

Canım cürə məstidir,
Könlüm haqq peyvəstidir,
Dostum Əli dostudur,
Gər ixlasın olsa var.

Məxdumqulu, mən cana,
İnanmazam cahana,
Duada yad qılana
Yiyəm olsun mədədkar.

## QANA

Xudayımın arslanı
Dolaundu qəhri qana.
Döndü Əli zərbindən
Xeybərin şəhri qana.

Behişt bina köşkündən,
Göz nurlanar müşkündən,
Döndü Əhməd eşqindən,
Həzari-mehri qana.

Qəzəbdən Düldül mindi,
Çəkildi yerin bəndi,
Əli zərbindən döndü
Müqadil zəhri qana.

Ey boyu uzun, ağlı az,
Başı axmaq, qolu saz,
Cəng eylədi bəhri, baz,
Düşdü səd bəhri qana.

Aşiqəm, eşq məsti mən,
Daməni yar dəsti - mən,
Məxdumqulu dostu mən,
Görmədim mehri qana.

## GÖY KƏBUTƏR

Yaranlar, müsəlmanlar,
Görün, hökmi-davəri.
Məsciddə oturmuşdu
Bir gün Mürtəza Əli.

Söykənərək mehrabə,
Üzün tutmuş kitabə,
Uluğ-kiçik, səhabə
Yığılmışdı həm varı.

Ol şahi-səfdər gördü,
Bir göy kəbutər gəldi,
Qonaraq təzim qıldı:
«Səlam əleyk, ya Əli.

Sənsən dinim-imanım,
Sənə qurban bu canım,
Filan yerdə aşyanım,
Yaş çağam var, ya Əli.

Yerlə göy arasında,
Xırmanlar qırağında,
Xudanın pənahında
Gəzərdim səhraları.

Teyr edərdim hər yana,
Şükr edərdim sübhana,
Yığardım, buğda, danə,
Varardım yuvam sarı.

Düşməndən qafil idim,
Xürrəmü xoşhal idim,
Çağama məşğul idim,
Gördüm ki, bir şahpəri,

Gördüm bir laçın gələr,
Havada havalanar,

Bildim ki, canım alar,
Aman verməz, ya Əli.

Qorxub, bitaqət oldum,
Şirin candan əl üzdüm,
Sənin qapına gəldim,
Qurtar məni, ya Əli».

Əli çün vaqif  oldu,
Kəbutər halın bildi,
Lütf ilə kərəm qıldı,
Der: «Kəbutər, gəl bəri».

Kəbutər gəldi önə,
Verməz laçın cənginə,
Qol uzatdı, qoluna,
Qondurdu quşu Əli.

Şol dəmdə laçın gəldi,
Həzrətə ərzin qıldı,
Lütf ilə təzim qıldı:
«Səlam əleyk, ya Əli.

Bu səhər ov ovlardım,
Dağı-daşı teylərdim,
Bir kəbutər qovlardım,
Gəlibdir sizin sarı.

Dərməndəyəm, möhtacam,
Şərməndəyəm, qəllacam,
Bu gün üç gündür acam,
Ovumu ver, ya Əli!»

Ol şiri-pərvədigar,
Ol sahibi-Zülfüqar,
Ol şahi-Düldül süvar
Nida qıldı Qənbəri.

Gənbər çün hazır oldu,
Lütf ilə kərəm qıldı,

Dedi: «Xidmət nə oldu,
Çağırdınız bizləri».

Dedi çərxi-çənbərə,
Müşk qatılmış ənbərə,
Əli dedi Qənbərə:
«Alıb gəlgil xəncəri».

Görün indi nə qıla,
İstər ol kərəm qıla,
Laçın dedi Əliyə:
«Siz nedərsiz xəncəri?»

«Ey laçın, mən Heydərəm,
Sahibi-lütfi-kərəm,
Öz budumdan ət verəm,
İstəmə kəbutəri».

Xəncər çıxdı qınından,
Ta ət kəsə budundan,
Laçın tutdu qolundan,
Dedi: «Kəsmə, ya Əli».

Sənin işin kərəmdir,
Qolların möhtərəmdir,
Bu ət bizə haramdır,
Ey, ya saqi-kövsəri.

Laçın saymazlar məni,
Kəbutər deməzlər onu,
Sınamaq üçün səni,
Gəlmişdik sizin sarı».

Şahdan rüxsət aldılar,
Ayaq üstə qaldılar,
Uçub, pərvaz qıldılar,
Getdilər asman sarı.

Tamam oldu bu sözlər,
Etsələr gərək əsər,
Məxdumqulu xaki-sər,
Şahi-mərdan çakəri.

## BEHİŞTİN

Göydən yuxarıdır, ərşdən aşağı,
Ey yaranlar, yeri, özü behiştin.
Həzar min nəğməsi, yüz min muğamı,
Həmişə qurulu sazı behiştin.

Xıdır yaşın versə onu gəzməyə,
Davud katibliyin versə düzməyə,
Gecə-gündüz olsam şərhin yazmağa,
Mindən bir deyilməz sözü behiştin.

Dərviş düşdə görüb olmuş aşığı,
Qızıldan qurulmış fərşi, işığı,
Aləmi qərq eylər nurdan işığı,
Əgər bir açılsa üzü behiştin.

Kəlam içrə oxub deyər mollalar,
Qulluqçu rizvanlar, inci-şillələr,
Mürəssə halqalar, nazik hüllələr,
Tükənməz neməti-nazı behiştin.

Şərhini deməyə sözüm, dilim yox,
Həqq özü hakimdir, cəbr, zülüm yox,
Qayğı-qəm yox, qocalıq yox, ölüm yox,
Ayrılmaz, sovulmaz yazı behiştin.

Yüz şərbətdən məcun olub qatılan,
Qara saçı ağ topuqda çatılan,
Balzəban, növcavan, tazə yetilən,
Bəzənər, sallanar qızı behiştin.

Minib seyran üçün Buraq atları,
Gündən-günə artar könül şadları,
Ləldən, yaqutdaundur olan zadları,
Heç olmaz ki gərdi-tozu behiştin.

Bişər əlvan, əl dəyməyən aşları,
Qüdrət ilə büryan olub göşləri,

Tay gələr dünyaya dirhəm-daşları,
Artıqdır hər yandan özü behiştin.

Hər növbə min dürlü şərab içilən,
Almaz, inci, yaqut, dürlər saçılan,
Rəngbərəng bihesab güllər açılan,
Müşki-ənbər qoxar üzü behiştin.

Həq qəbul eyləyib dostun, əğyarın,
Hasil edib bütün məqsədin - varın,
Göstərib ol gündə xəlqə didarın,
Budur möminlərə razı behiştin.

Məxdumqulu, vəsfi gəlməz dillərə,
Dilə gəlsə, bəyan etsəm ellərə,
Aciz bəndələrə, asi qullara,
Ya rəb, özün eylə ruzi behiştin.

## BEŞ NAMAZ

Həq-təala buyuran
Bəndəsinə beş namaz,
Bəndəsinin niyazı –
Bir gündəki beş namaz.

Həq-təala aytanı,
Bəndəsinin tutanı,
Hər gündəki qılanı
Bir gündəki beş namaz.

Ol rəsulun ümməti,
Ümmət qılar sünnəti,
Ərənlərin izzəti
Bir gündəki beş namaz.

Ol rəsulun sözləri,
Laməkanda üzləri,
Hər gündəki sözləri –
Bir gündəki beş namaz.

Namaz qılsan, ətadır,
Günah qılsan xətadır,
Dilə uzun sədadır
Bir gündəki beş namaz

Ərənlərin mədədi,
Könüllərin qüvvəti,
İki cahan dövləti
Bir gündəki beş namaz.

Alimlərin sirdaşı,
Aqillərin yoldaşı,
Əziz canın qoldaşı
Bir gündəki beş namaz.

Türküstanın Əhmədi,
Doxsan yerdə söhbəti,

Həqqin ona rəhməti
Bir gündəki beş namaz.

Qılsın mənə uluğluq,
Sultan baba − Eynəl-mülk,
Həq qatında sevüklük
Bir gündəki beş namaz.

Namaz tanrı fərmanı,
Qılsa artar imanı,
Elmi-Quran bəyanı
Bir gündəki beş namaz.

Məxdum, bəyan qıl namaz,
Günahların olsun az,
Həq qatında min niyaz
Bir gündəki beş namaz.

## AXIR ZAMAN OLAR

Ey yaranlar, müsəlmanlar,
Bir gün axırzaman olar.
Ondan qabaq çox nişanlar,
Yerin üzündə qan olar.

Ədalətsız olar xanlar,
Həyasız olar əyallar,
Çox tökülər nahaq qanlar,
Elin feli yaman olar.

Fəsad çox olar, az olmaz,
Bu öy ol öyə saz olmaz,
Yağmurlar yağar, yaz olmaz,
Bir gün badi-xəzan olar.

Hiylə eylər, tapar yollar,
Sələm verib yığar mallar,
Din yolunu yığıb ellər,
Nə məktəb, nə əzan olar.

Namaz qılar, sözlər yalan,
Atasına  asi olan,
Çaxır içib, zina qılan,
Əzabı min əlvan olar.

Əmrin tut tanrı dostunun,
Asi olma, saxla dinin,
İnşallah, Məxdumqulunun,
Din yoldaşı iman olar.

## AXIR ZAMAN GƏLƏR

Ey yaranlar, müsəlmanlar,
Bir gün axır zaman gələr.
Kuhi-Qaf dağından aşıb,
Dəccal ol dəm rəvan gələr.

İşbu dünyadan keçənlər,
Haqqın şərabın içənlər,
Atasına yaş beççələr,
Su götürüb, rəvan gələr.

Xudayımın rəhməti der,
Haqq buyruğun qılmadı der,
Səhər xudaya ağla der,
Səkkiz behişt xuban gələr.

Ümmətlərə şəfqəti der,
Məhəmmədin ümməti der,
Uçmaq içrə gisrinlər der,
Xudayımdan fərman gələr.

Cahandan ötdü nə canlar,
Burda qıl xeyir-ehsanlar,
Ey yaranlar, müsəlmanlar,
Onda təxti-rəvan gələr.

Məxdumqulu, xeyrat etsən,
Qəriblar könlün şad etsən,
Qıl siratdan ötəndən son,
Burda verən qurban gələr.

## TÖRƏR

Bir il o günbatardan,
Bəlli məşhur xan törər.
Üzü mahi-taban tək,
Bəbəkləri qan törər.

Gör Hüseyn mirzəni,
Haqqa yazar ərizəni,
Yerlər vurar lərzəni,
İsrafildən ün törər.

Heyvan insan şanında,
Əcəl vardır yanında,
Dəccal yerə enəndə
Başga millət, din törər.

Aşiqlərə rəy olmaz,
Dünya yükü tay olmaz,
Göy üzündə ay olmaz,
Günbatardan gün törər.

Dəccal sazın quran son,
Eyşi-işrət sürən son,
Dönüb Kəbə varan son,
Ərvah ilə cin törər.

Yəcuc, məcuc deyərlər,
Bir-birini yeyərlər,
Birini öldürərlər,
Bir yerinə on törər.

Məxdumqulu der heyhat,
Ruzi-məhşər – qiyamət,
Ey, ya qaziyül-höccət,
Bütün işlər kin törər.

## ÇIXAR

Ey yaranlar, axır zaman olanda,
Beş kişi der, Harış atlı mar çıxar.
Burda yaman yolda gəzən qardaşlar,
Məhşər günü orda yeri dar çıxar.

Baldandır, süddəndir axan bulağı,
Möminlərin Buraq olar ulağı,
Yəcuc, məcuc yerə düşər qulağı,
Dostum, böylə nişanalı xar çıxar.

Bu dünyada dinlərini pozanlar,
Qeybət edib, yalan-palan düzənlər,
Naməhrəmə nəzər salıb gəzənlər,
Burda gözlü olsa, onda kor çıxar.

Kafirlərin daşlar enər sərindən,
Əli, Hatəm çıxmaz cənnət döründən,
«Vay, ümmətim» deyib durar yerindən,
Məhşər günü rəsul adlı ər çıxar.

Məxdumqulu, bu yollardan çıxmagil,
Düzülən rabatdır, dinin yıxmagil,
Üzülməz töhməti boyna taxmagil,
Haqqa doğru gələn, bəlkə, şir çıxar.

## BƏYAN GƏLƏR

Dəbbətül-ərz adlı Dəccal sonundan,
Mərvədən, Səfadan bir bəyan gələr,
Yeddi gündən sonra onun cəngindən,
Üç gündən aləmə bir nişan gələr.

Üzü adam, gün tək alnının ağı,
Bir düyəyə bənzər boynu, ayağı,
Qoç kimi, quş tənli, qalxan qulağı,
Təpəsi üstündə bu Quran gələr.

Az qalar ki, şaxı göyə yetməyə,
Bir həftədən fürsət tapar yatmağa,
El yığılar tamaşasın etməyə,
Yaxşı-yaman, bütün müsəlman gələr.

Qaçıb ondan heç kim tapmaz xilası,
Möminlər xoş olar, hövl edər asi,
Sol əlində olar Musa əsası,
Sağ əlində möhri-Süleyman gələr.

Neçəsinə möhri-Süleyman sürər,
Neçəsinə Musa əsasın vurar,
Xəlq yarı ağ olar, bir qismi qarar,
Qara üzlü bəlli biiman gələr.

Xor qalmaz alanlar biləndən bilik,
Dostü düşmən edər olsa bədgilik,
Ağ uçmaqlıq olar, qara tamuluq,
Dünyanın sonundan şu zaman gələr.

Dəccaldan öncə duy aşiqin sözün,
Bilən olmaz gün, ay, gecə, gündüzün,
Qırx gün qara tüstü aləmin üzün,
Yeri-göyü basıb, boz duman gələr.

Ol canavar ölər, xəlq ondan dinər,
Oğul, qız az durar, xəlq ucu sınar,

Adam tək on mələk asmandan inər,
Ağlaşıb, hər başdan səd fəğan gələr.

Məxdumqulu uyar kəlam sözünə,
Yer-göylər tutuşar, dağlar düzünə,
İsrafil sur çalsa yerin üzünə,
Ümidsiz xak tənə tazə can gələr.

## ƏMRİ-XAN GƏLƏR

Əməli caleh ol, yaxşı amal qıl,
Bir gün sənə rəvan əmri-xan gələr,
Əzrayıl gəlibən sıxar ayaqdan,
Ağız tərəfindən əziz can gələr.

Ömrün axır olsa, təndən can gedər,
Can durmaz, dayanmaz, səni tərk edər,
Oğlun-qızın bunca ahü vay edər,
Surət yatar, nə qulağa ün gələr.

Canını quş qoltuğuna salarlar,
Surətini yer evində qoyarlar,
«Mən rəbbük» der, Münkər-Nikir gələrlər,
Sualına cavab yaman gen gələr.

Əmanət-xəyanət verməsən kərzi,
Əda eyləməsən sünnəti, fərzi,
Münkər-Nikir vurar ol odlu gürzü,
Ağızdan, qabaqdan qara qan gələr.

Çıxma buyruğundan, ey Məxdumqulu,
Cəhd eylə gün-gündən, ey Məxdumqulu,
Dinçlik tapma bundan, ey Məxdumqulu,
Qəbr içində sənə işlər kan gələr.

## AMAN HEY

Hədisdən, ravidən bir söz söyləyim,
Heyhat gündən, zülmət gündən aman hey.
Tanrı qullarını agah eyləyim,
Heyhat gündən, zülmət gündən aman hey.

Əlif and içəndə bir dev gələrmiş,
Adı Dəccal, özü kafir olarmış,
Sağından, solundan dörd dağ yürürmiş,
Heyhat gündən, zülmət gündən aman hey.

«Mən tanrıyam» deyib salar dalaşı,
Bir ər onun ilə eylər savaşı,
Dörd şəhrə qaçarmış islam qardaşı,
Heyhat gündən, zülmət gündən aman hey.

Canlar asar mərkəbinin boynuna,
Müsəlmanlar gəlməz onun oynuna,
Kafirlər haqq bilıb girər dininə,
Heyhat gündən, zülmət gündən aman hey.

Dəccal xəlqə vurar, Kəbə çevrilər,
Buludlar çarpışıb, tufan qurular,
Teyrin Əbabildən kafir qırılar,
Heyhat gündən, zülmət gündən aman hey.

İsa sahibzaman gələr ol dəmdə,
Adil kişi vəzir olar ol gündə,
Tutaraq Dəccalı vurarlar onda,
Heyhat gündən, zülmət gündən aman hey.

Üç mərtəbə boyda Xərdəccal qatı,
Qovub yetə bilməz Mehdinin atı,
Ol gün götürülər Quranın xətti,
Heyhat gündən, zülmət gündən aman hey.

Ol ünü eşidib yəcuc qırx ildən,
Qaf dağını deşib gələr bir yerdən,

Udar, heç nə qoymaz fani dünyadan,
Heyhat gündən, zülmət gündən aman hey.

Məxdumqulu deyər sözün kəsəsin,
Haqdan özgə heç kim bilməz çarəsin,
Yəcuc sonun görər məhşər qovğasın,
Heyhat gündən, zülmət gündən aman hey.

## XARAB EYLƏR

Mömin olan münkir olmaz sözümə,
Cabbar bu cahanı, gör, xarab eylər,
Çox nərsələr gələr-keçər gözümə,
Bu dünyanı bəd-bəd kar xarab eylər.

İşi rəvaç tapar bəd iş tutanın,
Diləyi tuş gəlməz haq deb yatanın,
Yer üzündə olar güc-güc yetənin,
Cahanı zülümlə zor xarab eylər.

Alimlər irfana, elmə yad olar,
Yox işlər yol olar, var iş bəd olar,
Şəriət nist olar, bəd iş səd olar,
Ölkəni bir neçə tövr xarab eylər.

Bəlxi zülüm dərdi, Nişapuru daş,
Əmman şəhrin dərya, Bəsrəni atəş,
Mədinəni aclıq, Məkkəni həbəş,
Herat, Qəndaharı mar xarab eylər.

Rum şəhrin eyləyər ildırım xarab,
Yəməni hülac yıxar, Mosulu əqrəb,
Kufəni türk pozar, Bağdad şəhrin ab,
Reyi də dəlinib, yer xarab eylər.

Sözümə qulaq ver, aqil, həmişə,
Termizə taun düşər, rənç şəhri-Kişə,
Övladi-Süfyanda adı Gümişə,
İsfahanı sahibkar xarab eylər.

Səmərqəndi qıbti ağlar, bəy basar,
Buxaranı nan qıtlığı, türk basar,
Səraxsı mərg  pozar, Mərvi qum basar,
Şirazı türk, çayan, mur xarab eylər.

Kaşğarı, Xotəni kafir hind əyər,
Çinə asimandan əqrəblər yağar,

Hər əqrəb dəvə tək bir-birnə dəyər,
Hindistanı vəba, zar xarab eylər.

Ədən şahı etcək Lahora əzmi,
Dönüb yurdun tapmaz, dağmı, ya düzmü,
Abi-Ceyhun xarab eylər Xarəzmi,
Dışında hər mülk ki var, xarab eylər.

Darqana şəhrinə göydən səs gələr,
Ol bir yavuz səsdir, eşidən ölər,
Bulğarın şəhrini ol urus alar,
Urusu Dəccalla nar xarab eylər.

Məxdumqulu, hər kim dinləsə candan,
Bu işlər ön gələr axır zamandan,
Mehdi yerdən çıxar, İsa asmandan,
Dəccalı ol iki ər xarab eylər.

## KÜRS ÇIXAR

Həqiqətdə yola girən dərvişlər
Pillə-pillə Sidrə ilə Kürs çıxar.
Başçısız, fəhmsiz yola girənlər,
Yolun şeytan vurar, yolu tərs çıxar.

Ərvah var, həm cin var, pələng var, qurd var,
Qayğı var, qüssə var, yol daşdır, dərd var,
Yola girər olsan, beş-altı şərt var,
Şərtsiz yola girsən, qarşı bars çıxar.

İsrafil sur çalsa, yer-göy əyilsə,
Şeytan haray çəksə, dağlar yıxılsa,
Dəccal yerə ensə, qoşun yığılsa,
İzi Hinddə olar, önü Qars çıxar.

Çiltən, abdal gedər, qaib qələndər,
Duaçı heç qalmaz, boşalar bəndər,
Qaf dağının gədiyində İskəndər,
Dev yoluna qoydurduğı gürz çıxar.

Məxdumqulu deyər, bir zad bilməzəm,
İşlər var ki, öhdəsindən gəlməzəm,
Ey yaranlar, bu nədəndir, bilməzəm,
Xıdır deyib əl atdığım xırs çıxar.

## OTURMUŞ

Qövs ərə bərabər bir kimsə yoxdur,
Tərki-dünya olub, çıxıb oturmuş.
Ağtab bir mənzildir, mənzəri haqdır,
Ol fərşi-əlaya çöküb oturmuş.

Sağ-solda iki ər, imameyn derlər,
Sağındakı — göyə eylər tədbirlər.
Solundakı — yerə sərəncam verər,
Yer əncamı ilə baxıb oturmuş.

Anladığım işi eyləyim izhar,
Babi-həqdən kəşf olmuşdır bu əsrar,
Orda Övtad derlər daha dördü var,
Dünyanın dörd küncün çəkib oturmuş.

Bunca arı, bunca pakdır zatları,
Cahan içrə onlar yaxar odları.
Yeddi ər var, Budaladır adları,
Olacaq şər işə baxıb oturmuş.

Həqiqət yolundan xəbərli ərlər,
Bu sözüm eşitcək, qulaq verərlər,
On iki ər vardır, Rüqabə derlər,
Hər işi boynuna taxıb oturmuş.

Bunlar cahana can, cahan sanki tən,
Söyləyim bəyanın, qulaq vergil sən,
Adları Nücəba, özləri çiltən,
Ərbəində müdam oxub oturmuş.

Yeddinci güruhu Nüqəba, bilin,
Üç yüz ərdir, sözə bir qulaq verin,
Üç yüz altmış altı ərən hər ilin
Hər gününə biri çıxıb oturmuş.

Bunlar kimə baxsa, o gələr coşa,
Salar dünya məstin həqiqət eşqə,

Əfradi-mənna var bunlardan başga,
Xəlqi məlamətə yaxıb oturmuş.

Məxdumqulu deyər, dostlar, mən gümrah,
Heyran qaldım, bir mənzildə tapmam rah,
Üç yüz gəlib etdi özünə həmrah,
Yanıq bağrım yaşın töküb oturmuş.

## YAŞIL ZÜMÜRRÜD

İlk asiman tutmuş əxtərdən zinət,
Adı Rəfa, əsli yaşıl zümürrüd,
Fəriştəsi vardır sığır surətli,
Böyükləri vardır İsmayıl adlı.

İkinci qat göyü desəm bu başdan,
Adı Əzlaundur, əsli gümüşdən,
Fəriştəsi vardır qartal surətli,
Böyükləri vardır Qəbayıl adlı.

Üçüncü göy rəngi seçilməz oddan,
Adı Kaydum, əsli qızıl yaqutdan,
Fəriştəsi vardır börü sifətli,
Böyükləri vardır Göybayıl adlı.

Dördüncü qat göyü sorsan nədəndir,
Adı Məun, əsli ağ incidəndir,
Fəriştəsi vardır ağ at sifətli,
Böyükləri vardır Nunyayıl adlı.

Deyim göyün qoy beşinci qatından,
Adı Rətqə, əsli qızıl-altından,
Fəriştəsi vardır hüri sifətli,
Böyükləri vardır Səftayıl adlı.

Altıncı qat asman çıxmasın yaddan,
Adı Dəfnə, əsli sarı yaqutdan,
Fəriştəsi vardır vildan[3] surətli,
Böyükləri vardır Əbayıl adlı.

Soran yeddinci qat göydəki sirdən,
Adı Əcibədir, asmanı nurdan,
Fəriştəsi vardır adam surətli,
Böyükləri vardır Nurbayıl adlı.

---

[3] Vildan – behiştdəki oğlanlar.

Yerdə, asimanda olan səriştə,
Nizam verənləri bu dörd fəriştə:
Mikayıl, İsrafil, Əzrayıl adlı,
Dördüncüsü vardır Cəbrayıl adlı.

Məxdumqulu, faş eyləsən sirrin həm,
Yiyəsi var dəryanın həm, yerin həm,
Yerin bəyi olsun Sərsayıl adlı,
Dəryalar böyüyü Qərqayıl adlı.

## ONDA VAR

Birinci qat yerin adı Rəmkadır,
Akım adlı yavuz yellər onda var,
Yetmiş min fəriştə onda saxlanır,
Min qaim əzəli bağlar onda var.

İkinci qat yerin adı Hüldadır,
Quyruğu nizə tək xərçəng ondadır,
Asi adam üçün gözü yoldadır,
Nər-buğra biləkli bövlər onda var.

Altı yüz altmışdır onurğa daşı,
Hər birin altı yüz altmışdır başı,
Hər başda altı yüz altmışdır dişi,
Dağlar dözməz bəd ağılar onda var.

Üçüncü yer adı Arxayi-Afaq,
Odunu dəmirdən, dözməyir torpaq,
Duzəx ənquru var dağdan uluğraq,
Gerçəkdən imansız qullar onda var.

Dördüncü qat yerin adıdır Hürpa,
İlanlarnın dişi dərəxti-xurma,
İstisı yandırar, öldürər sərma,
Tən, can dözməz, dinməz vaylar onda var.

Beşinci yer adı Səlman zəmindir,
Almaz daş vurarlar hər kim bidindir,
Altıncı qat yerin adı Siccindir,
Tamuluq olacaq canlar onda var.

Yeddinci yer adı Qəribə dildə,
Duzəxdən qorxub gəz, xudanı bil də,
Şeytan ordan enib-çıxar hər ildə,
Fəraqi der, yaman günlər onda var.

## VARDIR

Qonar, burdan başqa yerə köçərlər,
Kirişsiz qurulan yayları vardır.
Yaxasız, ətəksiz bir don biçərlər,
Qapısız, bacasız öyləri vardır.

Axirət öyünə rahat qoyarlar,
«Haq rəhmət eyləsin» - dua qılarlar,
«Mən rəbbük?» söyləyən qullar gələrlər,
Kim cavab verməsə vayları vardır.

Əməlin pis olsa, yer səni sıxar,
Sümüyün şaqqıldar, qəlbin tıncıxar,
Sağından-solundan od-alov çıxar,
Binamazın belə köyləri vardır.

«Əsfələs-səfilin» ona dərkardır,
Şeytan onun üçün çox mədədkardır,
Cəhənnəm deyilən bir duzəx vardır,
Qeybətkeşin onda cayları vardır.

Haramidir, neçə gündür izləyir,
Tapa bilsə, pünhan yerdə gizləyir,
Oğru gəldi, mal yiyəsi sözləyir,
Siccin, Veyl adlı cayları vardır.

Görə bilməz qardaşını, elini,
Kecə bilməz onda sirat yolunu,
Tamsına-tamsına çeynər dilini,
Burda neçə-neçə ayları vardır.

Bismillah de, oxu Qurani-yasin,
Könlündən çıxarma haqqın sənasın,
Məxdumqulu, haqq keçirsin günasın,
Cənnətül-məva tək cayları vardır.

## VAR

Sofular, səfilər, hazır olunuz,
Əcəl vardır, həyat vardır, vəfat var.
Yaman işdən həmmə nazir olunuz,
Soraq vardır, sual vardır, heyhat var.

Münkər-Nikir dar məzara gələrlər,
«Tanrın, rəsulun kim?» deyib sorarlar,
Bilməz isən çox əzablar verərlər,
Gürzü vardır, qəhər vardır, heybət var.

Ol qaranlıq gor içində yatarsan,
Biçarəsən, haq buyruğun tutarsan,
İsrafil surunda yerdən çıxarsan,
Məhşər vardır, mizan vardır, sirat var.

Onda mizan tərəzəsin qurarlar,
Əməllərin həmin yerdə sorarlar,
Asiləri duzəx sarı sürərlər,
Məlik vardır, duzəx vardır, həm od var.

Məxdumqulu, yaşın eyləgil giryan,
Ol gün heybətindən qılsın haqq asan,
Ölsə axır dəmdə həmrahı iman,
Cənnət vardır, möhnət vardır, nicat var.

## QIZDIR BU DÜNYA

Nəsihətim budur, bəyan eyləsəm,
Cilvəli, pakizə qızdır bu dünya.
Şikayətin deyib, əyan eyləsəm,
Aləmə aşkara sözdür bu dünya.

Dəccal xüruc edib çıxar şikara,
Namazxanlar tez yetişər didara,
Binamaz üzünə çəkiblər qara,
Otuzda, qırx beşdə aldı bu dünya.

Neçələr qan ağlar, ötər zülmətdən,
Müvəkkil fəriştə keçər siratdan,
Heç bir fayda gəlməz pirdən, ustaddan,
Doğru-yalanını bildi bu dünya.

Xudanın əzizi həzrəti Musa,
Ot yedi, su içdi, əlində əsa,
Bibi Məryəm oğlu həzrəti İsa,
Onu qırx il padşah qıldı bu dünya.

Bu dünyada beş gün sağü var olsan,
Niyyəti qısılan, feli dar olsan,
Yoxsulluqdan cana doyub zar olsan,
Mərdi namərdə zar qıldı bu dünya.

Neçələri cəfa ilə möhnətdə,
Neçələri qayğı ilə külfətdə,
Namazxona qırx fəriştə xidmətdə,
İşrəti sizə dar etdi bu dünya.

Ol siratda qanadların qayrılar,
Neçələr keçəmməz, boynu burular,
Bundan düz keçənlər behiştə girər,
Bu könüldən qəmi aldı bu dünya.

Neçələri ağlar, həm bağrı qandır,
Keçməyən, saralıb duranlar kandır,

Burda olan işlər tamam pünhandır,
Pünhanını aşkar etdi bu dünya.

Məxdumqulu sözü tükənməz əda,
Əcələ fərq etməz şah ilə gəda,
Altmış üçdə ötdü peyğəmbər-xuda,
Oları oğulsız qıldı bu dünya.

## FƏLƏYİDİR

Sərimizə sevda salan,
Gözəl haqqın fələyidir,
Şeytan çıxar dinləməyə,
Ulduzlar ona yağıdır.

Qələm yazanda sər xətti,
Asi yazmış biz ümməti,
Adəm atanın sülbəti,
Yeddi yerin torpağıdır.

Əgər sözə versən qulaq,
Fəriştələr durar lək-lək,
Göy götürən səkkiz mələk,
«La ilahə!» diləyidir.

Xəlil gəldi tiğ çəkməyə,
Oğlunu qurban etməyə,
Qoymayan qanın tökməyə
Cəbrayılın yeləyidir.

Qurd ağlar Yaqub yanında,
Düldül Əlinin şanında,
İsa eşşəyin minəndə,
Sığır Musa ulağıdır.

Tanrı yaratdı heyvanı,
Behişt görməz məhşər günü,
Səkkiz heyvanın məskəni
Derlər: cənnət bulağıdır.

Əcəb mənzil, gözəl caylar,
Gün qızdırmaz, batmaz aylar,
Behişt otlağında yaylar,
Hövzi-kövsər sulağıdır.

Nəmrud haqqı çox dışladı,
Şəddad bir cənnət başladı,

Dörd yüz illikdə işlədi,
Adı həm İrəm bağıdır.

Məxdumqulu, söz baqisi,
Gözündə qəflət uyğusu,
Qarşında əcəl səkisi,
Qafil adam duzağıdır.

## ŞƏFA VER

Bu çöldə rəhm eylə qərib halıma,
Aləmi yaradan sübhan, şəfa ver.
Bu yaralı, dərdli şirin canıma,
Ya Mustafa, fəxri-cahan, şəfa ver.

On iki imam, biri-birindən sərvər,
Yeddi vəli, yaran olub, mədəd ver,
Məşhəd, Qara Baba, ya şes peyğəmbər,
Həsən, Hüseyn, Şahi-mərdan, şəfa ver.

Nuh peyğəmbər, nəzər eylə bir nəfəs,
Ömrümü bihudə keçirdim – əbəs,
Zəkəryə peyğəmbər, ya Xıdır İlyas,
Kavus, Qiyas, Musa, İmran, şəfa ver.

İbrahimin candan ayrıldı tabı,
Kəbə varan hacı tapar səvabı,
Qara Aləm ata, ya Xələt nəbi,
Gözlü ata, Baba Salman, şəfa ver.

Özün doğru gözlə, ya rəbbim cəlil,
Hamının rizqinə sən özün kəfil,
Ya Davud, ya Cərcis, İbrahim Xəlil,
Əbubəkr, Ömər, Osman, şəfa ver.

Dad edib, dilimdən qıldım fəğanlar,
Yaş yerinə axdı gözümdən qanlar,
Xarəzm yurdunda yatan cananlar,
İsmi Mahmud – ər pəhlivan, şəfa ver.

Mövlam, yetir məskənimə, yurduma,
Üzüm düşsün aslanıma, qurduma,
Məxdumqulu deyər, mənim dərdimə,
Dünyanın təbibi Loğman, şəfa ver.

## AZADİ – MƏXDUMQULU

*Azadi:*
- Faş eylə sirrini, saxlama pünhan,
Amma ki, sözümdən çıxmagil, oğlum!
Gündə yüz köy gələr-keçər bu başa,
Ağrıtma, könlümü yıxmagil, oğlum!

*Məxdumqulu:*
- Utanardım, sirrim faş eyləməzdim,
Faş edərəm, xəbər alsan, Azadim!
Yüz köy gələr-keçər hər gün bu başa,
İstəyim var səfər qılam, Azadim!

- Cəfa çəkmə özün, çağır mövlanı,
Arzulama xanı, bəyi, sultanı,
Bəsdir bizə əvvəl tanrı verəni,
Aldırma könlünü, getməgil, oğlum!

- Getmürəm ki, altı ilə, beş ilə,
Seyran edək bir neçə tay-tuş ilə.
Bəlkə onda qəmgin könlüm xoş ola,
Könül qalxar, qərar etməz, Azadim!

- Vərzişin yox, gəncsən, gedə bilməzsən,
Şövür var, şovhun var, çıda bilməzsən,
Hər işə baş qoşub, edə bilməzsən,
Getməklik söhbətin etməgil, oğlum!

- Kişi sözləməyən sirri faş olmaz,
Yaxşıdan-yamandan gözü yaş olmaz,
Şu gəz yollamasan, könlüm xoş olmaz.
Yolumu qaytarma, qoy ver, Azadim!

- Bizi belə niyə tərk edəsin var?
Bu yol bixudadır, bir gedəsin var.
Gəl, getməyil, oğlum, iltimasım var,
Xərcə, xəracata batmagil, oğlum!

- Qəlbimə giribdir islam həvəsi,
Təngədir, dirhəmdir xalqın təməsi,
Könlüm bikef etmə, sıxma nəfəsi,
Bir səfər işidir, qoy ver, Azadim!

- Quran oxu, öyrən, yaxşı kəlamdır,
Ən gözəl din bizim dini-islamdır.
Yollar qaranlıqsa, səfər haramdır,
Ölərsən, qalarsan, getməgil, oğlum!

- Qoy görüm, sınayım bu gün iqbalım,
Yaxşı gün, xoş saat gəlibmi salim,
Qəsd edib canıma, yetsə əcəlim,
Bu yerdə həm olsa, tapar, Azadim!

- Bilə-bilə özün nara atarsan?
Bu nə işdir, bunu belə tutursan?
Söylə görüm, sən kimilə gedirsən?
Dəm çəkib hər yana baxmagil, oğlum!

- Cilovdarı olam Yazır xan pirin,
Könül quşu pərvaz edər fəqirin,
Bu gün yeddi gündür «Əl-həmd» oxurum,
Şad eylə könlümü, qoy ver, Azadim!

- Azadi der, belə səfa sürəlim,
Bu yolu da sınayalım, görəlim,
«Amin!» de, dur, oğlum, fatə verəlim,
Bir Tanrı yar olsun sənə get, oğlum!

- Məxdumqulu deyər: qalmışam çoxdan,
Könül quşu pərvaz edir uzaqdan,
Hər yerdə sağlığım istə ol haqdan,
Dua qılıb, haqqa yalvar, Azadim!

## MƏĞRUBİ – MƏXDUMQULU

*Məğrubi:*
- Kamil olsan, səndən xəbər alayım,
Bizə yeddi ilə beşdən xəbər ver,
Üç başlı, bir gözlü, əlli-ayaqlı,
Qüdrətdən işlənən quşdan xəbər ver.

*Məxdumqulu:*
- Məğrubi, sən bizdən cavab sorasan,
Yeddi iman, islam beşi böylədir,
Üç başlı, bir gözlü, əlli-ayaqlı,
Cəsəd içrə canın quşu böylədir.

- Cənnət bilsən nə məkanda, nə yerdə,
Hansı gün ay tutar üzünə pərdə,
Altı min altı yüz iyirmi dörddə,
Hesab eylə, əvvəl başdan, xəbər ver.

- Cənnət ərş altında, göy üstü yerdə,
Məhşər gün ay tutar yüzünə pərdə,
Altı min altı yüz iyirmi dörddə,
Saqat olar əvvəl başı, böylədir.

- Bir hərfimdə dörd yüz hesabım hanı,
Xəbər ver, altmış iki cavabım hanı,
Günahım neçədir, səvabım hanı,
Yaxından soruşma, dışdan xəbər ver.

- Bir hərfdə dörd yüz nədir (?) hesabı,
Sorlar meytdən altmış iki cavabı,
Günahın çox, haqq fərmanı səvabı,
Cəhənnəmin olan dışı böylədir.

- On səkkiz min şəhrin xanı neçədir,
Bir il səcdəsinin sanı neçədir,
Yarağı doqquzdır, donu neçədir,
Bir qırxdan, bir dörddən, üçdən xəbər ver.

- On səkkiz min şəhrin mövlamdır xanı,
İl səcdəsi qırx min səkkiz yüz sanı,
Doqquz fələk var, yer üzünün donu,
Çiltən, dörd yar, vitr üçü, böylədir.

- O kimdir ki, boylamadı günahdən,
O kimdir ki, əl götürmiş sənadan,
Nə səbəbdən uçub gəldi asmandan,
Kafir üçün enən daşdan xəbər ver.

- Şeytanləin, əl çəkmədi günadan,
Feli azan əl götürdü  sənadan,
«Teyr əbabil» uçub gəldi asmandan,
Kafir üçün enən daşı böylədir.

- Asman burdan neçə illik mənzildir,
Bizdən altda nə məxluqdır, nə eldir,
Dünyanın genliyi neçə il yoldur,
Müdam ölməz yatan leşdən xəbər ver.

- Asman burdan beş yüz illik mənzildir,
Altda şeytan, pəri, cin olan eldir,
Dünyanın genliyi beş yüz il yoldur,
Loğman ölməz, yatan leşi böylədir.

- O kimdir ki, dərya enər başına,
Nəm tökülməz kirpiyinə, qaşına,
Kim işarət etdi nəqi daşına,
Atadan-anadan, beşdən xəbər ver.

- Cəbrayılın dərya ensə başına,
Nəm tökülməz kirpiyinə, qaışına,
Saleh işarət etdi nəqi daşına,
Ata-ana, qoç, əsa (?), beşi böylədir.

- Nə ağacdır dörd min olar sayası,
Dağı on beş, iyirmi bir qayası,
Ol nə taxtdır yetmiş mindir payası,
Dörd gözlüdür, həm bir başdan, xəbər ver.

- Şəcərətül-əyn dörd min olar sayası,
Fərz – on beş, iyirmi bir vacib qayası,
Təxt-Süleyman, yetmiş mindir payası,
Əzrayıl, dörd gözlü başı, böylədir.

- Nə heyvan, dörd min baş, səkkiz min şaxlı,
Nə saraydır mömin üçün yasaqlı,
Məğrubi der, fəhm et, dolandır ağlı,
Bir izi üzülməz köçdən xəbər ver.

- Yeri tutan öküz, dörd min baş, səkkiz min şaxlı,
Cənnət öyi mömin üçün yasaqlı,
Məxdumqulu der, sənə gətirdim ağlı,
İzi üzülməz ölüm köçü böylədir.

## DURDU ŞAİR – MƏXDUMQULU

*Durdu şair:*
– Bizdən salam Məxdumqulu ustada,
Atamız Adəmin donun kim biçdi?
Dumanlı sərinə qurban olalı,
Bilmədik, məlaik meyin kim içdi?

*Məxdumqulu:*
– Bizdən cavab olsun Durdu şairə,
Cəbrayıl gətirdi, rizvanlar biçdi.
Qüdrət ilən şol şeytanın şərbətin
Adəm ata ilə Həvv ana içdi.

– Aləm dairəsi nə rəngli dağdır?
Ol nə quşdur, daim onda dustaqdır?
Aşiqlər sevdiyi o nə bulaqdır?
Həftayıl əbvabın varıb kim açdı?

– Qaf dağı zəbərcət rəngbərəng dağdır,
Kaknus bir quş, daim onda dustaqdır,
Mükəsat deyərlər əcəb bulaqdır,
Həftayıl əbvabın aşiqlər açdı.

– Təlamun dağında kimdir gəzənlər?
Mömin burda, kimdir orda yazanlar?
Şəmaətdə farağatı düzənlər
Neçə ildə yerdən göyə yetişdi?

– Təlamun dağında zahid gəzdilər —
Mömin burda, bərat orda yazdılar,
Şəmaətdə farağatı düzdülər,
Hər qırx ildən Zöhrə göyə yetişdi.

– Tanrının cahanda, bil, dağı neçə,
Behiştdə tubunun budağı neçə,
Üzünün məşqinin varağı neçə,
Behiştin kılidi kimə qovuşdu?

– Yeddi iqlim vardır, yeddidir dağı,
Yetmiş mindir ol tubunun budağı,
«La ilahə» olar məşqin varağı,
Behişt qıldı, rəsulüllah qovuşdu.

– De harda yaratdı səkkiz cənnəti,
Neçə binası var, neçə kümbəti,
Neçə arxı vardır, nəmədir adı,
Teyrin əbabillər kimə qovuşdu?

– Asmanda yaratdı səkkiz cənnəti,
Altı min binadır, birdir kümbəti,
İçində dörd arx var, Müsəvvər adı,
Əbabil əshabil-filə qovuşdu.

– De harda yaratdı sağar duzəxi?
Neçə quyusu var, neçə bulağı?
İçində bir ilan, nədir sorağı?
Qüdrət ilə ol mar kimə dolaşdı?

– Yeddi qat yerdədir sağar duzəxi,
Veyldir quyusu, Siccin bulağı,
Harış ilan, qeybətkeşdir sorağı,
Yalançı, zinaxar, oğra dolaşdı.

– Durdu şair deyər, yollar uzaqdır,
Mən bilmənəm, fani kimə duzaqdır?
Özünü bilməsən, yerin duzəxdir,
Doxsan doqquz min ər harda qovuşdu?

– Məxdumqulu, eşq meydanı uzaqdır,
Fani dünya möminlərə duzaqdır,
Allah bilər, kimin yeri duzəxdir,
Doxsan doqquz min ər surda qovuşdu.

## AZADİ – MƏXDUMQULU

*Azadi:*
– Şeytanın hansı oğludur
Adəm ata ilən düşdü?!
Haqqın rəsulu peyğəmbər
Xeybərdə necə vuruşdı?!

*Məxdumqulu:*
– Şeytanın Hənnas oğludur,
Adəm ata ilən düşdü.
Xeybər dağında peyğəmbər
Düz yeddicə ay uruşdı.

– Hazır yiyəsi Düldülün
Bilirsənmi kimdir, bilin!
Hansı gün Qabil Habilin
Öldürüb qanını içdi?!

– Hazır yiyəsi Düldülün
Mələk-fəriştədir bilin!
Şənbə gün Qabil Habilin
Öldürüb qanını içdi.

– Nədir, qalxıb, hava uçdu,
Nəsindən zəminə düşdü?
Neçə gündə Nuhun kişti
Cunidin dağına düşdü?

– Dərya qalxıb, hava uçdı,
Kopüyündən yerə düşdü.
Yetmiş gündə Nuhun kişti
Cunidin dağına düşdü.

– Rum şəhrinin sərdarı
Harda saldırmış gülzarı?
Hansı qalanın divarı
Məhəmmədlə merac aşdı?!

– Şəddad ol Rumun sərdarı
Şamda saldırmış gülzarı,
Müqəddəs şəhrin divarı
Məhəmmədlə merac aşdı.

– Azadi söyləyər yetmiş,
Nədir bu dünyanı tutmuş,
Hansı peyğəmbərdir itmiş,
Harda qardaşa uğraşdı?

– Məxdumqulu deyər: yetmiş,
İqlimdir, dünyanı tutmuş,
Yusif peyğəmbərdir itmiş,
Misirdə elə uğraşdı.

## MƏXDUMQULU – ZÜNUBİ

*Məxdumqulu:*
- Ol nə gövhər, nədir onun bəyanı,
Ya müəllim, bizə bundan xəbər ver.
Nə sandıqdır onun mənzil-məkanı,
Ustad olsan, bizə bundan xəbər ver.

*Zünubi:*
- İman gövhər, oldu onun bəyanı,
Ustad qılsan, bizdən xəbər böylədir:
Könül sandığıdır mənzil-məkanı,
Bizi ustad bilsən, xəbər böylədir.

- Nə tavusdur onun olsun bəyanı,
Hansı mənzil idi onun məkanı?
Ol nə ustad idi, nədir dükanı?
Ustad olsan, bizə bundan xəbər ver.

- Rəsul nuri-tavus, oldu bəyanı,
Şəcərətil-yəqin idi məkanı,
Qadir Allah ustad – qüdrət dükanı,
Bizi ustad bilsən, xəbər böylədir.

- Neçə əyyam həmin mənzildə oldu?
Fəhm eyləyib sözlə, neçə iş qıldı?
Beş vaxt namaz əsli nə beşdən qaldı?
Ustad olsan, bizə bundan xəbər ver.

- Yetmiş min il həmin mənzildə qaldı,
Miratil-həyaqa bir nəzər saldı,
Öz surətin görüb, beş səcdə qıldı,
Ustad bilsən, bizdən xəbər böylədir.

- Neçə məbud bir məbuddan basıldı?
Hansı isbat oldu, hansı lə oldu?
İslam dini nədən qüvvətli gəldi?
Ustad olsan, bizə bundan xəbər ver.

- «La ilahə illəllah» tək yazıldı,
Üç yüz altmış sənəm Kəbədə oldu,
İslam dini sonra qüvvətli gəldi,
Bizi ustad bilsən, xəbər böylədir.

- Ol nə dərya, ona girən çıxmayar?
Nə mənzərdir nəzər-haqqın mehri var?
Fəhmi-şumar ilə qılıb ixtiyar,
Ustad olsan, bizə bundan xəbər ver.

- Ant bir dərya, girsə çıxmaz hər bəndə,
Nəzərgah var hər mömінin könlündə,
Üç yüz altmış nəzər eylər haqq gündə,
Bizi ustad bilsən, xəbər böylədir.

- Ol nə bağdır, onda meyvə tapılmaz?
Nə buluddır, onun varanı olmaz?
Nə zülmətdir, qəmər şöləsin salmaz?
Ustad olsan, bizə bundan xəbər ver.

- Amalsız alimlər bağdır səmərsiz,
Yağmaz bulud — asilərdir xəbərsiz,
Küffar əhli bir zülmətdir qəmərsiz,
Bizi ustad bilsən, xəbər böylədir.

- Nə yerdən qıldı haqq adamın başın?
Nə mənzil xakindən eylədi dişin?
Nə yerdən eylədi bu könül xoşun?
Ustad olsan, bizə bundan xəbər ver.

- Beytül-müqəddəsdən qıldı başını,
Kövsər toprağından qıldı dişini,
Firdövsin xakindən könül xoşunu,
Bizi ustad bilsən, xəbər böylədir.

- Ayaqları bir-bir əyan eyləgil.
Sümükləri bir-bir bəyan eyləgil.
Çeşmini nə yerdən, bəyanın degil,
Ustad olsan, bizə bundan xəbər ver.

- Ayaqları Hindistandan eylədi,
Sümükləri Dağıstandan eylədi,
Çeşmin hovuz ol bostandan eylədi,
Bizi ustad bilsən, xəbər böylədir.

- Mübarək camalı, bil, nədən oldu?
Qollarının xakin nə yerdən aldı?
Bəyan eylə, dilin nə yerdən qıldı?
Ustad olsan, bizə bundan xəbər ver.

- Cənnət toprağından qıldı camalın,
Sağ əlin Kəbədən, farsdan solun,
Taıf toprağından şirin zəbanın,
Bizi ustad bilsən, xəbər böylədir.

- Nə hoqqadır, nə bərrədir çaharı?
Nə bülbüldür, nə əjdərdir, nə börü?
Nə çobandır, baxar leylü nəharı?
Ustad olsan, bizə bundan xəbər ver.

- Könül hoqqasında bərrə imandır,
Nəfsin  əjdəhadır, börü, şeytandır,
Taətin  bülbüldür, ağlın  çobandır,
Bizi ustad bilsən, xəbər böylədir.

- Nə günəşdır hesabını biləli?
Neçə ildir gözdən nihan olalı?
Necə sirdir sizdən xəbər alalı?
Məxdumqulu, bizə bundan xəbər ver.

- Rəsul gündür, hesabını tutalı,
Min iki yüz on bir ildir yatalı,
Əcəl körpü, gəl, didara ötəli,
Zünubi der, bizdən xəbər böylədir

## MƏXDUMQULU – MƏĞRUBİ

*Məxdumqulu:*
- Gəl, Məğrubi, cavab ver, ol nədir, divanı dörd?
Məlaikə qurulan ol nədir, eyvanı dörd?
Ol nə yaydır, çəkilər onun da peykanı dörd?
Ol nə kimsə ötəndir, əhd ilə peymanı dörd?
Ver cavabın bu sözün, həftəyü qurbanı dörd?

*Məğrubi:*
- Tapdım cavabın, şair, ömründür, divanı dörd,
Məlaikə qurulqan məclisin eyvanı dörd,
İman oxdur, atılar, onun da peykanı dörd,
Şahi-mərdan Əlinin əhd ilə peymanı dörd,
Bir ayın dörd həftəsi, cümədir qurbanı dörd.

- Çay ilə nan üstündə hansı peyğəmbər durdu?
Ol kim idi davara çoban eylədi qurdu?
Ol kim idi gülüstan-İrəm bağına girdi?
Ol kim idi dünyada rəşid pirini gördi?
Ol nə kimdir, ötəndir həm tiğ, həm bürranı dörd?

- Çay ilə nan üstündə Musa peyğəmbər durdu,
Özü idi qoyuna çoban eylədi qurdu,
Şiri-xuda gülüstan-İrəm bağına girdi,
Əli idi dünyada rəşid pirini gördi,
Şiri-xuda Əlinin həm tiğ, həm bürranı dörd.

- Hansı məlik dünyadan oğulsız ötdü getdi?
Ol nə qadın, bir axşam ərini uddu getdi?
Ol kim idi dünyasın üqbaya satdı getdi?
Ol kimdir gənci-malı torpağa batdı getdi?
Ol nə sədəf, açılmış gövhəri-qəltanı dörd?

- Süleymandır dünyadan oğulsuz ötdü getdi,
Ol hümmətli Ay idi, ərini uddu getdi,
Xıdır nəbi dünyasın üqbaya satdı getdi,
Qarunun gənci-malı torpağa batdı getdi,
Sədəf gövhər açılmış həm dürri-qəltanı dörd.

- Ol kim idi dünyada Qülzüm dəryadan keçdi?
Ol kim idi narıncda əcəb gülzara düşdü?
Ol kim idi səxavət, cənnət qapısın açdı?
Ol kim idi hamıya ölçək donunu biçdi?
Ol kimdir ki, oturar cənnətdə, mehmanı dörd?

- Həmzə idi dünyada Qülzüm dəryadan keçdi,
Özü ikən narıncda dürlü gülzara düşdü,
Şahi-adil səxavət, cənnət qapısın açdı,
Səyyad əcəl dünyada hamının donun biçdi,
Rəsulüllah oturar, yanında mehmanı dörd.

- Ol nə şagird əzəldən xidmət edər ustada?
Ol nə şəhri-zinadır, külli gedər bərbada?
Ol nə bülbül, oxuyar, feyzi gedər səmada?
Hansı peyğəmbər idi vardı Allaha dada?
Hansı peyğəmbər idi dilində sənası dörd?

- Ruhül-əmin Cəbrayıl xidmət edər ustada,
Lutun şəhri zinadır, varı getdi bərbada,
Həmranın bülbülüdir, feyzi gedər səmada,
Ol İbrahim peyğəmbər, vardı Allaha dada,
Haqqa qıldı münacat, dilində sənası dörd.

- Məxdumqulu, xəbər ver, ol kim, dəryaya daldı?
Hər dəm nərə çəkəndə dəryanı tufan aldı?
Ol kim idi bir nəzər kuhi-Marıda saldı?
Anın vahiməsinə İran Turana gəldi,
Ol nə quşdur, uçmada asmana, pərvazı dörd?

- Məğrubi der, Zülfüqar idi dəryaya daldı,
Hər dəm nərə çəkəndə dəryanı tufan aldı,
Əli idi, bir nəzər kuhi-Marıda saldı,
İran-Turanı gəzib, əzmi-Xorasan gəldi,
Ol könüldür, uçmada asmana, pərvazı dörd.

## MƏXDUMQULU – DURDU ŞAİR [4]

*Məxdumqulu:*
- Ol nədir ki, yaşıl-qızıl bürünər?
Ol nədir ki, ayağı yox, sürünər?
Ol nədir ki, yeddi dərya görünər?
Şair olsan, bundan bizə xəbər ver.

*Durdu şair:*
- Ol əkindir, yaşıl-qızıl bürünən,
Ol ilandır, ayağı yox sürünən,
Ol balıqdır, yeddi dərya görünən,
Bizdən salam olsun, cavab böylədir.

– Ol nədir ki, yaxası var, yanı yox?
Ol nədir ki, qanadı var, qanı yox?
Ol nədir ki, adam udar, canı yox?
Şair olsan, bundan bizə xəbər ver.

– Ol kəfəndir, yaxası var, yanı yox,
Kəpənəkdir, qanadı var, qanı yox,
Qara yerdir, adam udar, canı yox,
Bizdən salam olsun, cavab böylədir.

– Ol nədir ki, darvazasız qaladır?
Ol nədir ki, pəncərəsiz binadır?
Ol nədir ki, bir-birindən aladır?
Şair olsan, bundan bizə xəbər ver.

– Ol könüldür, davazasız qaladır,
Ol qəbirdir, pəncərəsiz binadır,
Ol ay-gündür, bir-birindən aladır,
Bizdən salam olsun, cavab böylədir.

– Ol nədir ki, yemədilər, doydular?
Ol nədir ki, qiyamətə qoydular?
Ol kim idi, dabanından soydular?
Şair olsan, bundan bizə xəbər ver.

---
[4] Deyişmənin ilk bəndləri əlyazmada yoxdur.

– Ol didardır, yemədilər, doydular,
Ol namazdır, qiyamətə qoydular,
Nəsimini dabanından soydular,
Bizdən salam olsun, cavab böylədir.

– Ol nədir ki, yeddi ölkəni gəzən?
O nədir ki, belini bir zad əzən?
O nədir ki, adam misalı sızan?
Şair olsan, bundan bizə xəbər ver.

– Ol çobandır, yeddi ölkəni gəzən,
Ol qoyuundur, dayaq belini əzən,
Bədəv atlar adam misalı sızan,
Bizdən salam olsun, cavab böylədir.

– Ol nədir ki, torpaq üstə sürünməz?
Ol nədir ki, adamlara görünməz?
Ol nədir ki, heç bir dona bürünməz?
Şair olsan, bundan bizə xəbər ver.

– Ərənlərdir, zəlil olub sürünməz,
Ol bəladır, gəlsə, gözə görünməz,
Yalan söhbət heç bir dona bürünməz,
Bizdən salam olsun, cavab böylədir.

## MƏXDUMQULU – ORAZ XAN [5]

*Məxdumqulu:*
- Bizdən salam olsun, ol Oraz xana!
Taxt ustündə kimdir rəvac oturmuş?
Qırx kasa mey quyub qızıldan cama,
Ol kimsədir varın başa götürmiş?!

*Oraz xan:*
- Bizdən salam olsun ustad Firağa,
Süleyman ərk-taxta rəvac oturmuş!
Bilqeys qoyub, qırx kasa mey ol cama ,
Ərənlər yığılıb başa götürmiş

- Nə aşiqdır, ağlar, gözdə yaşı yox,
Nə gövdədir çiyni üstdə başı yox,
Ol nə gözdür, kirpiyi yox, qaşı yox,
Gözlülərdən yaxşı nərsələr görmiş?!

- Məşrəb ağlar, gözlərində yaşı yox,
Ol zəmindir, gövdəsi var, başı yox,
Afitabdır kirpiyi yox, qaşı yox,
Cahana dolanar, çox nərsə görmüş.

- Ol nə quşdur, qanadsız da uçadır,
Ol nə saldır, ümmanlardan keçədir,
Ol nə kişi, yeddi dərya içədir,
Səkkizi gözləyib, məstana varmış?!

- Cansız quşlar qanadsız da uçarmış,
Dəniz üzüb, ümmanlardan keçərmiş,
Yürüməz, canı yox, gör, su içərmiş,
Birin alsa, səkkiz məstana varmış.

---
[5] Deyişmənin əlyazması yarımçıqdır.

## KİMDƏDİR?

Bizdən salam Orazmənli şairə,
İslamla kafirın fərqi kimdədir?
Ol nə quşdur qonar adam sərinə,
Onun qonar-qonmaz ərki kimdədir?

Nə bəndədir, qulluq edər, zad almaz,
Nə aşnadır, min il gedər, yad olmaz,
Olar kimdir — ağlar gəzər, şad olmaz,
Harda söhbət edər, rizqi kimdədir?

İdris orda harda edər söhbəti,
De kimdədir yerin-göyün qüvvəti,
Ol nə quşdur, altı mindir qanadı,
Ay-günün, ulduzun görkü kimdədir?

Başüstə asdılar hansı ağacı,
Haq hansı dostuna verdi meracı,
Bizim peyğəmbərə verilən tacı,
Xəbər ver, bunun tək börkü kimdədir?

Bəylər, Məxdumqulu, lisan xoş gəldi,
Söylə, İsa göydə nə şəhrə endi,
Peyğəmbər kimsəyə vəsiyyət qıldı,
Əsası, xirqəsi, kürkü kimdədir?

## DURUBDUR

Bir çürük qoz ilə cahan cövhərin
Ol nə qumarbazdır ütüb durubdur.
Çürük saman etmiş məta bazarın,
Gövhərə bərabər satıb durubdur.

Nə döşəkdir, ona basan yarımaz,
Nə gəmidir, suya batmış, yürüməz,
Nə anadır, ölməz, itməz, qarımaz,
Öz balasın özü udub durubdur.

Nə çıraqdır, gözsüzlərin yarıdır,
Nə güzgüdür, bu aynadan arıdır,
Nə saqidir, piyaləsin yürüdür,
Bir əli boğazdan tutub durubdur.

Nə məxluqdur, nə erkəkdir, nə dişi,
Bir gözü dümağdır, bir gözü çaşı,
Rəngi qara, ala, on iki başı,
Yeri-göyü birdən tutub durubdur.

Başı varıb çıxmış ərşin üstünə,
Ayağı enmişdir yerin altına,
Canlı, cansız, hər nə gəlsə dəstinə,
Durmadan ağzına atıb durubdur.

Dostum, həvəs etmə qəhbə əyalı,
Aldadar, çox-çoxdur onun xəyalı,
Bu dünya bir kor siçanın misalı,
Kökləri birbəbir kərtib durubdur.

Dostlar, bir misaldır dilimə gələn,
Zehni olsa, bilər ağılı olan:
Cahan üzün tutmuş bir qüdrət ilan,
Quyruğu başından ötüb durubdur.

Məxdumqulu, məğrur olma bu sözə,
Heç böylə canavar dəymişmiş gözə,
Yenə bir qüdrət var, yeddi kəlpəzə,
Ol böyük ilanı udub durubdur.

## GEDİBDİR

Getmə, dayan, səndən bir xəbər alım,
Ol nədir kim, övcdən övcə gedibdir?
Neçəsi peyğəmbər, neçəsi Cəmşid,
Neçə seyid, neçə xoca gedibdir?

Haqq özü yaratdı bir yetim qızı,
Gecə taətində, gündüz namazı,
Hər dəm, hər dəm edib sirri-niyazı,
Xəbər vergil, hansı gecə gedibdir?

Ol kimdir ki, varıb dünyanı çapdı?
Ol kimdir ki, islam dinini tapdı?
İbrahim hansı il Məkkə düzəltdi?
Dağlardan hansı dağ həccə gedibdir?

Məxdumqulu haqqa qul, rəsula ümmət,
Möminlər şükr edib, Yezidə lənət,
Peyğəmbər sərvəri rəsul Məhəmməd,
Məhəmməd haçan meraca gedibdir?

## NƏDƏNDİR?

Durdu şair, səndən xəbər alım mən,
Ötən peyğəmbərin yaşı nədəndir?
Hökmi-Süleymanın yaşıl tütünü,
Meracın qapısı, qaşı nədəndir?

Ol kimdir ki, yurddan köçdü, yeridi,
Ol kimdir ki, dostun yeldən qorudu,
Ol kimdir ki, eşqi-səhra yürüdü,
Səmərdən əsası, peşi nədəndir?

Ol kimdir baqidə mübtəla qalan,
Ol kimdir elinə talanlar salan,
Qırx il hicran çəkib, saralıb-solan,
Özünə gürz vuran kişi nədəndir?

Ol nə qardır, müdam yağar, əriməz,
Ol nə dərya, müdam coşar yürüməz,
Ol nə adam, su içində çürüməz,
Axar gözlərinin yaşı nədəndir?

Ol nə ağac, altmış iki budağı,
Qırx səkkiz gəz oxun on iki sadağı,
Ol nə xandır, səkkiz imiş otağı,
Otağın içinin aşı nədəndir?

Ol kimdir, baqidə bir rövşən göz var,
Önündə mənası dörd min dörd yüz var,
Atası əridir, aşiq bir qız var,
Qoşulmaz hüriyə, daşı nədəndir?

Məxdumqulu deyər, yad elə bizi,
Yeddidir qarası, ağdır səkkizi,
Bir surətdə nədir, oldur doqquzu,
Sərindəki əqli-huşu nədəndir.

## NƏDİR

Bizdən salam olsun, Durdu şairə,
Nə mehrabdan sözlə çıxan od nədir?
Kimdir — ölüb, bir il sonra bilindi,
Doqquz yüzdən qardaş nim züryət nədir?

Sən gözlü atasan, biz gərkəz eli,
Çöl yerdə gəzərsən, yad edib heyli,
Bilərsən tamunun cəkilən mili,
Xəbər ver əslini, qıl-sirat nədir?

Əslinə yetişgil yalanda, çində,
Söz qısadır, məna çoxdur içində,
Bilərsənmi hansı dərya içində,
Adəmzad ciyərli yatan hut nədir?

Nə ağır süfrədır hansı övcdə,
Aləm xarab olar neçə tovuşda,
Qüdrət ilə dörd yüz nədir bir başda,
Çırpınanda ondan çıxan od nədir?

Nə sinə, nə candır sözlə bu sirdən,
Belindən aşağı olmuş həcərdən,
Aşiq, bəyan eylə, hansı şəcərdən,
Həm canlı, həm cansız qardaş zat nədir?

Ol kimdir ki, göz yaşını daşdırdı,
Neçə ildə əcəbadın düşdürdü,
Ol kimdir ki, zəlalətin coşdurdu,
Murad əldə ikən, namurad nədir?

Məxdumqulu deyər, aşiq, bu sirdə,
Yayınma gəl, doğru söylə bu yerdə,
Bunu bilərsənmi hansı şəhərdə,
Türkə qulluq edən iki tat nədir?

## ÜÇÜ ÖVLADDAN

Nə on beş əyaldır, artmaz fərzəndi,
Ol on beş əyalın üçü övladdan?
Üçü ekiz, on dörd olar peyvəndi,
Ol nə cima eylər, nə çıxar yaddan?

Ol nə xəlqdir gəh fələyə qonarlar,
Gəhi enib, yer üzündə dinərlər?
Ol nə adəmzaddır, bir at minərlər, —
Üzəngisi sudan, cilovu baddan?

Müdam seyrə gəzər ol dörd tayi-tuş ,
Olar ondan cümlə aləm üzü xoş,
Ol dördün biri var, müdam səbzəpuş,
Kəlləsi buzdandır, ayağı oddan?

Ol kimdir, yalavac, qərib oturmuş,
Avazsız aləmə sözün yetirmiş,
Ağzın açıb, özün yasa batırmış,
Soruram, xəbər ver mənə bu zatdan?

Məxdumqulu, salma ölkə avaza,
Bular görnüb duran zatdır bu gözə,
Aqil ərin fəhmi yetər bu sözə,
Hacət deyil xəbər almaq ustaddan.

## KƏFARƏT ETDİ

Fəhm eylə sözümü, aşiqlər başı,
Kim xudaya oğlun kəfarət etdi?
Xəlilülla – haqqın Kəbətəraşı,
Kim sonra Kəbəni imarət etdi?

Azıq götürülməz ulaqsız köç nə,
Altı nə, yeddi nə, dörd nədir, beş nə,
Ağdan qara dönən şərəfli daş nə,
Adı nədir, hər kim ziyarət etdi?

Bilirsənmi neçə yoldur salındı,
Hansı yoldur möhtac oldu, alındı,
Şəmi şölə vurdu, yandı, bilindi,
Ol şəmi haqq kimə kəramət etdi?

Kimdir Hatəm onu görüb Tövratda,
Yoluxubdur daş ayaqlar bəratda,
Bilirsənmi, həyat axar zülmətdə,
Xıdır ilə kimdir təharət etdi?

Surətpərəst nədir, duası heçdir,
Xəbər vergil, Nuhun qaynı nə işdir,
Azana, tozana dəstgir nə quşdur,
Kimin türbətinə ziyarət etdi?

Ol nə dörddür, enib gəldi sultandan,
Xalqlar şöhrət tapdı, de neçə candan,
Hansı mələk enib düşdü asmandan,
Nə adəm oğluna inayət etdi?

Məxdumqulu, kimdir, bir yerə düşdü,
Ol kimdir, bir gecə dev alıb qaçdı,
Neçə ildən sonra gəldi, qovuşdı,
Tanrı pənahında səlamət etdi?

## GÖRDÜM A

Əvvəla oldum fəna, darül-bəqanı gördüm a!
Cümlədən biganə oldum, aşinanı gördüm a!

Çərx urub durdum tamami-suri-İsrafiləcə,
Ərşi-kürşi tay urub, təxti-səranı gördüm a!

Cümlə səf-səf adamının xakinə qıldım təvaf,
Həşt cənnətə varıban Adəm, Həvvanı gördüm a!

Altı min dəryanı uddum, dörd yüz qırx dörddən,
Cəbrayılın yerini mən müntəhada gördüm a!

Həştdir cənnət ki varıb, cümləsi girən olar,
Yanıb yürüyən həzaran rusiyahı gördüm a!

Təxti-hümmətə çıxıban ümmətim, vay, ümmətim,
Sədqeyi-ruhi olan ol Mustafanı gördüm a!

Çarıyardan həzrəti Bubəkr, Osman, Ömər,
Heydəri-səftər Əli – şiri-xudanı gördüm a!

Kərbəla dəştində can verən şəhidlər getdilər,
Həm Həsənlə Hüseyni, Kərbəlanı gördüm a!

Qul Məxdum, ta pişva tapmaz, şəfayı tapmaz kişi,
Ta ki mən bir pişva tapdım, şol şəfanı gördüm a!

## MEHMANIDIR

Dərddir bu canın zilləti, sağlıq onun sultanıdır,
Tən mülkünün sər dövləti dinməz ötər, mehmanıdır.

Nəfs eyləyib sərkeşliyi tən taxtının meydanında,
Ruzi-əzəl ruhun yaxın ol əhdi, ol peymanıdır.

Bu bazara gələn kişi ixlasın ari eyləsin,
Qəbul olan ixlaslı qul mərdanların mərdanıdır.

Desə olar səd afərin, ruh bəsləyib nəfsin basan,
Həqiqət onun bazarı, həq məclisi meydanıdır.

Vay halına nəfsin sevən, can ləşkərin aciz qoyan,
Ruzi-cəza yoldaş ona, bəd işlərin peşmanıdır.

Ər tapmadım qulluq edəm, yol tapmadım həccə gedəm,
Bu iki iş bu tən ara bu canımın ərmanıdır.

Məxdumqulu bu qəmzədə ta ki bu dərd ilə gedər,
Beş gün bu fani dünyada bir aşiqin dövranıdır.

## QEYRİ

Varmıdır varmağa yerin başqa, xudadan qeyri,
Ərmağanın varmıdır ruyi-siyadan qeyri.

Gəzdiyincə çərxin altında cahanda can çəkib,
Nə tələb var sənə bu cəbri-cəfadan qeyri.

Həq edib, nahəq qılıb yürsən ürəkdən qan töküb,
Hasilin nədir sənin cürmi-günadan qeyri.

Yeyib-içib, məhbub qucub, yatsan səhər rahət ilə,
Taqətin hanı sənin ruyi-riyadan qeyri.

Göz gözəldə, nəfs yeməkdə, dil dəxi qeybət ilə,
Şövkətin – şər, başda yox böylə həvadan qeyri.

Əvvəli anlamadım, sonra sözünə getmədim,
Bu bəlada kimsə yox mən binəvadan qeyri.

Fikir et Məxdumqulu, faniyə bax, nə görünər,
Sonu yox, yalanı çox, fövti-fənadan qeyri.

## EY DOST

Gözümə hərgiz sənsiz görünməz cahan, ey dost,
Nə cahan, bəlkə, təndə olsa gər səd can, ey dost.

Dostlarına bu işlər bivəfalıq deyilmi?
Cana cəbrin artdırdın açdıqca zəban, ey dost.

Ol ki rüxsarın görüb, könül qondu sən yarə,
Can verib qurtulmaq yox, heç ona imkan, ey dost.

Vəslinə ümmid edən üzmüş əlin canından,
Çeşmin cəlladi-cahan, qaşındır kəman, ey dost.

Dəstiuri-zaman budur, məzlumə mürvət verlər,
Şərara şövqün artar, etdikcə aman, ey dost.

Ümidli aşiqlərə vəsl ümmidin qət etdin,
Aşiqlərə cəbr ondan oldumu bu yan, ey dost?

Məxdumqulu, bir məxluq, mən aşiqəm, sən məşuq,
Gər desən: «İstəyim yox», varayın hayan, ey dost?

## YA RƏB

Saqi ilə qurtulmadım mən bu bəladan, ya rəb,
Çıxa bilmən cəhd edib, ücbi-riyadan, ya rəb.

Taleyim etdi tülu, andım anı əxtəri-bəd,
Sən iraq et məni bu bəxti-siyahdan, ya rəb.

Yövmi-təşəhhüd deyər hal mənə, bir şahid eyn,
Qurtulurmu qəhbə can böylə güvadan, ya rəb.

Tən ibadətdə iləl, həm devi, şeytandır bəğəl,
Yad edib, əmri-əzəl hökmi-həyadan, ya rəb.

Dərgahına, ey kirdgar, qılsam ibadət yox qərar,
Edənimə yox ixtiyar sövmi-səladan, ya rəb.

Mən istərəm səndən səni, sən et iraq məndən məni,
Hacət rəva qıl, ya qəni, məni-mübtəladan, ya rəb.

Məxdumqulunu hər zaman basdı bəla, açdı zəban,
Eyləməsin hər möminan məhrum duadan, ya rəb.

## XƏBƏR, EY DOST

Bir səhər düşmüş idi yadıma diyar, ey dost,
Can guşuna yetişdi binagəh xəbər, ey dost.

Tən mülkünün içində can durdu pərvaz edib,
Şövq ilə edə nəgah özünü nisar, ey dost.

Səbrim səfinəsini sındırdı şövqün seli,
Dəryayi-ümman saldı matağı-qərar, ey dost.

Yar vəsli-cəmalından hər dü cahan ki kamyab,
Bəxtim müştərisinə qura var bazar, ey dost.

Əhli aləm qərq olmuş xərman-xərman gül içrə,
On il gəzsəm, uğramaz, alnımdan bahar, ey dost.

Xoş baxmış cahan içrə, xoşlanmış aləm ondan,
Aləmdə adam içrə mənadır qəhər, ey dost.

Fəraqi, göz yerindən ağlayıb qan rəvan oldu,
Yerinə salar onu gər dəysə qubar, ey dost.

## QAŞI YAY

Bir dilbərə tuş gəldim, qəmzəsi ox, qaşı yay,
Gün heyrandır görkündən, xəcalətdə dolan ay.

Canın versən, caizdir, böylə sifət məhbubə,
Heç görmədim onun tək başı doğru, bağrı tay.

Qülqülə düşdü qopuz, həm düşdü cəngi-cəngə,
Cəng şövqündən ol nigar nə naləyə düşdü nay.

Nə işrətdir aşiqə cənnət içrə cəmalı,
Ayrılığın atəşi damu içrə veylü vay.

Ol dideyi-dildardan olmazsan sən bibəhrə,
Qalmazsan sən mənim tək əqlə azu, görkə bay.

İstəsə alimləri şeytan edər ol dilbər,
Xələqanna Xəlil tək oğlanına verər pay.

Məxdumqulu müdama dua qılar dərgaha,
Sailəm, məhrum etmə dərgahindən, ya xuday!

## BƏLGİLİDİR

Dostlara, dostum mənim candan şirin sevgilidir,
Can kimi pünhan cahanda aləmə bəlgilidir.

Baş ilə varsam ana, handan olursa güzəri,
Tutsam ol yerdə vətən, ol yer ki onun yoludur,

Deyərdi yar: mən aşiqim öz əlimlə qətl edəm,
Andan əvvəl məni qəm paymal edib almalıdır.

Özgə aşiqlərin olsa payi bənd zülf-tarına,
Mən qəribin bənd ona həm ayağı, həm əlidir,

Qeyrilə bəzm eyləyib, eyləsə xoş könlünü yar,
Məclis içrə yad edib de: «Ol qərib qayğılıdır».

Yaz gələr, vəqt də gedər, qəflətə batmış gözlərim,
Açayım dersəm açılmaz, nə ağır uyğuludur.

Bilməyən, soranlara deyin bu qərib adımız,
Əsli gərkəz, yurdu Ətrək, adı Məxdumquludur.

## DOĞRUSU

Ey pəri, mən aşiqəm sənə, yanaram, doğrusu,
Görməyincə gül üzünü, biqəraram, doğrusu,

Şəhrinizdə bir pəri adın eşitdim mən sizin,
Bülbüli-biçarəyəm, çox ahi-zaram, doğrusu,

Bir bəzirganam, mənəm, eşqin mətahın sataram,
Şəhrinizə gəlmişəm, bəs, sövdagaram, doğrusu.

Gedə bilməm şəhrinizə, həzz-haramdan qorxaram,
Yeddi pirin ləfzindən bir yadigaram, doğrusu.

Ey pəri, zülfün pəri, vallah, sənin tək xublara,
Söyləyər Məxdumqulu, bir peşəkaram, doğrusu.

## BƏDNAM OLUR

Hər əmirin, gər vəzirin ağlı gödək, xam olur,
Ol əmirin adı axır xəlq ara bədnam olur.

Bir aqil – sahib kamalın əli birlə iş tutan,
İşini daşdan alar, tərpəndikcə, kam olur.

İstəsən səriştəsin sən bu cahanın sərbəsər,
Əl açan, qəhrin keçən danəndeyi-əyyam olur.

Gəlləban ərbaba dönüb, olmuş ərbablar əmir,
Şahlara olmaz etiqad, əli nafərcam olur;

De səlam Məxdumquludan yağı olan bəylərə,
Ay dolar, əncüm batar, rüsvayi-xasü am olur.

## BİR NEÇƏ MİSAL

Uğradım İlyasa, düşdüm Xıdıra,
Könlüm içrə gəldi bir neçə misal.

Əl götürdüm, durdum niyaza, nəzrə,
Dedim: «Rüxsət olsa, sorayın sual».

Dedim: «Nədir bu dünyanın dirliyi?»,
Dedi: «Yatsan düşdür, duranda – xəyal».

Dedim: «Ya rəb, dünya nəyə bənzərdir?»
Dedi: «Qoca qarı, üzündə yüz xal».

Dedim: «Nədir mülki-cahan sevgisi?»
Dedi: «Dərdəsərdir, ya boyna vəbal».

Dedim: «Dünya üçün nədir bəhsi-cəng?»
«Bihudə boğaz yırtmaq, yersiz qalmaqal».

Dedim: «Əhli-zaman nəyə bənd olmuş?»
«Oğul, qız sevgisi, cəm etməyə mal».

Dedim: «Bu sevgidən, maldan nə hasil?»
«Yığmağı qayğıdır, getməyi məlal».

Dedim: «Əhli-zalim nə tayfa dürur?»
Dedi: «Qurddur, itdir, pişikdir, çaqqal».

Dedim: «Andan nəfsim necə ram olur?»
Dedi ki: «Pir olan ilə guşmal».

Dedim: «Bəndə cəhdi başa vararmı?»
Dedi: «Varmaz, istəməsə zülcəlal».

Dedim: «Ya rəb, kətxudalıq necədir?»
Dedi: «Həp də işrət, qayğı – qalan sal».

Məxdumqulu, sözü dürdür bilənə,
Başda huşun olsa, sözə qulaq sal.

## KÖNÜL

Bilməzəm heç, hansı dərdin mübtəlasıdır könül,
Ya rəb, ol bir bivəfanın çox həvəsidir könül.

Eşq dəryadır, dibi yox, hicran bir oddur, tüstü yox,
Eşqə meyl edən bu odlara yanasıdır, könül.

Bilməyən atmış özün eşq oduna pərvanə tək,
İndi bilməz çarəsin kim, nə qılasıdır könül.

İsanın dəmi muxal, Loğman o yerdə kar-lal,
Ya rəb, bu dərdin bu hal nə iş dəvasıdır, könül.

Gərçi eşqin dərdidir divanəyə can afəti,
Aşna əhli bu qəmi daim çəkəsidir, könül.

Neçə məhrəm binəvalar tapdılar ondan nəva,
Mən edən ondan məni bəxtim siyasıdır, könül.

Ağlayıb, Məxdumqulu, dərgaha ərzin söyləyər,
Neyçün ki, çox ağlayan bir gün güləsidir, könül.

## SƏNDƏN BİXƏBƏR

Sənsən arayişi-can, həm can səndən bixəbər,
Sən cahana dolubsan, cahan səndən bixəbər.

Əndişə dəryasında sirrim səfinəsini
Yüz tərəfə üzdürdüm, seyran səndən bixəbər.

Gər desələr küfr olar: «Əşya səndən halidir»,
Mənzil səndən müstəğrək, məkan səndən bixəbər.

Zəmin, asman, qərbü şərq pərtövündə gərdandır,
Zaman ilə sən gərdan, zaman səndən bixəbər.

İstər səni dənizlər dalğalanıb şövqündən,
Sən olar içrə məlum, ümman səndən bixəbər.

Zəmin dilər asmanda, asman dilər zəmində,
Bir-birinə gümanda, güman səndən bixəbər.

Məxdumqulu, gör indi, əşyalar nə işdədir,
Yox imiş bu əşya da həman səndən bixəbər.

## CAN ÇIXAR

Gər tutsa halimdən xəbər quru ağacdan qan çıxar,
İnsan şərarımdan əsər tapsa tənindən can çıxar.

Qarun qılıb malın əda, səd can edər olsa fəda,
Gün şəmindən olub cüda, nurun qoyub, pünhan çıxar.

Bir köşədə olsam mükim, könlə gətirsəm qədri-sim,
Hər köşeyi-viranədən səd gənci-bibayan çıxar.

Könlümə gələn naxışlar gözlərə fayda olsa gər,
Düşsə gözü nadanların, kamil olub, mərdan çıxar.

Heç anlamaz zirü zivər gər tapsa cəzbəmdən əsər,
Əlifdən, beydən bixəbər hər dəmdə bir Quran çıxar.

Cəbr etdi Cəmşid canına, ki yetdi mədən kanına,
Yüz il oxub payanına nə Zalü, nə Loğman çıxar.

Mən həm Fəraqi ol qədər ağlımı qıldım dərbədər,
Bir bahünər tapsa xəbər, pər bağlayib, asman çıxar.

## AL QANDIR[6]

Qopdu ay, gün yerindən, qaldı qiyamət ayağa,
Uyğulu gözümü açsam, cahan üzü al qandır.

Dedim: «Könül, qoşul elə, çıx tiğ alıb savaşa»,
Naz eyləyib gəldi ol yar, dedi: «Qaşım kamandır».

Qafil olma, adəm oğlu, bir gün ömrün var sənin,
Ötsə igidlik fəsli, gündə yüz min ərmandır.

Gündə yüz vəqt ərz edib, qaydıb almazsan onu,
Ötürməgil qafil başdan, əsən şəmal dövrandır.

Hər bir işə baş qoşub, alma elin xahişin,
Ta ömür axıb gedərmiş, hər qədəmdə ziyandır.

Pünhan sirrin əyan edib, Fəraqi dedi dərdini,
Ellərim alqış oxuyar, bildim, dərdə dərmandır.

[6] Qəzəlin başlanğıc qismi yoxdur.

## EYLƏDİ

Gül üzünü gizləyib yar, göz yaşım dərya eylədi,
Qaib olub bu cahandan, yavuzu həmra eylədi.

Gözləyib mən baxdım hər yan istəyib ol yarımı,
Tapmadım ki, yenidən ömrümü zaye eylədi.

Gəh durub şamü səhərlər, kaknus olaram zarlayıb,
Yenə bu qəflətdə qalan könlümə bəla eylədi.

Dinləməz ki, ərzimi, böylə ki zalim olubdur,
Baxmayıb malü mülkümə, varın irya eylədi.

Söyləyər Fəraqi dərdin, eylə müyəssər əmin,
Yeni başdan od vurub, ol baqi dünya eylədi.

## UNUDAR OL YOLUNU

Ey yaranlar, eşitsə Loğman dərdimin bu halını,
Tərk edər ki, külli vətən, unudar ol yolunu.

«Hu» deyib, mən zari-əfğan gecə-gündüz ağlaram,
Gər eşitsə zarımı, Qarun unudar felini.

Qara dağlar qətrə-qətrə yaş tökübən halıma,
Törədibdir uluğ ümman, Nuh üzdürər salını.

Can şəhrinə saldı talan, gəldi ləşkər tuğ ilən,
Bilmənəm, ol çözərmi ki, bu vətən iqbalını?

Deyin ol yarıma mənim zindan içrə olmağım,
Saçlarını sallayıb, qılsın azad mən qulunu.

Məxdumqulu, adın sənin külli aləmə dolub,
Qılsa adam varın qafil, gizlə, vermə bu malını.

## XUNLAR TÖKƏRLƏR GÖZÜNDƏN

Dərdlilər dərdini görsə, utanarlar özündən,
Təbib əhli çarə tapmaz, xunlar tökərlər gözündən.

Görsə aşiqlər bu odu, unudar öz atəşin,
Çıxar dağü daşlar üzrə, Məcnunu tapmaz düzündən.

Bir tarına yarimin əhli müsəlman dustağı,
Kafirlər istər ədalət, zarla yürürlər izindən.

Eşitsə Nəvai, Nizami, Firdövsi qılan zarim,
Tərki-dünya eyləyib, hamısı keçər sözündən.

Gecələr nalə çəkib, gündüz ümidim yox mənim,
Doymayır bu ac gözlərim baxıb yarin üzündən.

Fəraqi, sən səbr edib unut qışının fəslini,
Gər unutsan bu günü, fayda görməzsən güzündən.

## DÜNYADAN

Dərdimi qılsam bəyan, ürək ərmandır dünyadan,
Kimsə namərd olsa bilin, dərdə dərmandır dünyadan.

Bu miskinlik dərdindən zar ağlayib ötər günüm,
Heç vəfası olmadı, ciyər qandır dünyadan.

Ömrümün mən salını saldım dünya Ceyhununa,
Urdu əzm, saldı talan, mülküm virandır dünyadan.

Yaxşı qardaşlar, görün, mala qızıban getdilər,
Cəsədimdə qafil qalan quru candır dünyadan.

Əlmüdam matəm tutub, Fəraqi, qaldım yas ilən,
Hansı yerə uğrasam, varı ziyandır dünyadan.

## DAŞIMIZA

Şum fələk girdaba saldı çox xəyal başımıza,
Çıxsaq əgər ki, kənara, tor vurar daşımıza.

Baş alıb gedib bu yurddan, tutsam ki qeyri vətən,
Gələr ol fəsli-baharda, yağmuru qışımıza.

Köç durar könlüm qoşunu, baxıban fərmanına,
Gündə bir vəkili yollar, ərz edib qaşımıza.

Ruyi-qamətini görsəm, yox qərarım, neylərəm,
Gündüzlərə nalış etsəm, gecə girər düşümüzə.

Ölübən yar əlindən, oldum ki mən həm bəs şəhid,
Bir zaman rahat verməz, quşlar qonar leşimizə.

Yoxdur rəhmi şum fələyin, ayırar dost-yarından,
Gör, necə əyyam ötəndir, düşməz göz qardaşımıza.

Bunca ərz edib hey baxsam yoluna gözlər tutub,
Ürəyi daşdan qatıdır, əriməz nalışmıza.

Qarı molla – Fəraqi, ötdü igidlik fəslimız,
Gündə yüz vəqt nalış etsəm, çarə yox yaşımıza.

## NAMUS-ARIMA

Fələk qərardan düşüb, fəda olmuş zarıma,
Bir əcaib ziba pəri, girmiş eşq bazarıma.

Hər görənlər xiridardır, şahü gəda həm qulu,
Mərdü namərd, həm də nakəs söz yetirər yarıma.

Qıla bilmən pünhan onu, dözməyir aciz könül,
Gər aşikar qılsam üzün, görən düşər qəhrimə.

Əsli behişt sünbülüdür gül üzündə zülfləri,
İrəm içrə bitən narlar oxşamaz bu narıma.

Gələn dərdini mən alıb, hular çəkibən gəzərəm,
Loğman gəlib, göz gəzdirib, çarə qılmaz azarıma.

Der Fəraqi, mərd mənəm, aşkar elə mərdliyim,
Diri getməz qaşlarımdan dəyən namus-arıma.

## SÖZLƏRİM

Yandı canım, neyləyim, ol yara düşdü gözlərim,
Zəhr olubdur, bilmədim, şirin bal idi sözlərim.

Çərxi-fələk dolanıb, tərs günü saldı başıma,
Yağmuri-baranı bilən qış olubdur yazlarım.

Ötdü bizdən dövləti, bir miskini-gəda mənəm,
Der Fəraqi, urdu laçın, oldu yesir qazlarım.

## BƏNZƏMƏZ

Ey sənin tək bir pəri, qeyri canana bənzəməz,
Kirpik-xəncər nəştəri, tiri-kamana bənzəməz.

Ruyi ay tək cürə xallar, bəndi qılar görəni,
Şöləsi aləmi yaxar, mahi-təbana bənzəməz.

Ləbi narü, abi-kövsər, onca bican dirildər,
Bəxş eyləyir ol kövsəri, feli-Qaruna bənzəməz.

Zülfü siyah sünbül pəri, aləmi qıldın biqərar,
Tərk edib sən onca dükan, qeyri dükana bənzəməz.

Ruyin üzrə külli aləm, camalını bənd qılıb,
Dəsmal tutub, yandırarsan, huri-qulmana bənzəməz.

Bu fələyin çərxini sən, ərki bilən eyəyib,
Bu dünyanı qıldın behişt, əski cahana bənzəməz.

Ol Yusifin camalını, bəxş gəlmiş həqq əvvəli,
İki cahan sultanısan, Süleymana bənzəməz.

Məxdumqulu aləm içrə, bütün canan həm gözəl,
Hamısı bir kənizdir, Mənli xana bənzəməz.

## OXŞAYIR

Ey pəri, ziba pəri, ruyin təbana oxşayır,
Gül ruyində müşki-ənbər reyhana oxşayır.

Bu yanan canıma bəsdir bircə deyən sözlərin,
Qaşların taylı dartışın Leyli cana oxşayır.

Mən qulunam, yaxsan canım, əlindədir ol yesir,
Hökmürəvan fərmanıdır, Süleymana oxşayır.

Yandırsan oda yaxıb, ya ki üzsən tiğ ilən,
Tiği dərmana bərabər, özü Loğmana oxşayır.

İstəyib camalını, gəşt eylədim külli-cahan,
Gözdən tökən qanlı yaşım, ol ümmana oxşayır.

Bu fələyin zülmü birlən getdi səbri-taqətim,
Bu yalan fani cahan bəs bir zindana oxşayır.

Oncaları xüms edib, kimə verdi dövləti,
Başım çıxmaz dərdə qaldım, işi yalana oxşayır.

Məxdumqulu, qoca pələng hər gündə bir ov atar,
Ötsə ömrü ol fəqirın, tülkü pəlvana oxşayır.

# EŞQ DUZƏXİNƏ

Hərçənd böylə nalış etsəm ol həqqin dərgahinə,
Yenə sözüm dinləməz, salar eşq duzəxinə.

Könlümü təğyir qılıb eşq, loxmadan xüms eylədi,
Guş tutmaz ol zarıma, sardı hicran çərxinə.

Tuğun idim, urdu zağlar, bir əlacım yox mənim,
Neyləyim, səyyad olub, düşdüm mürğünün qəhrinə.

Onca nalış eyləyib mən, el-gün bilən qan ağlasam,
Zarıma xəndan qılar ol, varmaz sözümün fərqinə.

Əhli ötən aşiq-məşuq satsa eşqin mətasın,
Əldə vari-yoxun verib, yetməz eşqim nırxına.

Vəchi bilən düşsə ruyim, yesir qılar qulları,
Payi-dəstimi bənd edib, atar Ceyhun bəhrinə.

Ey yaranlar, fani dünya qırğısı aldı yesir,
Fəqir Məxdumqulunu salar zəmin ləhatına.

## MƏSKƏNİ

Eyya dilbər, camalında cürə xallar məskəni,
Zəbanında şəhdi-şəkər, dəhanda ballar məskəni.

Zinət qılıb çıxdı dilbər, tavus quşu tək bəzənib,
Mahi-taban həya eylər, yarımda illər məskəni.

Badi-səba gəzə bilməz daği-dəşti gəşt edib,
Neyləsin ol bəndi qaldı, dilbərdə yellər məskəni.

Ərəb zəban düşdü xara, xiridarı yox onun,
Bu pünhanı qılsam aşkar, dilbərdə dillər məskəni.

Sərvi dərəxt boylu pəri, səni hicran yandırdı,
Gər ki ərzin sözləsən, yarımda tellər məskəni.

Ey Fəraqi, görkəzib yol, özün onda azmısan,
Gəzər oldun, söylə ərzin, dilbərdə yollar məskəni.

## GÖRMÜŞƏM

Həmrah olub ol namərdlə, bircə zaman yürmüşəm,
Dözüb onun hər dərdinə, qıldıq işin görmüşəm.

Bir zamanda bir gül gəlib, hasil oldu bağıma,
Neyləyim mən ol süsəni, əndəlibə vermişəm.

Ol əndəlib şadi-xürrəm oldu gülə sataşıb,
Ağlım kəsməz, nə hekayət varın ondan sormuşam.

Dedi: «Pərvanə mənəm, eşq aləminə baş qoşub,
Bu süsənin dərdi ilən özüm nara urmuşam».

Gəlib şeytan, alıb gülü atəş içrə atar oldu,
Suzanını mən unudub, atəş içrə girmişəm.

Cani-tənim varını xakistər qıldı atəş,
Badi-səba əsər oldu, asmana sovrulmuşam.

Məxdumqulu, axmaq oldum, nadanlığım yey ikən,
Ərsə ələm ilən gəzəm, bu iqbalı bəyənmişəm.

## İLƏN

Gözəl ömrüm taqəti qaçdı, neylək can ilən,
Günəşim məkan edib, həmra olmuş xun ilən.

Nə yaman eşqin odu, çarəsi yoxdur onun,
Yanan cana dəri qılmaz, yandır, görün, suzan ilən.

Kimlərin iqbalı yürüb, kimi xandır, kim gəda,
Kimi dünya malı yığar, yortub fani cahan ilən.

Ürəyimdə yandı narlar, bir pərvanə nəzər qılmaz,
Məxdumqulu ötər oldu bu dünyadan ərman ilən.

## GƏRƏKMƏZ

Fələk, mənə mal verərsən, ol gənci-kan gərəkməz,
Gözəl yarımı görməsəm, fani-cahan gərəkməz.

Bağa girib neyləyim mən, coş uran ənbərini,
Bülbülüm yesir qılıbsan, gözəl reyhan gərəkməz.

Elim-günüm xari-zardır, gəlsin dövlət ləşkərin,
Dini təklif eyləyirsən, əcəb Quran gərəkməz.

Bizin elin şah-gədası, fələk, sənə yük olar,
Hər kəs özünə sultandır, xanu sultan gərəkməz.

Bu zəmini lərzan qılıb, asman, cünbüş eylədin,
Axır zaman sarı yürdün, mahi-taban gərəkməz.

Məclis qılar oldu bu gün el-günümün varısı,
Gəlməyənsən, sər qoşub(san), bizə mehman gərəkməz.

Qılgil ömrümüzü ziyad, qeyri nərsə istəməm,
Bu əcaib çağlarımda əcəl-peyman gərəkməz.

Çərx üstündə bina qılıb, bizləri sən cayladın,
Qail olay bu cayına, amma gərdan gərəkməz.

Daim ömrüm ötürəyim, verən bahar fəslində,
Asudədir şeyda bülbül, bizə xəzan gərəkməz.

Namərdləri dış eyləgil bu məclis ətrafından,
Ər igidlər sərxoş olar, namərd-zənan gərəkməz.

Hər kimə sən bəxş edibsən, yaxşı-yaman bir gülü,
Ol güllərdən qeyri bizə sahibcanan gərəkməz.

Məxdumqulu, sən sözləgil – dedi qoçlar məclisi,
Sən göftarsan bu məclisdə, qeyri dastan gərəkməz.

## İXTİYARIM ALIBDIR

Fani fələk gərdişində içdiyim qan olubdur,
Gündə yüz min cəbr bilən ixtiyarım alıbdır.

Qəflət uyğusunda yatıb, seyr etmədim bostanıma,
Bu gün nəzər salsam ol yan, çiçəklərim solubdur.

Bağbanımı alıb yesir, götürübdür bu fələk,
Uğrunda səfil yürüb tapsam, çaya salıbdır.

Dəsti-paya urub zəncir, Məcnun kimi danılan,
Ol zindanın qapısında zari-giryan qalıbdır.

Əsirlikdən qurtulmağa bir qüdrətim yox mənim,
Qeyrət atı arxa təsib, ömrü də qocalıbdır.

Ol zindanın sultanına dedim: «Xilas qıl onu»,
Zari-giryanımı görüb, ol sultan utanıbdır.

Dedi sultan: «Bənd olanlar alnımdadır, bu qulu»,
Məxdumqulu öz dilindən gör, bağrı qan olubdur.

## HAQQIN FƏRMANIDIR

Dostlarım, könlüm içində duzəxin suzanıdır,
İstəməz mən ol atəşi, neylək, haqqın fərmanıdır.

Fani cahan qırğısının pəncəsində qalmışam,
Qırğı əhlinin içində yamanlar yamanıdır.

Mərdi oynar oldu fələk eldə rüsva eyləyib,
Fani dünya gərdişi – namərdlər dövranıdır.

Ömrümün hər bir günü ötər oldu ələm bilən,
Salim ətraf fələyin bir qüssə gərdanıdır.

Adəm oğlun meymun kimin, fələk hər dəm oynayar,
Ol haqqın fələk üçün yaradan heyvanıdır.

Gündə yüz qətrə ötərəm ümman Xəzər ətrafından,
Neyləyim, bu dəli könlüm fələk natəvanıdır.

Nə işləri qılar oldu ol haqqın dərgahında,
Fələyin bu karınə cümlə-cahan heyranıdır.

Məxdumqulu, söz deyəndə, söz axırın anlayın,
Ərsə əzazili şeytan qılan ol zəbanidır.

## MƏNLİ YARIMDAN

Fələk aləm rüsva qıldı, ayırıbdır zarımdan,
Nə iş qılsam, xəbər biləm mən ol Mənli yarımdan.

İns-cins tüğyan eyləyib, zəmin lərzana gəlmiş,
Asmanlar cünbüş qılıb, kövkəb yanmış narımdan.

Bir rəhmsiz şahdir ki, ol könlüm içrə yer tutub,
Bənd eyləyibdir Loğmanı, xəbər almaz azarımdan.

Gündə bir vəqt nəzər salmaz, aşdı sərdən dərdimiz,
Cismim xakistər oldu, canım düşüb qərarımdan.

Qirğı olsa fani dünya verməz başda tacını,
Heç oyanmaz, xəndan qılar qorxmaz mənim nəzərimdən.

Güzərimi bəndi qılsam, hər gündə qırx açadır,
Abi-kövsər zülalımı içibdir ol güzərimdən.

Yanar odlu Məxdumqulu, od libasın sən geyib,
Fani cahan odlayıbsan, dildə olan narından.

## EY BİNAMAZ, EY BİNAMAZ

Vallahi-billahil-əzim, ey binamaz, ey binamaz,
Bizar olar səndən xuda, ey binamaz, ey binamaz.

Hər kim ona versə səlam, ya versə bir loxma təam,
Lənət yağar hər sübhü şam, ey binamaz, ey binamaz.

Ərşi-əladan dışarı, insü mələk, devü pəri,
Bizar olar səndən varı, ey binamaz, ey binamaz.

Ruzi-qiyamət günündə, bilgil, tərəzi qurular,
Əvvəl namazdan sorular, ey binamaz, ey binamaz.

Məhşər günü açsan gözün, qara olub qalar üzün,
Bilməm nədir onda sözün, ey binamaz, ey binamaz.

Əl-ayağını bağlasa, duzəxə atıb daşlasa,
Qalsan tamuda ta əbəd, ey binamaz, ey binamaz.

Hər kim bir namaz tərk edər, qəsdən qəza qılsa nətər,
Belə dedi xeyrül-bəşər, ey binamaz, ey binamaz.

Hər binamaz ölsə ona xətmi-dua deyil rəva,
Belə buyurdu Mustafa, ey binamaz, ey binamaz.

Məxdumqulu söyləyəni, həqq Mustafanın deyəni,
Bir zərrə yoxdur yalanı, ey binamaz, ey binamaz.

## GƏLDİM

Ata belindən düşdüm, ana rəhminə gəldim,
Qırx kövn ilən çıxıb, bir zərrə qana gəldim,
Bir mahiyi-bicanam, dərya-ümmana gəldim,
Dörd ay, on dörd saətdə dirildim, cana gəldim,
Doqquz ay tamam oldu, onda cahana gəldim.

Atam-anam sevdilər, götürdülər qucağa,
Geyimlərim geydirıb, bələdilər qundağa,
Gahi iməkləyərdim, gah durardım ayağa,
Ana südün əmərdim, dönərdim sola-sağa,
İki yaşa yetəndə, yeməyə nana gəldim.

Üç yaşıma yetəndə, oynayıban gülərdim,
Beş yaşıma varanda, anadan zad dilərdim,
Yeddi yaşa yetəndə, dost-düşmənim bilərdim,
Doqquz yaşa yetəndə, beş vaxt namaz qılardım,
On yaşıma yetəndə, ədəb-əkrana gəldim.

On ikidə hər kəsə qanrılıb söz qaytardım,
On üç yaşa yetəndə, ağır məclis tutardım,
On beşimə yetəndə, tiri-tüfəng atardım,
On yeddiyə varanda, eşq sevdasın güdərdim,
Eşqin sevdası ilən sürüb, meydana gəldim.

On yeddidən keçəndə şöhrət öyünə girdim,
Aldım bir nazənini, zövq ilə səfa sürdüm,
Bu qönçeyi-gülzarın əlvan gülünü dərdim,
İyrimiyə yetəndə, fələk cəbrini gördüm,
Fələk aldı yarımı, əcəl qəmxana gəldim.

Otuza girdi ömrüm, girdim tiri-kamanə,
Könül xüruç eylədi, oldum dəli-divanə,
At minib, yaraq tutub, sürüb girdim meydanə,
Rüstəmi-dastan kimin savaş qıldım mərdanə,
Qırxa yetəndə ömrüm, oxub Qurana gəldim.

Qırxdan ötər olanda, getdim əlli yaşıma,
Gəldi ölüm nişanı, rəxnə girdi işimə,

Hər kim qarı deyərdi, heyran qaldım dişimə,
Qocaldım, düşkün oldum, qovğa gəldi başıma,
Ələ əsa götürüb, doğru məkana gəldim.

Altmışa getdi ömrüm, görməz oldu gözlərim,
Qocaldım, düşkün oldu, qışa döndü yazlarım,
Mənim sözüm etməzlər həm oğul, həm qızlarım,
Aləmə xoş gəlmədi mənim şirin sözlərim,
Aləmə yalvarmaqdan düşdüm, amana gəldim.

Yetmişə vardı ömrüm, ağlar idim zari-zar,
Gözümdən yaş gedərdi misli əbri-növbahar,
Qulaqlarım qapanıb, gözlərim tutdu qubar,
Başıma yığıldılar qohum-qardaş, hər kim var,
Geyimlərim soyuldu, təxti-rəvana gəldim.

Yatır idim bəstərdə, nagah Əzrayıl gəldi,
Bülbül dilim bağlanıb, qızıl üzlərim soldu,
Yüz min cəfa-cəbr ilən cismimdən canım aldı,
Dünyanı puç keçirdim, bütün ərmanım qaldı,
Gəldi ölüm nişanı, əcəl qəmxana gəldim.

Mürdəşir qol çırmayıb, meyidimi yudu pak,
Ağac ata mindirib, etdilər ol suyi-xak,
Əzrayılın cəngindən ruhum oldu çak-çak,
İki gürzlü, toppuzlu, zəhmnak və qəzəbnak,
Ruhum təslim etdilər, dirildim, cana gəldim.

Soruşdular: «Ey adəm, de, görüm, halın nədir,
Dünyadə xeyr etmədin, bu qeylü qalın nədir,
Getdin şeytan yoluna, cavab-sualın nədir,
İndi torpaq altında, elmi-kəmalın nədir»,
Gürzü saldı təpəmdən, çaki-həmana gəldim.

Candan dedim: «Ya, Əli!» tapıldı Şahi-mərdan,
Ağeyi-müşkül güşad, ol əmiri-möminan,
Məxdumqulu der, canım desən sən ona qurban,
Ol Münkəri-Nikirlər durmadılar bir zaman,
Orda rəbbimi görüb, doğru məkana gəldim.

## SƏNİ

Olmadı bizə nəsibin, istədim güzdən səni,
Dedin: «Ötsün qış, taparam tazə novruzdan səni»,
Sayladım, seçdim, sonam, mən bir bölük qızdan səni,
Neyçün belini qucmadım mən tapıb düzdən səni,
İstərəm haqdan qovuşdursun mənə tezdən səni.

Haq qatında sözüm ötməz, mən kimi avara yox,
El-gün rəhm eyləməzlər, mən kimi biçarə yox,
Ürəyim səd para təkdir, heç tənimdə yara yox,
Sən qəribsən, mən fəqirəm, səndə-məndə çarə yox,
Sevdiyim, təqdiri-haqdır ayıran bizdən səni.

Sevdiyim, sən gündə bir kəz yadına salsan məni,
Gündə yüz qatla dilərəm yaradan haqdan səni,
Əzəl gündən sən oda saldın mən farağat bəndəni,
Haq götürsin aradan, öylə rəqib-şərməndəni,
Qıl büxl bizdən yana incitsələr sözdən səni.

Bağına girsəm səhər, bülbül olub salsam oyun,
Qəflətə qalsa rəqib, bir dəm salışsaq qol-boyun,
Haqdan özgə çarə yoxdur, nə qılim, mən neyləyin,
İncə bel, şirin zəban, qumru topuqsan, qaz boyun,
Saxlasın tanrı pənahında yaman gözdən səni.

Xeyrini düşmən görər, dostun çəkər cəbri-cəfan,
Yara, dildarlıq olarmı sürməyən zövqi-səfan,
Salsalar tərəziyə Balkan dağı olmaz bahan,
Söyləyər Məxdumqulu əhdin yalan, yoxdur vəfan,
Bivəfalar xub soyutmuşlar, sonam, bizdən səni.

## GƏLDİN

Bu nağıldır, adəmzad, sən bu məkana gəldin,
Əvvəl atan belindən sızıb nihana gəldin,
Ondan anaya varıb, bir qətrə qana gəldin,
Anada surət olub, bu şirin cana gəldin,
Doqquz ayı ötürüb, enib cahana gəldin,
Əmib ana südünü, böyüyüb, dona gəldin.

Yaradan qüdrətindən diş ilə dəhan verdi,
Sözləməyə söz ilə dəhanda zəban verdi,
Könlün gedib hər yana, durdu, ayağın yürdü,
Bildin yaxın-yadını, gözün dünyanı gördü,
Yeddi-səkkiz yaşında atan mollaya verdi,
Oxub Quran kitabı, yetişib ona gəldin.

On beş yaşa varanda cavanlığa boylandın,
Qız-gəlinə meyl edib, könül verib küyləndin,
Guya varıb ağ öyün dörd daşına dolandın,
Haqqın fərmanı ilə axır bir gün öyləndin,
İyirmi yaşa vardın, əsbabını şaylandın,
Bədəv minib, səyridib, sürüb meydana gəldin.

Otuz yaşa varınca, sanki bir alğır şirsən,
Dünya qəmi başında, guya yürüb, yelirsən,
Dünyaya doymaq yoxdur, olunca olsun dersən,
Əhli-müsəlman olsan, ölüncə halal yersən,
Qırxında tövbə edib, bir mürşidə əl versən,
Könlünü birə bağlar, əziz sübhana gəldin.

Əlli yaşa varanda, doğruluqda olarsan,
Kobudluqdan ayrıldın, incəliyi bilərsən,
Hər necə cəfa çəksən, axır bir gün ölərsən,
Beş vəxt dua oxuyub haqqa şükür qılarsan,
Altmış yaşa varanda, qocalığı bilərsən,
Əkən əkinin biçıb, oraq-ormana gəldin.

Yetmiş yaşa varanda, qanın qaçar üzündən,
Ağ dişlərin tökülər, şölə gedər gözündən,

Qüvvət səndən ayrılar, gücün qaçar dizindən,
Heç kişi hədər etməz, söylədiyin sözündən,
Səksən yaşa varanda, könlün keçər özündən,
Gedər olub dünyadan, yaxasız dona gəldin.

Məxdumqulu, möhnətdir hər kim doxsana yetsə,
Kəm-kəm gələr cahana əgər yüz yaşa yetsə,
Heç kimdən haray olmaz əcəl yaxanı tutsa,
İmanını qazansan, yolunu rəvan etsə,
Axır olacağın budur – tənin yer ilə yatsa,
İşığı, tünlüyü yox, qaranlıq xana gəldin.

## VAR MƏNİM

Ey yaranlar, neyləyim mən, yanan canım var mənim,
Bazarı viran olubdur, ol dükkanım var mənim,
Duzəx odundan betər atəş suzanım var mənim,
Eşqə özün qurban qılan bir pərvanım var mənim,
Neyləyim, səfil gəzib, Hindistanım var mənim.

Gül üzünü qılsa puş ol, ay-gün ondan utanar,
Bağ içinə girsə məgər, şöləsindən gül solar,
Nəzər salsa qəzəb ilən, bu cahan viran olar,
Ölülər cana gəlib, bədbəxtlər iqbal alar,
Neyləyim, ol ərəb zəban, ol bal zəbanım var mənim.

Gəldi əbr, qıldı savaş suyi-asman sayında,
Behişt, irəm hasil olmuş bu cahan sarayında,
Seyr qılıb gələr oldu rəməzanın ayında,
Duzəxlər behişt olubdur, tövbə eylər cayında,
Bu zəminin üzrəsində laməkanım var mənim.

Külli-aləm eşqi birlən od alıb nara bişər,
Ruyinə müştaq olubdur, kövkəblər yerə düşər,
Sərvilər gül bitirib, ətrafına qız üşüşər,
Camal üzrə hindi xala heyrandır xeyrül-bəşər,
Külli aləm gözəlindən ziyad cananım var mənim.

Qəfəs içrə çırpınıb, eşqinə pərvanə mən,
Bülbül oldum, yetmədim, ol gözəl reyhanə mən,
Sər salıb qıldım nəzər, bu eşqi-pünhanə mən,
Eşqi bilən xakistər olan natəvanə mən,
İstəməzəm ol behişti, behişt məkanım var mənim.

Görənlərin gözü doymaz, görməyən ərman çəkər,
Ruyinə mayıl olub mən, tütünüm asman çıxar,
Bağı içrə olsam hasil, alnımdan reyhan çıxar,
Zülfü-siyah kakilindən gözəl zərəfşan çıxar,
Zərəfşan daxil deyildir, Nil–ümmanım var mənim.

Dəştə səyyad olub girsə, qurtarmaz bir maralı,
Bənd eyləmiş bir zülfünə qadir sübhan bu halı,
Xəsislər felin unudub, sədəqə gəlmiş malı,
Bilmənəm, canımdamı ol gözəlin xəyalı,
Gül ruyinə gündə yanıb, onca fəğanım var mənim.

Zarıma tövbə qılıbdır qonşu, qardaş, ellərim,
Bülbülə intizardır bağ içində güllərim,
Zəmin ilən sürünübdür bəhri-Xəzər yellərim,
Söyləyər Məxdumqulu, ol bal olmuşdur dillərim,
Ərş içrə məkan tutan əcəb dastanım var mənim.

# DE

Badi-səba, ərzimi ol yalnız doğana de,
Əlmüdam zar eyləyən, gözləri xun-qana de,
Şum fələyin əlindən gedən ol canana de,
Ayrı düşüb, qəm çəkən, qarabəxt xana de,
Dünyadan ərmanlıdır, ol paxır pərvana de.

Nə olubdur, nə səbəbdir, görmürəm mən üzünü,
Qara qanla boyayıb oturmuş ki gözünü,
Bizaram malü-mülkdən, gər eşitməsəm sözünü,
Nərdə qafil eyləyib, bənd qıldın sən özünü,
Dərdimin izharını ol əmin Loğmana de.

Bizləridən yad qılıb, bənd eylədin ki dilini,
Ata-anadan ayırıb, üzdün ey, sən belini,
Hicrana rəvaç eyləyib, yatırıb sən yelini,
Axtaram, çay tapmayan, iki gözüm selini,
Cani-aramın taqətin ol böyük ümmana de.

Qıldılar Kəbəmi viran, yoxdur indi qaçarım,
Çıxdı getdi əllərimdən can şəhrimin açarım,
Yoldular bu qanadımı, yoxdur daha uçarım,
Düşdü talan xəzinəyə, qurtardı mal saçarım,
Halımın bu təngliyin əskilməz dükana de.

Haqqa ərzim budur, ey dost, qılsın azad qardaşı,
Axıban, dəryaya döndü, mövç urub gözlər yaşı,
Qoydu alnıma gətirib, fələk ayrılıq aşı,
De, niçin zar qılmasın Fəraqi, yoxdur sirdaşı,
İki dünya gərəyim, arzulu imana de.

## YA RƏSUL

Haqq səni sərvər yaratdı, padişahım, ya rəsul,
Ənbiya sər dəftəri, nuri-ilahım, ya rəsul,
Zülməti tutdu cahanı tüstü-ahım, ya rəsul,
Baş qoyub yatsam qapında, qibləgahım, ya rəsul,
Sən eşitgil naleyü fəryadi-ahım, ya rəsul.

Hammıdan əla yaratdı əsli nuri-pakını,
Qəddinə qıldın münasib xilqəti-lövlakını,
Ol mübarək əllərində həm əsayu məsvakını,
Ümmətim deyib söylə biz asiyu bibakını,
İki aləm içrə sən puşti-pənahım, ya rəsul.

Dedilər sultani-aləm adına asdaq ola,
Möcizinin birisin göstərəli ol şəkk ilə,
Ərş üstünə çıxıb raz söyləşərsən həqq ilə,
Ay, buluddan kim işarət eylədin barmaq ilə,
Künbədi-həzraya çıxmışdır güvahım, ya rəsul.

Vəz-zühadır üzlərin hər birinə mahi-leyl,
Süreyi-iqra sənə müjdə gətirdi Cəbrayıl,
Xədicənin tapması imana gətirdi meyl,
Fəxri-aləm sənsən u özgə nəbilər bir zeyl,
Xətm edib ərvahına qıldım duaım, ya rəsul.

Ya rəsulüllah deyib, sonra gedər oldu Buraq
Leylətül-merac gecəsi tanrı yetirdi çıraq,
Yeddi asman işığın açdı məlaik bisoraq,
Dörd don gəldi sənə, yaşıl, qızıl, həm sarı, ağ
Birisin sevib aldın, şol oldu razın, ya rəsul.

Yad edər, Məxdumqulu, dövranda mən qallacını
Şəfqətindən naümid etmə məni-möhtacını,
Xidmətində seyr edərlər leylətül-meracını,
Ol xuda sevdiyindən qoydu başına tacını,
Xətm edib ərvahına qıldım duaım, ya rəsul.

## GÖRCƏK, RƏSUL

Düşdü bir xoşluq cahana nüsrətin görcək, rəsul,
Sərnəgun oldu sənəmlər ləmatın görcək, rəsul,
Külli aləm oldu iqrar sünnətin görcək, rəsul,
Rahi-zülmət oldu rövşən ayətin görcək, rəsul,
Tapdı duzəxdan aman kim, söhbətin görcək, rəsul

Sən ki gəldin dünyayə, bütlər oluundu sərnəgun,
Artdı islam şöhrəti, kafirlər oldu həm zəbun,
Həm Əbubəkr, Ömər, Osman çü olğac rəhnəmun,
Oldu kafir zid sənə, oldu mükirin möminun,
İki dünya oldu xoşnud rəhmətin görcək, rəsul.

Hörmət ilə həqq səlam verən Səfiulla kimi,
Aləmi qərq eyləyən Nuhi-nəbiulla kimi,
Göydə günə yar olan İsa bəriuhulla kimi,
Neçə min peyğəmbər ol Musa kələmulla kimi,
Qaldılar heyrətdə lövläk xilqətin görcək, rəsul.

Ol şəbi-merac xəbər yetcək sənə məşuqdan,
Ərşü fərş olmuş təcəlli çün munun tək şövqdən,
Bu mükərrəblər bəsi bibəhrədirlər bu zövqdən,
Həm büsati-qürb üzə vardın, oturdun fövqdən,
Qoydu diş varmaqda bunlar qürbətin görcək, rəsul.

Dövri-sabiqdə ötənlər, yar, camalın çün ənin,
Gərdişi saniyə qalan müqtəkiddirlər yəqin,
Qulluğunda gün, xəcalət içrə qalmış həm zəmin,
Həm fələk üzrə mələklər dedilər «səd afərin»,
Bu məqami-əla ilə hümmətin görcək, rəsul.

Ya həbiba, eşqin ilə təndə canım suz edə,
Gün üzün həq döndərə bir ayrı leyl-ruz edə,
Ertə məhşər aləm əhlin yüz iyirmi güz edə,
İstəsə narü sağar ümmətlərin məhuz edə,
Dəf ola narü cəhənnəm heybətin görcək, rəsul.

Həmdinə dil qısadır ərşü fərşlər ağladı,
Bidəhanü bizəban odlar, ağaclar ağladı,
Əşki-abın coşdurub, bu dağü daşlar ağladı,
Yeddi gün Kəbə dışında qurdü quşlar ağladı,
Söyləyər Məxdumqulu, bu firqətin görcək, rəsul.

## OLMASIN AXIR ZAMAN

Neçə iş gəldi, bil, ey qafil, qiyamətdən nişan,
Daima zalımların içdikləri guya ki qan,
Hər fəqir əhvalını sormaz ədalət ilə xan,
Hərisi-dünya oluban yaxşılar oldu yaman,
Ey yaranlar, bəs neyçin kim, olmasın axır zaman.

Fəhm edin bu xəlq ara heç bir qənaət qalmadı,
Çün xəsis oldu səxilər də, səxavət qalmadı,
Feli-bədbabdan fəqirlərə kifayət qalmadı,
Haram loxma yeyən dərvişlərdə taqət qalmadı,
Ey yaranlar, bəs neyçin kim, olmasın axır zaman.

Gəltirər alim sözünə işbu cahillər bədəl,
Bir neçə alimlər öz elminə qılmazlar əməl,
Nəfs işinə cəhd edib, eylər namazına xəyal,
Kimsələr sanmaz, bəradər, yetişib növbə məgər,
Ey yaranlar, bəs neyçin kim, olmasın axır zaman.

Yortub kəsbi-harama, xeyr işığın yapmaq ilə,
Feli-bədlər artıbdır, bihəd bəla tapmaq ilə,
Yad olub iki müsəlman bir-birin çapmaq ilə,
Gəldi min dürlü bəla şər işlərə qopmaq ilə.
Ey yaranlar, bes neyçin kim, olmasın axır zaman.

Bir neçələrin işi içmək araq dövri-müdam,
Bir neçələrin işi zövqi-zinadır sübhü şam,
Bir neçələrin işidir daim bir keyfi-haram,
Ol səbəbdən əskilibdir hörməti-elmi-kəlam,
Ey yaranlar, bəs neyçin kim, olmasın axır zaman.

Zalimlər, sələmçilər olmuş giriftari-bəla,
Nəfs üçün avaradır dünya yolunda mübtəla,
Bəzi adam bir-birisi misli bəy təkdir guya ,
Qalmamışdır bəzi adamlarda heç şərmü həya.
Ey yaranlar, bes neyçin kim, olmasın axır zaman.

Zalimlər, sələmçilər olmuşlar xudadan bixəbər,
Fani dünyanı baha deyib, toplayırlar simu zər,
Fasiqü gümraları məscid sarı qılmaz güzər,
Eyləməz alimə izzət, həm şəriətə nəzər,
Ey yaranlar, bəs neyçin kim, olmasın axır zaman.

Dedi bu Məxdumqulu, günahlar qərq etmiş məni,
Əmri-məruf işlərin etsəm deyib cəhdim kanı,
Kimsə yaxşı, kim yamandır, kimsə bilməz kimsəni,
Kətxuda oğul atadan, qız anadan keyvanı,
Ey yaranlar, bəs neyçin kim, olmasın axır zaman.

## MƏNLİ

Pərilərin içində oxşar sultana Mənli,
Gər sayrısa bülbüllər, bənddir zəbana Mənli,
Eşq oduna bad verib, saldı suzana Mənli,
Sultan olmuş, neyləyim, gənci-nihana Mənli,
Mən fəqirəm biçarə, qoymuş ərmana Mənli.

Ərzim var dərgahında, eyləsən mənə nəzər,
Mən bir dükan qururam, sənsən ol eşqi-bazar,
Eşq bağında gəzişib, oldum nara sazəvar,
Nağıl vardır, aşiqlər görsə bir-birin qızar,
Sənsən eşqin atəşi, mən bir pərvanə, Mənli.

Nərgiz sənin gözlərin, ol qaşların kamandır,
Dəhan içində balın, bu nə şirin zəbandır,
Civə kimi biqərar, üstündə pərvaz candır,
Gül ruyini görməsəm, gözdə yaşım rəvandır,
Bənzəyibdir göz yaşım, neylək, ümmana, Mənli.

Fani cahan İrəmdir, sən ol bostanın gülü,
Mən ki fəqir vabəstə, qəfəs içrə bülbülü,
Gül ruyində niqabdır ol Leylinin sünbülü,
Nə səbəbdir, xorlarsan mənim kimi zəlili,
Ol camalın eşqində oldum divanə, Mənli.

Surətin aya oxşar onca surət içində,
Xan olmuşdır siratın neçə sirat içində,
Nə qiymətdir camalın onca qiymət içində,
Bostanın qılsam tərif göylən, yomut içində,
Nəzər salsan, bu dəştim oxşar bostana, Mənli.

Mən eşqinə gədayam, yandırdın mən pərvanı,
Sənsiz indi neyləyim mən bu fani cahanı,
Gül ruyini görsəm bir, nedim bəşər-qılmanı,
Yaxdı canım, neyləyim, bu duzəxin suzanı,
Bu canıma cəbr edib, qoydun fəğana, Mənli.

## BƏNZƏR HÖKMLÜ

Könüllər köşkündə xəyalın xanı,
Övladi-hünkara bənzər hökmlü.
Aşiq çəkər naləni,
Yasa salar laləni,
Yerdə bəşər padşahı,
Xudayımın halanı,
Qəmzənin qulduru salsa talanı,
Kirpiyin ox, qaşın yaydır çəkimli.

Gözəllərin vəsfin etsələr handa,
Aləm ağzı tamam cəm olar səndə,
Ta can vardır bu təndə,
Arzuməndim var səndə,
Adın Ruma düşdü, şöhrətin getdi Hində,
Leyli sənə kənizdir, Züleyxa olsun bəndə,
Mən həm sənin dərdindən qalmışam, bax, dərməndə,
Bağda bitən gülçöhrəsən dibçək baxımlı.

Eşqin atəşini saçıbsan düzə,
Can poladdan olsa, dözməz bu közə,
Toxunsa dilbər közə,
Zəban gələr hər sözə,
Görkün günəşi doğsa, nə san vardır ulduza,
Alma zənəxdana, bu gümüş üzə,
Siyah zülfün surətkardır tökümlü.

Humay oturuşlu, laçın duruşlu,
Kəbütər topuqlu, maral görüşlü,
Tazə hilal qaşlı, mirvari dişli,
Tavus quş zinətli, Davud tovuşlu,
Qumru şivəlisən, kəklik yürüşlü,
Şahbaz quş tumarlı, tərlan baxımlı.

Bağlanıban çıxsan şitteyi-gülzar,
Hüsnün xəyalatı aləmi tutar,
Aşiq deyər: «Ey dildar,
Görkü günə tay dildar,

Tapar həccin səvabın –
Hər kim bir qərib sevər,
Məxdumqulu, sən tək görmədim, dildar,
Bu cana yatımlı, könlə yaxımlı.

## GÖZƏLİM

Verək şirin canımı, gəlgil-nihan gözəlim,
Sənsiz gözə almanam fani-cahan, gözəlim,
Pərilərin sahı sən, gözəl sultan gözəlim,
Kirpiklərin cəlladdır, mürvət-aman, gözəlim,
Bu fələk gərdişində yoxdur canan, gözəlim,
Gül ruyində bənd olmuş mahi-taban, gözəlim,
Nəzər eylə gözümə, bənddir ümman, gözəlim.

Gül ruyində bilmədim, vardır ol cürgə xalın,
Kamana əzm eyləmiş, çeşm üstündə hilalın,
Sultanısan Leylinin, ol Züleyxa zülalın,
Qoynun içrə yetişmiş firdövs ərən nihalın,
Mahi-taban bənd oldu görüb sahibcamalın,
Gül ruyindən götürgil, nəzər salaq, dəsmalın,
Mən eşqində olmuşam dəli-Məcnun, gözəlim.

Gənç-xəzinə saxlayır, sallanıbdır şamarın,
Ol şamarın altında yatıbdır qoşa narın,
Qılsan biadil fərman, deməm: «Yaman azarın»,
Can şəhrində gördüm mən sənin eşqi bazarın,
Aman, dilbər, yandırdı, nə əcaib nəzərin,
Mən Fərhadam, ağlayıb eşqində xari-zarın,
Şirin kimi daransan, yoxdur ərman, gözəlim.

Sözlə dilbər, eşidək, qəflətdən çıxsın gözüm,
Naz eyləyib baxarsan, bilmən, nə diyən sözüm,
Fani cahan içində eşqinə məstan özüm,
Ömür axır düşmədi camalına bu üzüm,
Qurtarmışam, katibəm, əlimdədir bəyazım,
Sənsən fələk çarxında könlümdə dilnəvazım,
Dərdim əncümən qılıb, mən natəvan, gözəlim.

Füzun olsa da dərdim, yetişərsən Loğmanım,
Dünyada gənci-kanım, sənsən dini-imanım,
Bağ içində bərq vuran ənbərımsən, reyhanım,
Görər gözüm işığı, kəlam desəm zəbanım,
Könlüm bağında bitmiş gözəlim, ərğuvanım,

Səhər səba dolanan sən sərvi-xuramanım,
Canım içində bitən sən cavidan, gözəlim.

Qəbul qılsan mən qulu, daim xidmət qılayım,
Tanrıdan nə dərd ensə, varıb özüm alayım,
Əzrayılın alnında mən sədəqə olayım,
Gər ki, gözəl, istəsən, canım nara salayım,
Ol Məcnunun yerində daim özüm qalayım,
Sən Quranım nəzər sal, bu üzümə salayım,
Mənim kimi bir qulda sahibgiran, gözəlim.

Desələr sən tək gözəl enmiş fani cahana,
İnanmaram, inan ki, bu cür qələt süxənə,
Hərgiz seyr eyləsən, nəzər salgil bu cana,
Eşq ilən zövq edib girdim darül-amana,
Cürə xalın yesiri, mən ol hala pərvana,
Ömür axır düşməz ruy bağda sən tək reyhana,
Nar içində dolansam, bilgil, ehsan, gözəlim.

Başdan-payə seyr etdim, belindədir zünnarın,
Yanan canıma qonar ol ataş bişümarın,
Nisar qılsam canımı mən fəqir giriftarın,
Hansı yerə baş qoysan, alnında sazəvarın,
Yanan cana rəhm edər, çevir əcəb nəzərin,
Gündə bir dəm görməsəm, yetməz səbrü qərarım,
Qoynun içində gördüm mən laməkan, gözəlim.

Məxdumqulu pərvanə, eşqin ilən od alar,
Ta xakistər olunca, pərvanə narda qalar,
Ruyin görüb ol behişt, hu çəkmişdir, utanar,
Sənin kimi bir gözəl, məgər, firdövsdə olar,
Neyləyim, bəxtim qara, fələk badağın salar,
Vermənəm yar canını, mənim canımı alar,
Verər oldum canına gündə on can, gözəlim.

## BİTMƏK GƏRƏK

«Əlif» Allah yoludur, doğru durub getmək gərək,
«Bi» xudanın birliyin bərhəq bilib bitmək gərək,
«Ti» tövbə eyləyib, dünyanı tərk etmək gərək,
«Si» səhvən eyləsən, dönüb yaxa tutmaq gərək,
«Cim» caizdir xoca-qul qulluğun etmək gərək.

«Hi» həmdin yad edib, hökm ilə kimi eylədi,
«Xi» xuda mən-mən dedi, iki cahanı eylədi,
«Dal» dəlalət deyibən, Mustafanı eylədi,
«Zal» zəlillik çəkməsin deb, basəfanı[7] eylədi,
«Ri» rəhmət bəhrindən ixlas ümid etmək gərək.

«Zi» ziyadə nəfsini dünya üçün aldırmagil,
«Sin» sübhanını yad et, qəflətə yeldirməgil,
«Şin» şeytan yoluna gül könlünü uydurmagil,
«Sad» səbr eylə, səvabın atəşa yandırmagil,
«Zad» zəbt  birlə sorasa, nə cavab etmək gərək.

«Tay» tamah birlə könlün nəfs yoluna salmagil,
«Zay» zülm edib o gün duzəxdə qalıb yanmagil,
«Əyn» aləm düzdü karvan, sən həm ondan qalmagil,
«Ğəyn» qəni mali-mülküm baqidır deb sanmagil,
«Fi» fərağat vəqt ikən, nəfsini ram etmək gərək.

«Qaf» qərabət istəsən, bu yolda belin bağlagil,
«Kaf» günahın yad edib həm dur səhərlər ağlagil,
«Lam» lütfün qıl ümid, şeytandan özün saylagil,
«Mim» muradın istəyib, acizliyin yad eyləgil,
«Nun» nuri-rəhmətindən çin ümid etmək gərək.

«Vav» vəsli rütbəsin bir gizli bazar eylədi,
«Hi» həlakətlik ilən aşiqlərin zar eylədi,
«La» İlahə illəllah deyib, özün aşkar eylədi,
Verdi yerə məskənət, asmanı dövvar eylədi,
Mərd olanlar eşq yolunda canın unutmaq gərək.

---

[7] Bu ifadə altinda dört səhabə (Əbubəkr, Ömər, Osman və Əli)  nəzərdə tutulur.

«Ya» Yaradan yoluna nanını versən az hənuz,
Tən bərəxnə oturub, donunu versən az hənuz,
Rəngi sürxün soldurub, qanını versən az hənuz,
Çak edib, Məxdumqulu, canını versən az hənuz,
Çün cananını istərsən, canın unutmaq gərək.

## DÜŞSƏN DƏRDİ-BƏLAYA

«Əlif» əvvəl-ibtida, həmdin yetir xudaya,
«Bi» boş yürmə qulluqda düşsən dərdi-bəlaya,
«Ti» dur xabi-qəflətdən, ömrün gəlmiş oraya,
«Si» sağar var, hazır ol, «cim» cəhd eylə yaraya,
«Hi» helmin hörməti çün rəhm et mən binəvaya.

«Hi» həsrətli ələmi səndən özgə kim eylər,
«Dal» dərdimə dəvanı səndən özgə kim eylər,
«Zal» zümreyi-günahə «ri» rəhmin məlhəm eylər,
«Zi» zor eyləsə həşmin, küllüsin bərhəm eylər,
«Sin» səhərlər bidar et, sal çeşmimi oyağa.

«Şin» şövqünə düşənlər, «sad» səbr edib durmazlar,
«Zad» ziyanı anlarlar, ha yürürlər, varmazlar,
«Tay» tələbi-didarın aram-qərar qılmazlar,
«Zay» zahirdir, «əyn» elmin bildirməsən bilməzlər,
«Ğəyn» qəflət içində qoyma məni pirayə.

«Fi» fikrini qılana, «qaf» qüdrətin bəs döymü,
«Kaf» «kon» deyən binana, «lam» ləmatın bəs döymü,
«Mim» məna anlayana, «nun» nemətin bəs döymü,
«Vav» vəslinə yetincə, «hi» hicrətin bəs döymü,
«Lam-əlif» yox etibar dünyayi-bivəfayə.

«Ya» yalançı dünyanın peşəsi al iləndir,
Alın görüb güvənmə, dibi zaval iləndir,
Çərxin işi hər zaman bir ayrı hal iləndir,
Məxdumqulu, bir könlüm yüz min xəyal iləndir,
İşim asan etməsən, dönər, sübhi-sabaha.

## KÖNLÜM

Oyan xabi-qəflətdən, əcəlsiz ölən könlüm,
Ümid üzüb aləmdən, dərgahdan dilən, könlüm,
Mərd gərəkdir almağa bu qərib qalan könlüm,
Dibsiz dəryaya düşdü ol xürrəm, gülən könlüm,
Can fani, cahan fani, kəfənə dolan, könlüm,
Danış, dərdin azalsın, sussan qəm dolan könlüm.

Alimlər sözün dinlə, nəsihətin al-götür,
Dur, haqqın dərgahına münacat qıl, əl götür,
Riyazatın yükünü örkən ipin sal götür,
Bu iş mərdin işidir, mərdanə dur, qal, götür,
Kamil ayağa baş qoy, kainatdan əl götür,
Tövbə qılıb, bir pirin xakinə bulan, könlüm.

Eşqim vardır Məcnundan altmış kərə ziyada,
Qırx il qüvvətim vardır dərs deməyə Fərhada,
Ürəyim yaxıb oda, xocama varsam dada,
Kərəm dəryası coşub, yetirərmi murada,
Qalsa könül tapılmaz, çıxsa bu can dünyada,
Mərd gərəkdir almağa bu qərib qalan könlüm.

Səhər durub, dua qıl, «amin!» desin fəriştə,
Nə vardır qafil yatıb, bihudə oturuşda,
Mülki-cahan tutdurmaz eyləsən min səriştə,
Abdal örtüsün geyib, get divana qarış da,
Yoxsa qalarsan tənha sərgəşteyi-qəmkeşdə,
Dediyin sözə felin olmasın yalan, könlüm.

Məxdumqulu, nuş etdim qəm badəsin iki tas,
Üç içənə rəğbət yox, çün candan oldum xilas,
Sərimdə sansız sevda, içdə vasvasül-xənnas,
Gəlin, bir tədbir edin, bu dərdə, ey yühənnas,
Diz çöküb dəm vursalar İsa, Xıdır həm İlyas,
Qalınmaz, zində olmaz, xud mürdə olan könlüm.

## AŞİQ OLMUŞAM

Ey yaranlar bir üzü gül aya aşiq olmuşam,
Hamının məqsudi – gül rənaya aşiq olmuşam,
Bülbüləm, bağ içrə bir qovğaya aşiq olmuşam,
Özü qaib, zülfləri yeldaya aşiq olmuşam,
Mənzilim bağ içrədir, səhraya aşiq olmuşam.

Çün fələk saldı məni ol gün fəna torpağına,
Düşdü seyrim daima Məkkə, Mədinə dağına,
Bülbül oldum, oxudum, girdim İrəmnin bağına,
Payi-bənd oldum o gün qəm əhlinin duzağına
Yüz bəla-möhnətli bir sevdaya aşiq olmuşam.

Gövdəm içrə yar qəmidir, mənzilim səhrada, hey,
Puşeşim qəm-qüssədir, mən dönmüşəm Fərhada, hey,
Saldı eşqin, dilbəra, canü ciyərim oda, hey,
Tamam nisyə keçdi ömrüm, zaye verdim bada, hey,
Ahı çox, əfğanı çox, bir köyə aşiq olmuşam.

Bilmənəm, ol nə bəhrdir, nə müəzzəm dağıdır,
Aldı könlüm, getdi ağlım, tən müdam naçağıdır,
Onu nisbət etmək olmaz, qumru, bülbül, zağıdır,
Ay qərəz hər zülfünə, yetmiş min ər dustağıdır,
Qəddi-qaməti bülənd, zibayə aşiq olmuşam.

Dost, həvayi-vəslini mən bunca candan istərəm,
Dami-zülfün qeydinə özümü zindan istərəm,
Deme: «Qəmdən bir zaman könlümü xəndan istərəm»,
Bir qərib aşiq mənəm, yar, səni səndən istərəm,
Gecəyü gündüz, bilin, hu-hayə aşiq olmuşam.

Qalmışam heyran olub, qeyri müdarım yox mənim,
Aldı canım eşqin odu, ixtiyarım yox mənim,
Təndə can pərvaz edər, ayrı durarım yox mənim,
Gəlsə, ağlım dağıdar, getsə qərarım yox mənim,
Qəmzəsi ox, qaşları ol yayə aşiq olmuşam.

Söyləyər Məxdumqulu, mən onda kanə uğradım,
Seyr edib vardım fələyə, laməkana uğradım,
Çün məni rüsva qılan eşqi-yeganə uğradım.
Yetmiş iki şəhr içində min bir dükana uğradım,
Bunca sərgərdan-səfilü zayə aşiq olmuşam.

## ÜRƏYİN QAN İÇİNDƏ

Könül, nə iş bitirdin, gəldin, cahan içində,
Qaldın dünya qəmində, ürəyin qan içində,
Abad deyib el verdin, tamam viran içində,
Tən torpaqdır, əylənməz cövhəri-can içində,
Rüstəm quma bataraq, qaldı yeksan içində,
Sən oların yanında gəlməzsən san içində.

Dünya deyib yüyüsən, ta içində dəm vardır,
Dəm içindən çıxınca, başında min qəm vardır,
Qəm altında yatarsan, nə ona məlhəm vardır,
Doymaz gözün dolmağa  iki ovuc qum vardır,
Bu cahanda, adəmzad, səndən qafil kim vardır,
Qurda, quşa nəzər qıl, külli fərman içində.

Ey dostlar, ol dünyaya varan var da, gələn yox,
Ölü-diri halından xəbər, ətər bilən yox,
Çərxi-fələk əlindən ağlayan var, gülən yox,
Ağıl edin, qardaşlar, köhnələrdən qalan yox,
Kainatın vəfası yoxdur desəm, yalan yox,
Dünyaya bel bağlayan, qaldı ziyan içində.

Ya ilahi, sən saxla qaçaqlardan yollarda,
Sağda-solda deyirlər: «Buraxmayın çöllərdə»,
Könül dünya eşqində, haram sözlər dillərdə,
Mən bir aciz bəndəyəm, kəminəyəm qullarda,
Çox günahlar qazandım, az fürsətli illərdə,
Xəcalətə qoymagil yaxşı-yaman içində!

Məxdumqulu, aldadır qəhbə dünya bəzənib,
Könlünü mail qılma ona qarşı düzənib,
Nə farağat yatırsan əl-ayağın uzanıb,
Əcəl yatır marıqda oxun-yayın gəzənib,
Məhşər günü bərabər imanını qazanıb,
Quru gəldin, boş getmə axır zaman içində!

# ONDADIR

Yaxşılar tutmuş bina, bir şəhri gördüm – ondadır,
Eşq mətahı satılan bazarı gördüm – ondadır,
Rəngbərəng güllər açılmış xarı gördüm, ondadır,
Xub şəcərlər boy çəkibdir, varı gördüm, ondadır,
Yüz cilvəli, işvəli dildarı gördüm – ondadır.

Qaim olsan istəməzlər, getsən ki, avaz eyləyər,
Sözləsən verməz səda, sözləməsən raz eyləyər,
Könlünü bənd eyləyib, özünü pərvaz eyləyər,
Bir pəri pünhan oturmuş, «gəlmə» der, naz eyləyər,
Ol pəri-peykər sifətli yarı gördüm – ondadır.

Ol Xıdır İlyas ilən Əhməd, Süleyman onda var,
Ol Səlim şah, Məkkə xanı ibni-Sultan onda var,
Bəyazid, Sultan Veys – xirqəni geyən onda var.
Bir neçə Məcnun kimi çaki-giriban onda var.
Dayanar Musa əsası – marı gördüm – ondadır.

Bəhr ara balıq içində rahət edib uyğulanan,
İmtihan eylər ona kərmi-kəlanlar bəklənən,
Dost olub Allahına düşmən elində saxlanan,
Mancanağa bağlanıb bir ataş içrə oxlanan,
Kəbə bünyad eyləyən memarı gördüm – ondadır.

Yüz iyirmi dörd min yenə yeddi yüz peyğəmbəri,
Üç yüz on üç mürsəlin – onlar dəxi taci-səri,
Yüz iyirmi dörd min dürdanənin sənsən baş gövhəri,
Ümmətinin şafiqi, Məxdumqulunun mənzəri,
Ol Məhəmməd Əhmədi-Muxtarı gördüm – ondadır.

## SƏDA OLDUM

Sanduvaci-sərməstəm, bərgimdən cüda oldum,
Bərgimi xəzan çaldı, bisövtü səda oldum.
Bir gülçöhrə yolunda bihudə fəda oldum,
Bəd işlərə bay oldum, xeyr işə gəda oldum,
Firqət, vüslət, hər nə ki – əslin əz xuda bildim,
Hammını bidar gördüm, özüm uyğuda bildim,
Dünyaya durub gələn, əylənməz, gedə bildim,
Yediyimi ov sandım, geydiyim rida bildim,
Yandım, bişdim, yar-dostlar, yaxıldım, əda oldum.

Yaranlar, yoldaş oldum nəfsi-həva zalimə,
Geyik tək qaçar, varmaz, nəsihətçi alimə,
Sərkeşliyin sübhana məşhur etdi aləmə,
Mən nə deyim, a dostlar, uğursuz iqbalimə,
Qoymadı öz halimə, yürüyən məcalimə,
Nə qazanca güvəncim, nə xoşbəxtlik malimə,
Çöp miqdarına keçməz bu cahan xəyalimə,
Bilməm, aləm nə kefdə, mən heyran öz halimə,
Yandım, bişdim, yar-dostlar, yaxıldım, əda oldum.

Cəhl işinə çabuk mən, Allah əmrinə süstər,
Qərqi-zəlalət oldum, hidayəti sən göstər,
Nə dərvişəm, nə molla, nə sufi, əhli-dəstər,
Qardaşlar qulaq versə, desəm sözümü rastər,
Fikir edin, kim vardır yiyəmdən özgə dost ər,
Bəndəlikdə olmasan, olmağın yaxşı nist ər,
Görmədim gün altında hərgiz özümdən pəst ər,
Atəşə layiq olmaz əda olan xakistər,
Yandım, bişdim, yar-dostlar, yaxıldım, əda oldum.

Səhrasına Süleyman gər sürsə səd siyasat,
Gəlsə pəri padişahı Ağtəmirü Canpolad,
Yüz min devə baş olan dev törəsi Dəmirbat,
Məgəs şahı Turtarus həmralıq etsə, heyhat,
Mur məliyi Münzərə gəlsə bihəd, bəğayat,
Musa nur əlin açıb, İsa oxub yüz ayat,
Xıdır dua eyləyib, İlyas etsə minacat,

Böylə murdar cəsədə müxaldır tapmaq nəcat,
Yandım, bişdim, yar-dostlar, yaxıldım, əda oldum.

Məxdumqulu, miskinəm, könlüm öyü naməmur,
Sözə yaxın bəndəyəm, xeyrim kəmü şərim zor,
Özüm xəlqə naqabil, iqbalım kəc, bəxtim şor,
Naşayəstə amalım, guya qədəm vurar kor,
Məgər yiyəm istəsə, olar nuran ala nur,
Bir tərfətül-eyndə düşəndir olub məhcur,
Bədguluq birlə oldum cahan içində məşhur,
Dəyirmən tək bangirəm, səməndər tək atəşxor,
Yandım, bişdim, yar-dostlar, yaxıldım, əda oldum.

## RƏBBİM CƏLİL

On səkkiz  min aləm əhlin var edən rəbbim cəlil,
Döndərib dərgahinə həm zar edən rəbbim cəlil,
Qüdrət ilə ərş öyün dövvar edən rəbbim cəlil,
Heybət ilə fərş öyün həmvar edən rəbbim cəlil,
Əmr edib, bir beyzayı ənvar edən rəbbim cəlil.

Ayrı sevdaya salıban rayini hər bəndənin,
Xoş əcəb səriştə birlə mürdənin, həm zindənin,
Meşələr içrə arslan hər yırtıcı dərrəndənin,
Yer üzündə hər nə var, murü mar-cünbəndənin,
Rizqini təqsim edib, təyyar edən rəbbim cəlil.

Neçə peyğəmbərlərə qıldın ətayi-dövləti,
İmtihan edib neçə qullara dərdi-möhnəti,
Lütf edibən vercək ol Musaya fəthi-nüsrəti,
Dinə dəvət eyləcək, fironun artıb şirkəti,
Hamını bu cahanda xar-zar edən rəbbim cəlil.

Kimi dərviş eyləmiş, guya tənində canı yox,
Kimi yüz işrət ilən, kimin yeməyə nanı yox,
Kimləri Qarun kimi yığmış, xeyr-ehsanı yox,
Həm o dünya, həm bu dünya kimlərin ərmanı yox,
Kimlərin yerin əzabi-nar edən rəbbim cəlil.

Ey xuda, Məxdumquluya lütfi-ehsan eyləgil,
Hamı ümmət cürmünü əfvində yeksan eyləgil,
Dünya axır məqsədim sən gəl də asan eyləgil,
Kəşf edib elmi-lədunu, əhli-irfan eyləgil,
Bixəbər dillərə sir aşkar edən, rəbbim cəlil.

## ÖLMƏZDƏN QABAQ

Sağlığın qədrini bilgil, xəstə olmazdan qabaq,
Xəstəlik şükrünü qılgil, taki ölməzdən qabaq.
Düz yerin qədrini bilgil, dərya dolmazdan qabaq,
Gəmidə huşyar oturgil, girdaba gəlməzdən qabaq,
Gəncliyin qədrini bilgil, ta qocalmazdan qabaq.

Qocaldın – könlündədir yalan cahanın sevgisi,
Gözlərin gözəl görüb, səni günaha qoyğusu,
Dillərin qeybət kəsib, laf-yalan sözlər ayğısı,
Xatirin yüz min pərişan, kətxudalıq qayğısı,
Nə əcəb xoş hal idin, özünü bilməzdən qabaq.

Yaradan yadındadır, başın yalnız halda ikən,
Ötsə yüz il, yada düşməz, bəlli xoş halda ikən,
Ömrünü bihudə tutma, fürsətin əldə ikən,
Dəysə bir badi-xəzan, soldur səni güldə ikən,
Gülü yadından çıxarma, taki solmazdan qabaq.

Ağlı-huşuna yetişdin, eylədin seyranı sən,
İstər idin cəm edəm, bu külli İranı sən,
Yemədin bir dəm farağat tanrı verən nanı sən,
Hey, xəbərın varmıdır, bu cahanın mehmanı sən,
Azuqən təyyarı qıl, karvan çəkilməzdən qabaq.

Qalmamış bu köhnə dünya Rüstəm ilə Zalına,
Qürrələnmə iki günlük yeygi-içki, malına,
Həqiqət arifin gör, atlası verdi şalına,
Dur səhər, Məxdumqulu, ağla bu gün öz halına,
Sübh çağı məhşər günü tərlə utanmazdan qabaq.

## NƏZƏR EYLƏ

Tən qəfəsə giriftar, gəl, cana nəzər eylə,
Bax könül güzgüsünə, canana nəzər eylə,
İbrət gözünü açıb, cahana nəzər eylə,
İki gəmi tutmagil, bir yana nəzər eylə,
Heç kimə baha verməz, dövrana nəzər eylə,
Dövranına dayanan insana nəzər eylə,
Bu qonub-köçüb varan karvana nəzər eylə.

Bu dövran içrə könül quşları eylər pərvaz,
Guya mürği-səhərdir, şəb süxən eylər ağaz,
Bağ içrə bülbül olub, oxur nəğmə həzar saz,
Xudaya tövbə edib, dərgahına döndüm baz,
Ömür az, dövran diraz, nə rövzə var, nə namaz,
Oyan xabi-qəflətdən, həşrə bənzər fəsli-yaz,
Aləm nə tesbeh oxur, hər yana nəzər eylə.

Ölmərəm deb düşməsin, könlün bu güman içrə,
Ömrə yoxdur ixtiyar, ötücü zaman içrə,
Əcəl qoymuş ox-gəzin kirişə kaman içrə,
Bəndəyə nə ərmandır, can versə iman içrə,
Sözlə, sözün yayılsın bu yaxşı-yaman içrə,
Az ömrə ağır işlər qurubsan cahan içrə,
Mükim işini tutan mehmana nəzər eylə.

Nə xoş gündür aşığa xəlvət yara ulaşmaq,
Hal-əhvalın soruşub, qol boyuna salışmaq,
Məhşərin nəşri kimi, tən-can kimi buluşmaq,
Bir-birinə dərd töküb, sərgüzəştin qılışmaq,
Kök bağlayan riştə tək sarmaşıban-dolaşmaq,
Dostlar, nə müşkül işdir, qovuşub, ayrılışmaq,
Vüsala məğrur olma, hicrana nəzər eylə.

Məxdumqulu, sözləmə, qoymaz deməyə dərdin,
Kainatda dolanıb, altmış yana əl gərdin,
Fanini baqi bildin, yel tək əsdin, yüyürdün,
Dostuna azar verdin, düşmənə üz çevirdin,
Bildin ki, bivəfadır, bəhası yox bu yurdun,
Otuz dörd yaşa gəldin, bu cahanda nə gördün,
Qurana qulaq qoyub, fərmana nəzər eylə.

## QALMAQALI NEYLƏRƏM

Əhli-haqq olsam, deyərəm: «Özgə halı neylərəm»,
Bu sovulmaz dərdi, sansız qalmaqalı neylərəm,
Əvvəli zövqi-sürur, həsrətli malı neylərəm,
Axırı mövti-qübur, bu boş xəyalı neylərəm,
Olmuşam mən zövq əhli, əsbab-məlalı neylərəm.

Düşdü eşqin atəşinə, qılca canım yandı, yar,
Quru cismim odun edib oda yaxmaqda nə var,
Qəmdə könlüm biqərardır, başda dərdim səd həzar,
Onun üçün dəhr ara bir köşə qıldım ixtiyar,
İxtiyarım yox dürur, cəngi-cidalı neylərəm.

Görnüşün işrətnüma, görkün üçün könlüm güdaz,
Qısa – iqbalım əli, dost, daməni-vəslin – diraz,
Pür xətər, ol yol iraq, eşqin giran, qüvvətim az,
Düşmüşəm bir müşkülə, sənsən bu işə çarəsaz,
İltifatın indi qıl, ötən mahalı neylərəm.

Hər zaman, Məxdumqulu, xəlq içrə gəzmə laf edib,
Saxla qeybətdən dilin, uğrunda gəz insaf edib,
Əl atma çox fəsada, yürü, xudadan xof edib,
Sofuluq əsbabı xoşdur, gey içini saf edib,
Olsa böv-böcək içi, bu əski şalı neylərəm.

## QULUN OLDUM

Yoxdan vara gətirdin, mən onda qulun oldum,
«Ələstü bi rəbbiküm!» deyəndə qulun oldum,
İradə diyarında adəmdə qulun oldum,
Gər faniyu, gər baqi, hər yanda qulun oldum,
Müşti-xakə can verdin, bir zində qulun oldum,
Canı təndən ayırsan, bir mürdə qulun oldum,
Hər həftə, hər saətdə, hər dəmdə qulun oldum,
Hər ildəyü, hər ayda, hər gündə qulun oldum,
Gər işrət ilə yürdüm, gər qəmdə qulun oldum,
Xudaya, mən nə asi, şərməndə qulun oldum.

Bu diyari-fənada yoxdur mənim tək bədkar,
Bütün sənə əyandır, nə hacət qılam izhar,
Yaxşıdan iraq qalıb, yaman ilə oldum yar,
Varmı günah dərdinə, ya rəb, mən tək giriftar,
Bu cürm ilə gəlib mən dərgahinə, ya qaffar,
Üzüm yoxdur deməyə halimi mən şərmisar,
Sən olmasan nigahdar, kimdir mənə mədədkar,
Sənin tək qaffarım var, cahanda nə qəmim var,
Nə ürəyimdə aram, nə könlüm içrə qərar,
Xudaya, mən nə asi, şərməndə qulun oldum.

Guya ki, bir sarvanam, karvan izin itirən,
Uğrum, yönüm bilməyən, yol üstündə oturan,
Ya rəb, məni olarmı bir mənzilə yetirən,
Başım yolunda görsün bu işləri bitirən.
Mən deyiləm xocama qulluq bərcay gətirən,
Özü idi bəndəni oyadan və yatıran,
Şinavərlik bilməzəm, dərin dərya batıran,
Ya rəb, kəndir atanmı bir kənarda oturan,
Yoxmuş mən tək cahanda ömrün qafil ötürən,
Xudaya, mən nə asi, şərməndə qulun oldum.

Dünya qayğısı birlə oldu qara bağrım qan,
Axirəti unutdum, gəzdim, yüyürdüm hər yan,
Bir dərdə mübtəla mən, sinəmdə idi pünhan,
Tapılarmı soruşsam, ya rəb, bu dərdə dərman,

Bilən dəvasın etdi, hər bəndeyi-müsəlman,
Bildim, qılmaz əlacın, qırx il otursa Loğman,
Dilim varmaz diləyə, könül yüz min pərişan,
Lütf eyləgil, ya sübhan, həsrət ilə vardı can,
Bütün müşkül işlərim sən özün eylə asan,
Xudaya, mən nə asi, şərməndə qulun oldum.

Məxdumqulu, xətadan qeyri əldən iş gəlməz,
Cumdum günah çeşminə, ürək durar, coş gəlməz,
Xeyir iraq xəyaldan, şər könlümdən dış gəlməz,
Məsti-dünya olmuşam, ağıl gedər, huş gəlməz,
Qorxaram, ol dərgaha zarı qılsam, xoş gəlməz,
Bağrım elə qaimdir, öhdəsindən daş gəlməz,
Daşdan betər qatıyam, gözlərimdən yaş gəlməz,
İcabət nişanına niyaz oxum tuş gəlməz,
Xudaya, mən nə asi, şərməndə qulun oldum.

## DEDİM – DEDİM

Dedim: «Üzün tabana». Dedi: «Bənzər!» Mənli xan,
Dedim: «Qoydun ərmana». Dedi: «Könüldür viran»,
Dedim: «Ölürəm indi». Dedi: «Qalarsan aman»,
Dedim: «Ox kirpiklərin». Dedi: «Qaşlarım kaman»,
Dedim ki: «Puşeş geymiş». Dedi: «Doni-zərəfşan».

Dedim: «Üzdə xallar var». Dedi: «Ruyda güllər, hey»,
Dedim: «Qumru zəbandır». Dedi: «Şəhdi-dillər, hey»,
Dedim: «Gəl, sən xəbərləş». Dedi: «Bilər ellər, hey»,
Dedim: «Ol nə sərvdir?» Dedi: «İncə bellər, hey»,
Dedim: «Tavus bəs hardan?» Dedi: «Cayi-Hindistan».

Dedim: «Gecən qaranlıq». Dedi: «Uyğuda ayım»,
Dedim: «Kimlər yasavul?» Dedi: «Kirpiyim – yayım»,
Dedim: «Harda məskənin?» Dedi: «Laməkan cayım»,
Dedim: «Zərəfşan olar». Dedi: «Kövsərdir çayım»,
Dedim: «Ondan ver mənə!» Dedi: «İstərmiş bican».

Dedim: «Bu nə tütündür?» Dedi ki: «Qara marlar»,
Dedim: «Qorxaram ondan». Dedi: «El-oba zarlar»,
Dedim: «Sözün əslini». Dedi: «Sorar, duyarlar»,
Dedim: «Sirri faş etdin». Dedi: «Demiş əğyarlar»,
Dedim: «Ölüm var sənə». Dedi: «Sənə həm fərman».

Dedim: «Ey Məxdumqulu!» Dedi: «Gözlər yaş olar!»
Dedim: «Ol nə oğlandır?» Dedi: «Sizə baş olar»,
Dedim: «Yaxındır Kəbə». Dedi: «Köhnə daş olar»,
Dedim: «Yaxşı zamandır». Dedi: «Bu həm düş olar»,
Dedim: «İndi gedərəm». Dedi: «Getsən, var aman!»

## BİZİ

Bir eşqli su eyləyib əvvəl atada bizi,
Surət edib can verdin sonra anada bizi,
Xoşbəxt edib gəzdirdin darül-fənada bizi,
Hər işə mail etdin nəfsi-həvada bizi,
Kim bilər ki, neylərsən, darül-bəqada bizi?

Gah dünya tələb edib, həm yortaram, yelərəm,
Gah ağlar öz halıma, gah şux olub, gülərəm,
Mən bir aciz bəndəyəm, sənə ərzim qılaram,
Xudaya, qılma rüsva, kərəmindən dilərəm,
Bu dünyayi-qiyamət qoyma, uyuda bizi.

Asi olub yürürsən çox gülə-gülə bu dəm,
Əzab çəkib yatarsan yerin altında bi dəm,
Ağlayıb tənha qalsan, kim sənə ola həmdəm?
Yer sənə deyər bunu: «Eşit, ey qafil adəm!»
Qoymazlar xoş gəzməyə yalan dünyada bizi.

Tutsalar qıl körpüdə, durmasa onda daban,
Sorulan vaxt xeyrü şər, «Yəssirləna hesaban»[8],
Möminə xoş vədədir «Vəssaqahum şəraban»[9],
Desə ol vəxt kafirlər: «Yə leytəni türaban»[10],
Ya rəb, ol gün lütf edib, atmagil oda bizi.

Həqiqətin yolunu rəhbərsiz gəzmək olmaz,
Camal istəyən aşiq görmədən qızmaq olmaz,
Aşiqliyin bəlasın çəkmədən sızmaq olmaz,
Vüsala doymaq olmaz, hicrana dözmək olmaz,
Yandırma eşq oduna bundan ziyada bizi.

Gəl, könül, səbr eyləgil, bunca bir oda düşmə,
Az bilib, çox sözləyib, qəm çeşməsini içmə,
Bitap olub tökərəm, gözyaşım çeşmə-çeşmə,

---

8 «Yəssirləna hesaban»–Bizim hesab-kitabımızı göstər.
9 «Vəssaqahüm şəraban»–Onlara şərab içirdi (Quranın «Dəhr» surəsinin 21-ci ayəsi).
10 «Yə leytəni türaban»– Kaş ki torpaq olaydım (Quranın «Neba» surəsinin 40-cı ayəsi).

Yaxşı-yaman işimə, ya Birivar, qarışma,
Günahim güzəşt edib, yetir murada bizi!

Məxdumqulu, binəva, biçarə-əndəlibi,
Bir parça qəm dövranı, olmuş onun nəsibi,
Yığilsa, qılmaz çarə, ona dəhrin təbibi,
Hər məclisdə söhbətdə şad eylə biz qəribi,
Ey yaranlar, yad edin xeyrü duada bizi.

## FAYDA

Gəlsə novruz aləmə, rəng qılar cahan fayda,
Əbrlər avaz vurub, dağ qılar duman fayda,
Bicanlar cana gəlib, açarlar dəhan fayda,
Göyərməyən bitkilər göyərib rəvan fayda,
Edərlər heyvanata həm sudu ziyan fayda,
Yer üzündə yayılıb, yürürlər nihan fayda,
Vabəstə dəhan quşlar qılarlar zəban fayda.

Çöl tərəfın bərk edib, dər açar suya xərçəng,
Zəmin səbzəvar olub, tənindən ayrılar zəng,
Cünbəndələr məst olub, sanki içmiş araq, bəng,
Hər əşyanın özünə öz avazı olar dəng,
Səbzə içrə sanduvaç yüz dildə qılar ahəng,
Zəmin xızırpuş olub, gül bitirmiş rəngbərəng,
Xüruca gəlib aləm, qılarlar fəğan fayda.

Sürudi-səda birlə cahan üzü abaddır,
Olma süruda məğrur, peymanəsi bərbaddır,
Haq eşqində zində can, bilin, baqi həyatdır,
Hər təndə eşq olmasa, ruzi-əzəl məmatdır,
Yaz ötüncə yerü göy gündən-günə ziyaddır,
Bir həşri-qiyamətdir, bir yövmi-ərasatdır,
Dəhr içrə olar hər dəm cahan içrə can fayda.

Zərbaba zövqün olma, bəqa yoxdur dövlətdə,
Ömrünü bada vermə, sən bu darül-möhnətdə,
Yetər sənə tez, ya gec, nə yazılsa qismətdə,
Canına cəfa edib, bunca gəzmə həsrətdə,
Səvab yaxşı amalda, ya cud yaxşı niyyətdə,
Aləm bütün xidmətdə, adəm yatıb qəflətdə,
Hasilin atəş olar, eyləsən yaman fayda.

Məxdumqulu, ağlaram bu bəxti-siyahımdan,
Qorxaram can afəti əl-ayaq güvahımdan,
Ümidim hasil olmaz bu ömri-təbahımdan,
Can yandı cəsəd içrə bu atəşi-ahımdan,
Əlim açıb dilərəm hacətim Allahımdan,
Bəndəyəm, ümidim çox ol kərəmli şahımdan,
Eyləyər ərasatda gül kimi iman fayda.

## NİŞAN

Tapdı şöhrət xəlq içində bu cəhalətdən nişan,
Qaldı dərvişlər dilində dağü həsrətdən nişan,
Qalmadı məzlumlara dəsti-nüsrətdən nişan,
Sərbəsər doldu cahana bu bəd afətdən nişan,
Dəydi aləm əhlinə yüz min xəcalətdən nişan,
Ər bilərlər kimdə olsa ol şərarətdən nişan,
Yada salmaz xeyir işi tapan zəlalətdən nişan,
Nə mürüvvətdən əsər var, nə ədalətdən nişan,
Şək deyildir, dostlarım, gəldi qiyamətdən nişan.

Hər kişi bidətə batır, onu ki ər bildilər,
Məhşərə münkir olub, yox dünyanı var bildilər,
Şər işin bəd anlayib, bəd işi xub kar bildilər,
Rastları xain bilıb, xainləri yar bildilər,
Tamuya kani deyib, kaniləri zar bildilər,
Kim şəriət əhli olsa, həcv edib, xar bildilər,
Münkirü mürşüd bilib, yalanı iqrar bildilər,
Gümrahı təqva sanıb, təqvanı inkar bildilər,
Şək deyildir, dostlarım, gəldi qiyamətdən nişan.

Hörmət əhli oldu ol kimin əlində sazıdır,
Kim kəlam oxusa, xəlq yanında xar avazıdır,
Virdləri dərvişlərin xəlvətdə xəlq ənbazıdır,
Ortada qızü cüvan, dersən ki toydur, bazıdır,
Sıçraşar qızü gəlin üstünə, guya  tazıdır,
Həqq işindən bixəbər xəlq içrə bəzi qazıdır,
Tabei cindir onun, həqqən ki, şeytan özüdür,
Cəhənnəm  tıxacıdır, hər kim bu işə razıdır,
Şək deyildir, dostlarım, gəldi qiyamətdən nişan.

Tanrı, peyğəmbər sözündən bixəbərdir bu pirlər,
Fasiqi qazı bilib, zalıma naib derlər,
Hər kişi əvvəl gəlib görsə ki, rüşvət verlər,
Bağlayıb böhtan ilə fəqr əhlinə təqsirlər,
Əmmamə qor başına ac böri, sofu-pirlər,
Eyləyib xəlq üstünə çox hileyi-təzvirlər,
Gər halalü, gər haram tapsa tıxarlar, yerlər,

Ruzi-məhşər həqq-rəsula nə cəvabın verlər,
Şək deyildir, dostlarım gəldi qiyamətdən nişan.

Az eylə, Məxdumqulu, söz birlə dərdin hər zaman,
Nə üçün zalıma növbə verdi bu dövri-zaman,
Onunçün göz görən–eşidəndən ötə keçdi güman,
Eyləyib bir-birinə dəvayi-batili həman,
Bir şahılıq mal üçün dəqiq verər əldən iman,
Özünü ər saydırar, kim artıq iş etsə yaman,
Çün nahaqdan kişi yüz şövq edər tökməyə qan,
Gücü yetsə gürbänin, qaplana heç verməz aman,
Şək deyildir, dostlarım, gəldi qiyamətdən nişan.

## DÖNDÜ DÖVR YAMANA

Ey aşiqlər, ağlaram, gəldi, keçdi zamana,
Yaxşı qədri bilinməz, döndü dövr yamana,
Yaman aldı cahanı, dönməz dili imana,
Çox fəqirlər ağlaşıb, gələr ondan amana,
İstəyi var az vaxtdan dərhəm ola zamana.

Nə səfalı gün imiş tay-tuş ilə baş qoşman,
Alıb getdin başını, nə dost bildin, nə düşman,
Ey yaranlar, xeyri yox, indi olsan min peşman,
Dünyasına dolaşman, oğul-qıza bulaşman,
Nə hüzurlu gün olar olub getsək divana.

Düşməyin xam xəyala: dəhrə gələn ölməzlər,
Gələn keçər dünyadan, biri aman qalmazlar,
Canlar çəkib çağırsam, doğru yola gəlməzlər,
Hər nə olsa udarlar, halal, haram bilməzlər,
Derlər: haqdır Məhəmməd, əməl etməz Qurana!.

Dövran, necə dövransan, qərib ağlar, el dinməz,
Zülmü artar zalımın, heç könlünə rəhm enməz.
Cahanı yaxdı getdi, yamanın odu sönməz,
Bir Məhəmməd xətrinə yer yarılmaz, göy enməz,
Çərx güvənir bu işə, olmaz axır zamana.

Qafil qaldım, yaranlar, öz-özümdən riştim yox,
Haqdan qeyri heç yerdə pənahım yox, puştum yox,
Fikir bəhrinə girdim, yelkənim yox, kiştim yox,
Məxdumqulu, mən burdan hara çıxım, dəştim yox,
Əlim versəm tutan yox, düşdüm dibsüz ümmana.

## DİDAR VAR

Bəndə olan haqq əmrin tut, tutmasan cabbar var,
Düz gedən bəndələrə yaxşılıq ü didar var,
Kim yamanlıq eyləsə, həm bilgici qaffar var,
Qılı qırx ayırmağa Münkər-Nikir təyyar var,
Burda bir azar versən, orda min bir azar var.

İki aləm yaradan qadiri-qaffar, əhəd,
Bir adın qulhuvAllah, biri Allahüs-səməd,
Dur səhər, yad et xudanı, ertə durmaq qıl adət,
Asi ümmətlərə vergil, ya Məhəmməd, sən mədəd,
Əzrayıldır, Cəbrayıldır, cəllad, həm səttar var.

Bəllisi Dəccal çıxar, budur qiyamətdən nişan,
Kimsələr gəldi, yüyürdü  kimin oldu bağrı qan,
Ol xudanın əmrindən həm bixəbər bəndəsi kan,
Binamaznın həmdəmidir ol ilan birlə çayan,
Uzaq yollar, böyük dağlar, onda susuz çöllər var.

Ol peyğəmbər yeddi duzəxdən atasın almadı,
Padişahlarda adillik, yurdda rastlıq qalmadı,
Namazxon alimi Allah duzəx içrə salmadı,
Binamaz bəndələri ol cənnət içrə girmədi,
Qıldan incə, qılıncdan iti, onda neçə yollar var.

Neçələr rəydə-fikirdə, neçələr iman tələb,
Neçələr dünyasına məğrurdur, ağılsız cələb,
Binamazı min güzərlərdən çağırarlar gəlib,
Ol müvəkkillər külünü sovurarlar ələyib,
Binamaz bəndələrə onda zəqqum sular var.

Binamazın ağzından həm qan ilə irin axar,
Həm ilanlar toplaşıb, qurdlar ilə murlar soxar,
Arxadan gəlsə müvəkkil, cayıdır duzəx saqar,
Binamazlar çar tərəfə fırlanıb hər yan baxar,
Binamaz bəndələrə oddan libas-donlar var.

Binamaz çəkən əzaba dağ ilə daşlar ərir,
Binamazlar su diləsə, su yerinə zəhər verir,
Arxadan gəlsə müvəkkil, duzəxə caynaq gəlir,
Binamaz, birövzələrin halı onda bilinir,
Binamaz bəndələrə onda irin, zəhər var.

Əl-ayağın bağlayıb, buzdan sənə kəfən biçər,
Binamaz bəndələr onda varıb zəhər içər,
Kimsə gər bifərzənd isə, öldü, onun şəmi sönər,
Min əzabdır başlarında, neçələr hər yan keçər,
Binamaz bəndələrə qəzəb bilən qəhər var.

Ol xudanın qüdrətin gör, yeddi duzəx var imiş,
Binamazlar dad edər: «Allah, xudayım bu nə iş»,
Namazxan bəndələrə müyəssərdir səkkiz behişt,
Huri-qılmanlar qaşında, aşıdır nurdan yemiş,
Namazxan bəndələrə səkkiz behişt təyyar var.

Sözləsəm, Məxdumqulu, sözüm əcaib dür olar,
Ol xuda əmrində düz bəndə behiştdə gül olar,
Rast yürüyən bəndələr ərş üstündə bülbül olar,
Binamaz-fasiq xudanın altında münkir olar,
Odlu gürzü, odlu kösöv, onda iki əyyar var.

## ƏYLƏNMƏZ

Aşiqlər, seyr eyləyin, aləm-cahan əylənməz,
Bülbüllər, nəğmə bağlar, bağda reyhan əylənməz.
Qafil qalma, adəmzad, beş gün dövran əylənməz,
Yer, güvənmə dənizə, dərya-pürxan əylənməz.
Ötün, tuti, qumrular, sizdə zəban əylənməz,
Məclis qurun, igidlər, bədəv-məstan əylənməz.
Ey qocaman böyük dağ, sizdə duman əylənməz,
Hökm yürüdən şahlar, əldə fərman əylənməz.
Ötər bircə-bircədən, yaxşı-yaman əylənməz,
İnanmazlar kitaba, əldə Quran əylənməz.
Deyər Fəraqi zar-zar, bizdə iman əylənməz.

## CAN EYLƏDİ

Ey yaranlar, eşqə düşdüm, ürəyim qan eylədi,
Gündə yüz vəxt can alıb, hər gündə yüz can eylədi,
Taci-təxti-bəxtimi, mülkümü viran eylədi,
Mərdləri pünhan qılıb, namərdə dövran eylədi,
Ayırıb qardaş, atadan, könlümdə ərman eylədi.

Dillərim lal oldu mənim, əl ilə söz olaram,
Kar oldular guşlərim, düşməyin, zar qalaram,
Gəldi firqət at salıb, açılmaz gül, solaram,
Gündə yüz min yalvarıb, qaşa taət qılaram,
İki didəm zari-giryan, seli-rəvan eylədi.

Hər kəs görüb halım mənim, zari-giryan ağlayır,
Hər gecələr «hu» çəkərəm, mahi-taban ağlayır,
Dərdimə bir çarə tapmaz, gəlib Loğman ağlayır,
Mali-mülküm oldu viran, gör, Süleyman ağlayır,
Yeni başdan qəhbə fələk dünyanı zindan eylədi.

Görsə bu zəbun halımı badi-səba dan-səhər
Əsməyir ol fani-cahan işinə qılıb qəhər,
Fəslimiz qış içrə qaldı, yad olubdur ol bahar,
Geyimimdir kəfən mənim, yediyim oldu zəhər,
Şad olubdur ol fələk, hər gündə seyran eylədi.

Duzəx görüb bu narım, behişt olubdur ol zaman,
Yaxşılar yerinə yiyə olub qalandır yaman,
Həmra olub gedən ellər varisidir, bil, ərman,
Bu nə lənət yeridir, bəs, nə külfət oldu zaman,
Qaib olan ol ərənlər özün qurban eylədi.

Dövrə-başım sel alıbdır, qalmışam yalnız mənəm,
Pədərim Azadi ötdü, qalmadı Kəbəm - anam.
Mat olubdur, oxumaz, bağ içrə yesirdir sənəm,
İbrahim tək nar içrə mərdi-mərdan sərmənəm,
Bizləri oda atıb, gör, narı reyhan eylədi.

Məxdumqulu, bu sözümü elə aşkar qılsanız,
Bir nəsihət verərəm mən, gər ki qulaq salsanız,
Budur nəsihətim mənim, fikr eyləyib alsanız,
Qılmayın bu sırri aşkar, bizə həmra olsanız,
Ol Süleyman taxta çıxıb, bunu fərman eylədi.

## BAZAR EYLƏDİ

Bu fələk xəndan qılıb, yaxşı-yaman yar eylədi,
Hər kimi bir köyə salıb, aləmi bazar eylədi,
Miskin edib bayları bir mala zar eylədi,
Mərdləri qüssə bilən namərdlərə yar eylədi,
Maral enən gözəl çaynı culvarsa güzər eylədi.

Qaşında rəqs qılıb, aləmni viran qıldı ol,
Dağları yeksan edib, zəmini lərzan qıldı ol,
Buzaxor namərdləri elə şah-xan qıldı ol,
Mərdləri yesir alıb, varın pünhan qıldı ol,
Təvab edib, tora salıb, cahanı nar eylədi.

Qafil edib möminləri, saldı girdab qəhrinə,
Əksər edib mərd əhlini, sardı fələk çərxinə,
Sahibcamal məşuqları vurdu gəlməz fərqinə,
Üç yüz altmış qaib ərənləri basdı bağrına,
Yalnız qalan zəmin içrə tikanı ənar eylədi.

İmtiyazı yox onun, qıldı viran hamısın,
Sud istəyib aldı ol bu dünya amü xasın,
Girib adam surətinə, tutdu şeytan vəsvəsin,
Xar eyləyib verdi zağa əndəlib gül dəstəsin,
Bağ içində bağbanlara onca açar eylədi.

Asman üzrə taxtı uçan Süleymanı neylədin,
Bütün əhlinin əmini ol Loğmanı neylədin,
İsa, Mehdi, Yaqub, Əyyub, Veysəl Qarani neylədin,
Şahi-mərdan, ol Məhəmməd Mürtəzanı neylədin,
Tora salıb, varını ləhəddə yesir eylədi.

Kimsə uçdı, kimsə qondu, kimsələr pa altında,
Pərvaz qıldı oyunlar şəhidlərin üstündə,
Qardaş olub yürür oldu, amma ki can qəsdində,
Onca canlar oldu yesir biəlac, gör, dəstində,
Gündə qalıb, onca nahaq qana nəzər eylədi.

Məxdumqulu, sözlədin sən bu fələyin karını,
Xakistər qıla bilməz, qaldın onun narını,
Qocaldıqca çəkər oldun dünyanın azarını,
Qılmayan birini pünhan, aşkar etdin varını,
Söyləməyim, neyləyim, ol biqərar eylədi.

## İSFAHANDA TAPILMAZ

Ey, sənin tək gül pəri cümlə cahanda tapılmaz,
Qaşlarına bənzəyən yay İsfahanda tapılmaz,
Ləblərinin ləzzəti bir dəhanda tapılmaz,
Üzlərin halı tək hal mahi-tabanda tapılmaz,
Gül ruyinin camalı zənəxdanda tapılmaz.

Gül ruyinə çəkib niqab, yandırdın, zalim pəri,
Görmədim sən tək gözəli yortub qılman-bəşəri,
Neylək, eşqin əzm urub qoydu çıxmaz əsəri,
Siyah zülfün dalğalı, bəlkə ümman ləngəri,
Nili-Qülzüm axtarıb, bir ümmanda tapılmaz.

Bu fələyin çərxini sən urub, viran eylədin,
Dərdlilərə zülfünün tarını dərman eylədin,
Ölüləri dirildib varına sən can eylədin,
İstəyib olsun behişt, duzəxə fərman eylədin,
Böylə ədalətli fərman şahü xanda tapılmaz.

Gözəlləri yığnayıb, gündə qıldın söhbəti,
Məşhuri-aləm olubdur şahlara yar şövkəti,
Urdu fələk, qıldı viran, gör əcaib dövləti,
Dua verib ol Birivar, ərən versin hümməti,
Gəşt eyləsən, böylə sultan bu cahanda tapılmaz.

Bu fələyin qəhri yaman, çıxar qəzəb taxtına,
Eyləyib taleyi şor, qüssə qatarmış baxtına,
Adəm oğlu olsa handa düçar gələr səyyadına,
Bir-birini həcv edibən göz tutar züryadına,
Böylə binamus fələk bir həngamda tapılmaz.

Məxdumqulu, indi hər dəm tanı dostu, yarını,
Biağıl, nadan olub salma fələyə zorunu,
Sərxoş olgil, səyrəgil, möhkəm çəki zünnarını,
İstəsələr müştaq olub, söyləgil bal göftarını,
Sənin kimi balü şəkər bir zəbanda tapılmaz.

## SÜLEYMAN NEYLƏSİN

Can şəhrinə düşdü talan, bu yalnız can neyləsin,
Ötdü ömrü bibərmandır, ol Süleyman neyləsin,
Haqqın verən bu dərdinə, deyin, Loğman neyləsin,
Ötüb varan ömrümə ağı, giryan neyləsin,
Eşq odundan kül olmuşam, duzəx-suzan neyləsin.

Səyyad olub girdi fələk, harda can pünhan qılaq,
Kimlərə dərdimi deyib, kimlərə həmrah olaq,
Kimlər ilən döyüş qılıb, kimlərə qılınc salaq,
Dərdim aşkar qıla bilməm, el-günümdən utanaq,
Mənim kimi avaraya fələk, zindan neyləsin.

Qaibana aşiq olub, eşqi bilən yanaram,
Deyələr dövlət mürğü, mən hicrana qonaram,
Leyli yarım olmasa da, özüm Məcnun sanaram,
Gündə bir vəqt nalə edib, eşqi-meydan qanaram,
Mənim kimi bir sərxoşu ulu sübhan neyləsin.

Şanına dastan düzmüşəm eşqinin məkanında,
Külli aşiq sərgərdandır ol atəş heyranında,
Mən kimi bir Məcnunu görməz fani eyvanında,
Mən kimi bir miskin gəda yoxdur Nuh zamanında,
Eşq atəşinə gədayam, dövləti-kan neyləsin.

Söyləyər Məxdumqulu, eyib görməz, ellərim,
Könlüm rayinə baxmaz, yaman çaşıb dillərim,
Qocalığın fəsli ilən nuna dönmüş bellərim,
Bülbülləri yesir gəlmiş bağ içində güllərim,
Gər ki xilas eyləməsəm, fəqir bağban neyləsin.

## TAPILMAZ

Yar, sənin tək gül pəri cümlə-cahanda tapılmaz,
Zülfün ətri tək ənbər baği-reyhanda tapılmaz,
Şirin göftar kəlamın kitap, Quranda tapılmaz,
İncidir dəndanların heç bir dəhanda tapılmaz,
Qızıl təxti-eyvanın ol Süleymanda tapılmaz,
Ruyin üzrə hindi xallar Hindistanda tapılmaz,
Sənin kimi aypəri Rum, Əfqanda tapılmaz,
İran, Çin-Maçini gəzsəm, Türküstanda tapılmaz,
Gülçöhrədən ətirlərn bu zəmində tapılmaz,
Boynun ətrafında mərcan ol Qarunda tapılmaz,
Qaşlarının siratı heç bir kamanda tapılmaz,
Qollarında şayların gənci-nihanda tapılmaz,
Sənin kimi adil şah, xanü sultanda tapılmaz,
Dəhanından çıxan səba Dehistanda tapılmaz,
Yeyər olsan nazü nemət dəstərxanda tapılmaz,
Göftarındır bülbül zəban, bu süxəndə tapılmaz,
Təxti-ərkan bəzəyin gənci-kanda tapılmaz,
Mən kimi bir zavallı halı zəbunda tapılmaz.

Qoynun içrə bitən ənar bağ-bostanda tapılmaz,
Sənin kimi aypəri laməkanda tapılmaz,
Siyah zülfi-sünbülün Zərəfşanda tapılmaz,
Xəncərdir, yar, müjganın, çox müjganda tapılmaz,
Mənim kimi eşqə yanan var pərvanda tapılmaz,
Mənim kimi bir binəva bir hicranda tapılmaz,
Könlüm kimin bir cövlan yazi-güyunda tapılmaz,
Kakillərin xan qılar sərvi-xuramanda tapılmaz,
Mey-məsti heyran qılan əncüməndə tapılmaz,
Taqət edib oturan darül-amanda tapılmaz,
Eşq atəşdən yara alan natəvanda tapılmaz,
Neyləyim, eşqin yaxar, duzəx-suzanda tapılmaz,
Abi-kövsər suyun içən cavidanda tapılmaz,
Nə şirindir sözlərin, heç bir zəbanda tapılmaz,
Mənim kimi viran olan axır zamanda tapılmaz,
Səndən gözəli gözləsəm, bir insanda tapılmaz,
Ah, neyləyim, ol ənbərin güldə-reyhanda tapılmaz,
Dərdli cana sən dərmansan, bir dərmanda tapılmaz.

Qış fəslimdə gələn leysan, bahar leysanda tapılmaz,
Ömrüm çəkən cəfası ol hicran-xəzanda tapılmaz,
Bu dərdimin bir dərmanı, vah, Loğmanda tapılmaz,
Bulğar, Çin-Maçini gəzsəm, İsfahanda tapılmaz,
Neylək, könül bənd olubdur  bir pünhanda tapılmaz,
Gül ruyin tək əcəb camal heç əlvanda tapılmaz,
Məxdumqulu, sən tək göftar heyvan-insanda tapılmaz.

## İSTƏMƏM

Gül yüzünə pərvanəyəm, qeyri reyhan istəməm,
Baxıban mehrindən doydum, baği-bostan istəməm
Ruyin olar şəmsi-qəmər, ol mahi-taban istəməm,
Baxışın, şah qıldı, bil ki, zövqi-dövran istəməm,
Zülfünə bənd eylədin dost, qeyri zindan istəməm.

Zülfü siyah, dostum ey, hasili-sevda can ilən,
Çağırdı cəlladlarını, qorxar bilibdir qan ilən,
Dedim: «Ey, qan neyləsin, qılma həmra hicran ilən»,
Eylədim pünhanım əyan, qovdu ol fərman ilən,
Dedim: «Dost gördüm üzünü, bil ki, ərman istəməm».

Can verib qəm eşqinə, Məcnun oluban gəzərəm,
Tənim dəftər, əlim qələm, əcəb vəsfin yazaram,
Görməyib kənarını, eşq xəzan içrə üzərəm,
Simnar olub sən üçün, qızıl köşklər düzərəm,
Qeyri ədalətli hakim, xanü sultan istəməm.

Keyvanı gələr huşuma, baxsam ki qara gözlərə,
Mərrix məni bənd eyləyir, gözləsəm, dost üzlərə,
Müştəri qafil otırmış, bənd olub, bil, sözlərə,
Zöhrə, Nazpəri, Humay, Dursuti heyran sizlərə,
Böylə ədalətli şahsan, Qızıl Arslan istəməm.

Şah olub, fərman verib sən, bildim «Həft peykərə»,
Bəhram Gur taxt unudub, ərz edibdir İskəndərə,
Tuğ götürüb qıldın savaş, əl urub sən şəmşirə,
Bu qədər zülüm olarmı, qara gözlü dilbəra,
Qorxaram mən qamətindən, cövza-kaman istəməm.

Çıxdı Zübeydə alnımdan, ah neylək, bəxtim qara,
Əlim bağlı zülfünə, tapşırarlar əjdərə,
Əjdər çəkər kamına, zalim olubsan, dilbəra,
Zülüm qılma, yaraşmaz sən kimi peyğəmbərə,
Saldın, ey, çıxmaz dərdə, indi dərmani istəməm.

İsmim olar ki, Fəraqi, yas tutarmış ellərim,
Sözlərin xoş vəqt olub, lal oldu, dost dillərim,
Girdin, ey, sən seyr edib, bağda qurban güllərim,
Bənd olub göz yaşıma, neylək ki, axmaz sellərim,
Qoynun içrə bitmiş bostan, mən laməkan istəməm.

## EY PƏRİ

Məskəni Məkkə, Mədinə, səkkiz cənnət laləsi,
Hər sözün izində yüz min qumru, bülbül naləsi.
Şamcıraqdır aləmə ol gül üzünün şöləsi,
Qəddi-qaməti büənd, ey nuri-haqqın balası,
Seyr edən doqquz fələk asmanı sənsən, ey pəri.

Məkkədən gəşt eylədin şəhri vilayət-kanə sən,
Rəfrəfil-Kufə, Tarı, Bəsrə, Hələb, Şirvana sən,
Həm Misir, həm Qeysərü Şirazla İsfahana sən,
Xeybərü Herat ilə, Ləkləhəri, Səkvana sən,
Rəhbəri, bu aləmin sultanı sənsən, ey pəri.

Möciz ilə Salihin daşdan çıxıbdır mayəsi,
Nuh tufanında yalnız qaldı Nuhun dayəsi,
Ya Məhəmməd Əhmədim, ya dini-islam payəsi,
Gəldilər iqrar edib ol şiri-Düldül yiyəsi,
Bəxş edən Düldül ilə kamkamı sənsən, ey pəri.

Şəhri-Fərxar, gürsi-Tiflis, Rum, Bağdad, Süfliyan,
Yəzd, Kirman, Şamü Mosul başda olardı Bağıyan,
Arxası Krım, Xıtay, qıpçaq, Firəngi, Cəmiyan,
Şərq, Qərb, Hindü Sind, Dəkəndir dövri-cahan,
Dörd təriqin cəm olan ümmanı sənsən, ey pəri.

Peyrəvində kafi-Şaqşaq, dövsarayi-Luvluvi,
Ol aşağı Gavqaladır, arxası od məhfəli,
Yuxarısı Şəhrizənan, Qatnaq, Saraydır ol beli,
Söyləyər Məxdumqulu, sənsən cahanın can gülü,
Dinə salan Pars ilə İranı sənsən, ey pəri.

## BİLMƏZMİN

Qələm alıb naməni göndərdiyim bilməzmin?
Əfsun edib hüthütü endirdiyim bilməzmin?
Ərş üstünə qaldırıb, mindirdiyim bilməzmin?
Dörd gecə, üç gün ağlar, dindirdiyim bilməzmin?
Eşşək minüb İsa tək, yeldirdiyim bilməzmin?

Məcnun kimi səhrada ağlar-ağlar gəzdiyim,
Vərqa kimin Qulşadan ölüb, ümid üzdüyüm,
Coşğun verib eşq odu, qaynar-qaynar qızdığım,
Gözüm yaşın mərcan tək düzüm-düzüm düzdüyüm,
Şibli kimin bir dağı yandırdığım bilməzmin?

Hophop kimin Firəngdən Çin-Maçinə vardığım,
Bağ içində Bilqeysin saçın açıb gördüyüm,
Süleymanın taxtından sözlə xəbər verdiyim,
Quş qonsun deyə başma bülbül hinin qurduğum,
Çərşənbə gün çeşt vaxtı qondurduğum bilməzmin?

Sürahın arxasında Məcnun qurdu cadını,
«Bismillah»la başladı, çağırdı ustadını.
Haqdan qeyri bir kimsə eşitmədi dadını,
Qırx aşiq nərə çəkib şölə vurdu odunu,
Göz yaşımdan su alıb söndürdüyüm bilməzmin?

Şirvan xanın sevdası nə əcaib sevdadır,
Qıldan bu yan ağdırsa, məşhər günü rüsvadır,
Yüz yirmi səf qurulub, hər səfdə min qovğadır,
Aşiqlik bir coşğunlıq, axmaz durğun dəryadır,
Bir cürədən qırx aşiq qandırdığım bilməzmin?

Yetişməmiş şunqarım, qamış qanad ağ türfək,
Bir yanım etdi şikəst, dünya məni yıxaraq,
Fələk  qisasın alar, çəkər qan, qoymaz torpaq,
Hər tikandan yüz qüssə, hər qırx güldən bir yarpaq,
Daği-daşı ələyib topladığım bilməzmin?

Məxdumqulu söyləyər, doqquz fələk Zöhrəsi,
Yeddi ulduz qardaşı, ayın, günün parası,
Nuri-didəmin nuru, ağ gözümün qarası,
Abi-zəmzəm çeşməsi, Səfa, Mərvə arası,
Süleyman tək əhdimi sındırdığım bilməzmin?

## BULUDA APARDI MƏNİ

Eşq ürəyimdə qaynar, yandırdı dərdi məni,
Tütünüm badə verib, əbrə apardı məni,
Fələk biləyim sıxıb, çarxına sardı məni,
Xiridar gözü birlə kim gəlib gördü məni,
Hicran yağmuru yağıb, qəm selə verdi məni.

Qəm seli birlə gedib, eşq ölkəsinə varıb,
Xəyalım fikrə dolub, ağlımı yel aparıb,
Ol heyrət meydanında mən qərib qaldım arif,
Eşq xəncərin çəkibən, hicran ürəyim yarıb,
Aləmə dastan edib, aftaba sərdi məni.

Nə cəsəd içrə can var, nə qüvvət qaldı təndə,
Həm sərgəştə, həm heyran, bu işə qaldım bəndə,
Nə xəstəyəm, nə bimar, nə mürdəyəm, nə zində,
Qəm hücum edib göydən, zəmin sarı enəndə,
Fələk əlimdən tutub, həvalə verdi məni.

Bir əhvala tuş oldum, qəm hücm etdi, öldürdü ,
Bu işin səriştəsin eşq oxudub bildirdi,
Vüsala rəhmi gəlib, əlim tutub qaldırdı,
Camal bir cilvə verdi, içim şövqə doldurdu,
Sözləməyim, neyləyim, yaranlar, yardı məni.

Məxdumqulu, bəyliyim yar camalı qul etdi,
Vüsal ümidin verib, min dilli bülbül etdi,
Ayrılıq oda saldı, fəraq durdu, yel etdi,
Eşq çəkdi zəbanəsin, yaxıb-yıxıb kül etdi,
Hicran − fəraqçı alıb, yelə sovurdu məni.

## BÜRYANƏ OLDUM İNDİ

Eşq atəşinə düşdüm, pərvanə oldum indi,
Şövqün közünə yandım, büryanə oldum indi,
Cismim kababa döndü, giryanə oldum indi,
Gənc istəyənlər gəlsin, viranə oldum indi,
Ayrıldım əğyarlardan, biganə oldum indi.

Çıxardım başdan indi dünya həvəsin mütləq,
Nə fərşə ayaq basdın, dolan, bir özünə bax,
Kül ol, külünə sovrul, ol güdaza canın yax,
Lazım oldu oxumaq «ənəl-həqqü» «minəl-həqq»,
Mey içib meyxanadan, məstanə oldum indi.

Dünya məndən həzz etməz, mən həm bəhrə almazam,
Odum gurdur, dərdim çox, xoşbəxt olub gülməzəm,
Ağır baha aləmi altı cövə almazam,
Dost hansı, düşmən hansı, fərqin edib bilməzəm,
Heç kimsə anmaz halim, əyanə oldum indi.

Bir məqama tuş oldum, fikr onda fikrə batdı,
Can onda candan oldu – huşundan gedib yatdı,
Cəsəd yolda yox oldu, könül özün unutdu,
Eşq qoşun yığıb gəlib, əql mülkün dağıtdı,
Talana verib ağlım, divanə oldum indi.

Məxdumqulu, hər zaman neyləyim olma giryan,
Fikir palçığna batdım, çıxa bilmən mən bir yan,
Gövdə xarab, tən türab, könlümün şəhri viran,
Can, cəsəd, dil, ağıldan ayrılıb, qaldım üryan,
İş gəldi, başa düşdü, divanə oldum indi.

## EDƏN KƏRİM

On səkkiz min aləmi bir dəmdə var edən kərim,
Yeddi mərtəbə fələyi bərqərar edən kərim,
Bəndələrə rəhmətin hər dəm nisar edən kərim,
Ol məlaikləri göydə bişümar edən kərim,
Qüdrətin iki cahanda aşikar edən kərim.

Kimləri gümrah qılıb, verdi ona rahi-zəlal,
Kimləri mömin qılıb, özün tanıtdı bimisal,
Hər kimi bir köyə saldı ol kərimü layəzal,
Neçələr taqət ilə ömrün ötürdü mahü sal,
Neçələri məsiyyətdə şərmisar edən kərim.

Ənbiyalar əfzəli ol Mustafa xeyrül-bəşər,
Həm məlaiklər görüb, qıldı başına taci-sər,
«Ya şafıqül-müznibin» deyə yad edərəm hər səhər,
Qüdrətindən ol Məsihanı yaratdı bipədər,
Odu İbrahim Xəlilə laləzar edən kərim.

Kimlərə verdi xudayım eyşü işrət bihesab,
Kimilər həsrət ilə nan tapmayıb, bağrı kəbab,
Kimlərə rahət əta gıldı, kimə verdi əzab,
Dünya bir karvansaraydır, ötdü burdan şeyxü şab,
Hər kimə təqdiri-qismət ruzigar edən kərim.

Kimləri şah eyləyib, verdi mürəstə tac ona,
Kimləri fəqrü fənada eylədi möhtac ona,
Neçələrə verdi dövlət, neçələr qəllac ona,
Dostum deyib lütf qıldı leylətül-merac ona,
Mustafanın dostlarını çarıyar edən kərim.

Əvvəla, iki cahanı var edən qadir xuda,
Neçə qullar həq yolunda eylədi canın fəda,
Neçələr fisqi-fəsada qıldılar ömrün əda,
Dünyaya gələn gedər bayü fəqir, şahü gəda,
Hamı qulu şum ölüm əlində zar edən kərim.

Məqsədin, Məxdumqulu, sən həq-təaladan dilə,
Qafil olma gecə-gündüz ol xuda zikri ilə,
Biz tək asi qullara, şayəd, xuda rəhmət qıla,
Ömrünü zaye keçirmə, hasilin vermə yelə,
Bil, hamının yerini axır məzar edən kərim.

## CANLAR ONDADIR

Yaranlar, qafil olmayın, cani-canlar ondadır,
Abi-zəhər, şəhdi-şəkər türfə ballar ondadır,
Ol yavuz məhşər, müsəllət, qalmaqallar ondadır,
Ol yavuz ah-u nədamət, qeylü qallar ondadır,
Türfə bəylər, türfə xanlar, türfə ellər ondadır.

Hər kim zülm eyləsə, həq duzəxin odun saçar,
Hər kimə lütf eyləsə, cürmü günahından keçər,
Qıl-siratdan asi qullar bir qədəm yoldan keçər,
Kimi beş il, kimi on il, kimi yüz ildə keçər,
Böyük dağlar, uzaq yollar, susuz çöllər ondadır.

Hər kim öz halına ağlar, nə ata oğla baxar,
Kükrəyir, həm titrəyir qəhr-qəzəb ilə saxar,
Çox ilanlar toplaşıb, buğra sifət bövlər soxar,
Ruzə tutmaz bəndələri həq cəhənnəmdə yaxar,
Surəti-xınzırsifət nəqşi bədənlər ondadır.

Tanla ol tövfiqli qullar mürşidinə daldadır,
Hər kişi ehsan edər, ehsanı onun aldadır,
Kimi şadda, kimi odda, hər kişi bir haldadır,
Mali-dünya fayda verməz, hiyləgərdir, aldadır,
Ol yəhərlənmiş Buraqlar, hüllə donlar ondadır.

Rusiyah Məxdumqulu, saqi əcəl içsən gərək,
Xanimanın, mali-mülkün, varından keçsən gərək,
Neçə qeybət, neçə yalan sözləri açsan gərək,
Hazırlaş, qıl körpüdən zaviyə uçsan gərək,
Ol qılıncdan iti, qıldan incə yollar ondadır.

## BÖYLƏ

Dünya oyun, adəmzad, oldun avara böylə,
Böyük yerdən yıxılan olar səd para böylə,
Burda pünhan işlərin, onda aşkara böylə,
Bu dünya, bu zəmanə döndü küffara böylə,
Dindən çıxıb, rəqs edib, əzmi-cabbara böylə.

Bu dünyanın ötərin bilməz desəm bilərlər,
Məğrur olub dünyaya, oynayarlar, gülərlər,
Şəriəti dışlayıb, şərə qulaq verərlər,
Üqba işin unudub, dünya işin qılarlar,
Haram yeyib, gurlaşıb, dönərlər şirə böylə.

Səhər oyan, ey qafil, yad et, xuda birlə ol,
Başın satıb dünyada, qərib-miskin könlün al,
Dirilər murdar oldu, ölənlərdən ibrət al,
Tən idin, torpaq oldun, qəbristana nəzər qıl,
İnanmagil sağlığa, xəstə-biçarə böylə.

Dünya iki qafili əcəb karvansaraydır,
Gələn keçib əylənməz, yük yazdırıb varaydır,
Düşərsiniz girdaba hər kim burda heyrandır,
Sabah sənin halını məhşər xalqı görəndir,
Onda halın dad ilə salsalar narə böylə.

Baylar ilən baş qoşub, fəqirlərdən çevrib üz,
Otursan, fikrin-zikrin cüvan ilən gəlin-qız,
Bilə-bilə qəsd edib, naməhrəmə salıb göz,
Sabah cavab sorsalar olarsan lal, olmaz söz,
Vurar odlu gürz ilən səni min parə böylə.

Bir gün əcəl oxunu nişan edib atarlar,
Oğlun-qızın, xatınlar qara saçın yayarlar,
Xatınının qoynunda biganələr yatarlar,
Halal-haram malını paylaşıban alarlar,
Kəfən donuna soxub, salarlar gora böylə.

Məxdumqulu cəsəddən şirin canı alsalar,
Tutub səni kəfənə dar məzara salsalar,
Sual üçün görünüb Münkər-Nikir gəlsələr,
Tab gətirməz, duzəxə əziz cismin salsalar,
Hər nə qılsa ərki var, bəndə – biçarə böylə.

## GÖRƏN GÖZLƏRİM

Lütfi-həqdən bihesab ehsanı görən gözlərim,
Yüz otuz dörd evdə bir mehmanı görən gözlərim,
Əynində dörd müxtəlif camәni görən gözlərim,
Həm önündə dörd təam əlvanı görən gözlərim,
Dostu iki, bihesab düşmanı görən gözlərim.

Fəzli-həq düçar olub,vəhdət şərabından içib,
Silkinib dörd qanad ilə, ol məkanından uçub,
Üç min iki yüz, yenə həm əlli pərdədən keçib,
Tanrının fərmanı birlə bu iki gözün açıb,
Axtarıban işbu sərgərdanı görən gözlərim.

Mində səksənin içində tapmışam şirin-şəkər,
Üç min iki yüz yenə qırx bağı gəzdim sərbəsər,
Bağbanından eşitdim bir əcaib xoş xəbər,
Biri yeddi, biri beş dərya gər istərsən gövhər,
Bəhr ilə handa (?), ərşdə kanı görən gözlərim.

Yüzdə on dörd dərvazədən çox çapıb gəzdim rəvan,
Dörd bazarı gəzib, bir gövhəri aldım bigüman,
Üç bölük əqrəb gəlib aldı dışımı qəfildən,
Dörd budaqlı bir şəcərə qaçıban çıxdım rəvan,
Şol dəraxt üstündə çox nemanı görən gözlərim.

Ey Fəraqi, ötdü ömrün, qılmadın yaxşı amal,
Yol uzaqdır, yük ağır, tez vur qədəm, qılma xəyal,
Yeddi yüz çırağı sən rövşən edib ələ sal,
Əlli dörd pərli quşun uçsa kəmal yetməz mahal,
Ol quşun çın yoldaşı imanı görən gözlərim.

## YAŞIM MƏNİM

Ey yaranlar, dünyada fisqi-fücur işim mənim,
Dəmbədəm həsrət ilə gözdən axar yaşım mənim.
Kim ki can içrə olur bu yolda yoldaşım mənim,
Yolunda qurban olar bu can ilə başım mənim.

Yüz qəmü həsrət ilə rəngim mənim solmuş dürur,
Aqibət hay-vay ilə dəstgirsiz olmuş dürur,
Nəfsimiz baş götürüb, könlüm dağı ölmüş dürur,
Kibr ilə, həsəd ilə dolmuş içim, dışım mənim.

Yoxdur ərmanım əgər ötsəm əgər iman ilə,
Qayğıyü həsrətdə mən dildardan hicran ilə,
Gecəyü gündüz işim-gücüm olar üsyan ilə,
Vədəgirə heyf olub ötdü ta ki yaşım mənim.

Gahi görünməz mənim əsla gözümə bu cahan,
Ağlını zail qılıb, eylər cünun tək hər zaman,
Çox hərarətlər düşər bu canıma, eylər fəğan,
Ta olub rüsva mən a, getdi ağıl-huşum mənim.

Bu zəlil Məxdumqulu özün günahə qərq edib,
Ağlayır ol, çün özgələr ağlamazlar rizq edib,
Uçsa canım bu qəfəsdən işbu dünya tərk edib,
Ya rəb, lütf eyləməzmi ol şahənşahım mənim.

## HALIM MƏNİM

Ey yaranlar, sormayırlar bir kişi halım mənim,
Olmadı qəddim əlif tək, çevrilər dalım mənim.
Ötdü ərman birlə, dostlar, fanidə salım mənim,
Neyləyim, ey dostlarım, qanım tökər zalım mənim,
Bilmənəm mən hansı yerdə açılar alım mənim.

Ötdü ömrüm, dostlara, bu dünyaya mail olub,
Eldən, gündən ayrılıb, düşdüm cüda sail olub,
Qılmadım haqqa ibadət daima cahil olub,
Hər nə verən gününə şükr eylədim qail olub,
Ey xudaya, sən ağır qıl onda amalım mənim.

Cahilin könlü xarabdır, xar olurmuş bilmədim,
El-günə, tay-tuşlarına zar olurmuş bilmədim,
İşbu dünya gen der idim, dar olurmuş bilmədim,
Kim ki eldən ayrılar, bimar olurmuş bilmədim,
Deyin, bizi yad eyləsin tay-tuşumuz, elim mənim.

Gecə-gündüz ah vurub, çəkdim məgər əfğanü zar,
İstəyib gəzdim, özümə tapmadım vəfalı yar,
Dünya bir şamar gəlindir, zülfün edib tar-tar,
Ötkün edib «Bəri gəl» der, fırlanıb, hər yan baxar,
Dostlara, mən nə qılım, onda gedər meylim mənim.

Odlanır Məxdumqulu, yada düşəndə ellərim,
Guya bir dərya dürur çeşmimdən axan sellərim,
Dostlara, bir il dürur guya mənə hər günlərim,
Ürəyim taqət gətirməz, sözləyər bu dillərim,
Lütf edib qılsın tərəhhüm kərəmli sultanım mənim.

## DOSTLARIM

Vah, məni rəncü ələm əfkar qıldı, dostlarım,
Atmağa möhnət oxun təyyar qıldı, dostlarım,
Qayğı ilə bizləri bimar qıldı, dostlarım,
El-gün, tay-tuşlarıma həm zar qıldı, dostlarım,
Şum fələk ayrı salıb, naçar qıldı, dostlarım.

Coşğunum kəm, firqət içrə qalmışam bu cayda mən,
Ayrılığın həsrətindən gecə-gündüz vayda mən,
Düşmüşəm bir yar əlinə ruzi-şəb huy-hayda mən,
İldə bir kərpic düşər, əskilərəm hər ayda mən,
İşbu yarın hiyləsi həm xar qıldı, dostlarım.

Bir zaman rəhm eyləməs aşüftə halıma mənim,
Ruzi-şəb mən ağlaram keçən bu salıma mənim,
Neyləyim, işim düşübdir işbu zalıma mənim,
Qüssə-qəmdən qeyri zat gəlməz xəyalıma mənim,
Bizə zülfün görsədib, həm mar qıldı, dostlarım.

Ey könül, gəl şükür qılgil, olmagil zarü zəbun,
Bəlkə mərdana könlüm, bil, ötər səndən bu gün,
Cuşə vargil, ey könül, gir bəzmimə məndən şu gün,
Bir neçə möhnətdə yatdın, indi gəl rahət bu gün,
Eşq sərgərdanlığı avara qıldı, dostlarım.

Sözləyib, Məxdumqulu, bunça fəğan çəkmək nədir,
Gözdə yaşın axızıb, xunabələr tökmək nədir,
Qüssəni can şəhrinə toxum edib əkmək nədir,
Dəhr ara rüsva olub, köksünü çak etmək nədir,
Məni eşq sevdasına giriftar qıldı, dostlarım.

# İÇİNDƏKİLƏR:



## Tükmən birliyi, vətən, ailə



## Badə şeirləri

## Məhəbbət lirikası



## İctimai, fəlsəfi şeirlər, vücudnamələr

## Dini-ruhani şeirlər

## Deyişmələr, müəmmalar



## Qəzəllər

**Divan ədəbiyyatının digər nümunələri**



## R a m i z ƏSKƏ R

10 yanvar 1954-cü ildə Amasiya rayonunun Qaraçanta kəndində müəllim ailəsində anadan olmuşdur. M.V.Lomonosov adına Moskva Dövlət Universitetinin jurnalistika fakültəsini bitirmişdir (1978).

Azərbaycan radiosunda redaktor (1978–83), Azərbaycan, türk, ərəb, fars, ingilis, fransız və alman dillərində çıxan "Azərbaycan bugün" jurnalının baş redaktoru (1983–84), kiril, latın və ərəb əlifbaları ilə nəşr olunan "Odlar yurdu" qəzetinin baş redaktoru (1984-91), "Hürriyet" qəzetinin (İstanbul) Azərbaycan üzrə xüsusi müxbiri (1991-93), Xarici Turizm Şurasının idarə rəisi (1993-94), "XXI əsr" qəzetinin baş redaktoru (1994–96), "Yeni Forum" jurnalının (Ankara) Bakı təmsilçisi (1993-97) olmuşdur. 1997-ci ildən Azərbaycan Jurnalistlər Birliyinin baş katibidir. Filologiya elmləri doktoru, Bakı Dövlət Universitetinin müəllimidir (2002-ci ildən).

"Qızıl qələm", "Həsən bəy Zərdabi", "Humay", Küveytin "İslama xidmət", Türkiyənin "Yeni Orhun" və "Türk dünyasına xidmət" mükafatları laureatıdır. Azərbaycan Yazıçılar və Jurnalistlər Birliklərinin, Beynəlxalq Mətbuat İnstitutunun (İPİ, Vyana) üzvü, Beynəlxalq Jurnalistlər Birlikləri Konfederasiyası (Moskva) və Avrasiya Jurnalistlər Konfederasiyası (Ankara) idarə heyətlərinin üzvüdür. Türkologiya, ədəbiyyat, tarix və jurnalistika sahəsində kitablar yazmış, türk, rus, özbək, uyğur, türkmən dillərindən tərcümələr etmişdir.

**Əsas əsərləri:**

1. İqlimdən-iqlimə, təqvimdən-təqvimə. Bakı, İşıq, 1987, 104 s.
2. Qutadğu bilig. Bakı, Elm, 2003, 320 s.
3. 80 yaşın zirvəsindən baxanda. Bakı, Adiloğlu, 2005, 356 s.
4. Mahmud Kaşğari və onun "Divanü lüğat-it-türk" əsəri. Bakı, MBM, 2008, 432 s.
5. Mahmud Kaşğarinin 1000 illik yubileyinə 1000 biblioqrafik göstərici. Bakı, MBM, 2008, 96 s.
6. Mahmud Kaşğarinin "Divanü lüğati-it-türk əsəri üzrə biblioqrafik və qrammatik göstərici. Bakı, MBM, 2008, 192 s.
7. Mahmud Kaşğari və onun "Divanü lüğat-it-türk" əsəri. Bakı, MBM, 2009, 532 s.

**Əsas tərcümələri:**

1. Azerbaycan Masalları. Bakı, Yazıçı, 1982, 196 s.
2. M.B.Məmmədzadə. Milli Azərbaycan hərəkatı. Bakı, Nicat, 1991, 248 s.

3. Faruq Sümər. Oğuzlar. Bakı, Yazıçı, 1992, 432 s.
4. Yusif Balasağunlu. Qutadğu bilig. Bakı, Azərnəşr, 1994, 492 s.
5. Murad Tağı. Həyatım. Bakı, Oka Ofset, 1998, 92 s.
6. Erik Fichtelius. Jurnalistikanın on qızıl qaydası. Bakı, AJB, 2002, 192 s.
8. Bahəddin Ögəl. Türk mifologiyası. Bakı, Səda, 2004, I cild, 626 s.
9. Mahmud Kaşğari. Divanü lüğat-it-türk. Bakı, Ozan, 2006, I cild, 512 s.
10. Mahmud Kaşğari. Divanü lüğat-it-türk. Bakı, Ozan, 2006, II cild, 400 s.
11. Mahmud Kaşğari. Divanü lüğat-it-türk. Bakı, Ozan, 2006, III cild, 400 s.
12. Mahmud Kaşğari. Divanü lüğat-it-türk. Bakı, Ozan, 2006, IV cild, 752 s.
13. N.Ozerov. İlham Əliyev: Mən Azərbaycanıma inanıram. Bakı, Azərnəşr, 2007, 376 s.
14. Махмуд Кашгарский. Дивану лугат ит-тюрк. Баку, МБМ, 2009, I том, 512 с.
15. Махмуд Кашгарский. Дивану лугат ит-тюрк. Баку, МБМ, 2009, II том, 400 с.
16. Махмуд Кашгарский. Дивану лугат ит-тюрк. Баку, МБМ, 2009, III том, 492 с.
17. Oraz Yağmur. Qarabağlı ananın ağısı. Bakı, MBM, 2009, 84 s.
18. XX əsr özbək şeiri antologiyası. Bakı, MBM, 2009, 96 s.
19. Molla Nəfəs. Bu məkana gəlmişəm. Bakı, MBM, 2010, 160 s.
20. Todur Zanet. Ana dilim. Bakı, MBM, 2010, 104 s.

Evlidir, iki qızı, bir oğlu var.

Türkcə, rusca, almanca və ermənicə bilir.

E-mail: ramizasker@yahoo.com

TÜRKSOY kitabxanası seriyası: 5

**Tərtib edən,**
**türkməncədən uığunlaşdıran**
**və ön sözün müəllifi:**
**Ramiz ƏSKƏR**

**Redaktoru:**
**Əli ŞAMİL**

**Naşiri:**
**Rafiq BABAYEV**

**Sponsoru:**
**Şahmar Rüstəm oğlu VƏLİYEV**

**Məxdumqulu Fəraqi. Seçilmiş əsərləri. Bakı, MBM, 2010, 448 s.**

Korrektor: Leyla
Texniki redaktor: Ülvi Arif
Kompüterdə yığdı: Solmaz Əskərova
Dizayner: Ceyhun Əliyev

---

Çapa imzalandı: 28.02.2010
Formatı: 70x100, 1/16
Həcmi: 28 çap vərəqi
Tirajı: 1.000 ədəd
MBM MMC mətbəəsində çap olundu.